

# İSLAM ƏXLAQI

ƏLİ İBN ƏMRULLAH&
MUHAMMƏD HADİMİL

GOFREEBOOKS.COM

# MÜNDƏRİCAT



## BİRİNCİ HİSSƏ

## İKİNCİ HİSSƏ

## Bismillahirrahmənirrahim

İslamiyyəti bildirən kitablar çoxdur. Bunların içində ən qiymətlisi İmam Rabbaninin üç cild “Məktubat” kitabıdır. Bundan sonra Muhamməd Masumun üç cild “Məktubat” kitabıdır. Muhamməd Masum həzrətləri Məktubatın üçüncü cild, on altıncı məktubunda buyurur ki: “İman, kəlimeyi-tövhidin Lə iləhə illəllah və Muhammədün Rəsulullah iki qisminə birlikdə inanmaqdır”. Yəni, müsəlman olmaq üçün Muhamməd aleyhissəlamın Peyğəmbər olduğuna da inanmaq lazımdır. Yəni, Muhamməd aleyhissəlam Allahın Peyğəmbəridir. Allahu təala Cəbrayıl adındakı mələklə ona “Qurani-Kərim” göndərmişdir. Bu Qurani-Kərim Allah kəlamıdır. Muhamməd aleyhissəlamın öz düşüncələri və filosofların, tarixçilərin sözləri deyil. Muhamməd aleyhissəlam Qurani-Kərimi təfsir etmişdir. Yəni açıqlamışdır. Bu açıqlamalara hədisi-şərif deyilir. İslamiyyət “Qurani-Kərim” ilə “Hədisi-şərif”lərin açıqlamalardır. Muhamməd aleyhissəlamdan gəlməyən bir söz islam kitabı ola bilməz. İman və islam demək “Qurani-Kərim” və “Hədisi-şərif”lərə inanmaq deməkdir. Onun bildirdiklərinə inanmayan Allah kəlamına inanmamış olur. Muhamməd aleyhissəlam Allahu təalanın bildirdiklərini Əshabına bildirdi. Onlar da tələbələrinə bildirdi. Bunlar da kitablarına yazdılar. Bu kitabları yazan alimlərə “Əhli-sünnət alimi” deyilir. Əhli-sünnət kitablarına inanan Allah kəlamına inanmış olur. Müsəlman olur. Əlhamdulillah biz dinimizi Əhli-sünnət alimlərinin kitablarından öyrənirik. Dində reformçuların, masonların və zındıqların uydurma kitablarından öyrənmirik. Rəsulullah (sallallahu aleyhi və səlləm) buyurdu ki, “Ümmətim arasında fitnə, fəsad yayıldığı zaman sünnətimə sarılana yüz şəhid savabı vardır”. Sünnətə sarılmaq Əhli-sünnət alimlərinin kitablarını öyrənməklə və bunlara əməl etməklə olur. Müsəlmanların dörd məzhəbindən hər hansı birisinin alimləri “Əhli-sünnət alimləri”dir. Əhli-sünnət alimlərinin rəisi İmam Azam Əbu Hanifə Numan ibn Sabitdir. Britaniya imperialistləri əsrlər boyunca ça-

lışaraq bir müsəlmanı xristian edə bilmədilər. Bunu etmək üçün yeni bir yol tapdılar. Masonluğu qurdular. Masonlar Muhamməd aleyhissəlamın sözlərinə və bütün dinlərə, öldükdən sonra təkrar dirilməyə, Cənnətin, Cəhənnəmin var olduğuna inanmırlar.

İmamı-Rabbani həzrətləri “Məktubat” kitabının 1-ci cild, 275-ci məktubunda buyurur ki:

Sizin bu nemətə qovuşmağınız İslamiyyət bilgilərini öyrətməklə və fiqh hökmlərini yaymaqla olmuşdur. Oralara cəhalət yerləşmişdi və bidətlər yayılmışdı. Allah (cəllə cəlalühü) sevdiklərinin sevgisini sizə ehsan etdi. İslamiyyəti yaymağa sizi vəsilə etdi. Elə isə din bilgilərini öyrətməyə və fiqh əhkamını yaymağa əlinizdən gəldiyi qədər çalışın. Bu ikisi bütün səadətlərin başı, yüksəlmənin vasitəsi və qurtuluşun səbəbidir.

# İSLAM ƏXLAQI

## ÖN SÖZ

***Bəsmələylə başlayaq kitaba!***
***Allah adı ən yaxşı bir sığınaqdır.***
***Nemətləri sığmaz ölçü, hesaba,***
***Çox acıyan, əfvi sevən bir Haqdır!***

Allahu təala dünyada bütün insanlara rəhm edir. Möhtac olduqları nemətləri yaradıb hər kəsə göndərir. Dünyada və axirətdə səadətə qovuşmaq üçün bu nemətlərdən necə istifadə ediləcəyini də bildirir. İslamiyyəti heç eşitməmiş olan qeyri-müsəlmanların Cəhənnəmə atılmayacaqlarını, bunların hesabdan sonra heyvanlar kimi yox olacaqlarını İmamı Rabbani 259-cu məktubunda bildirmişdir. Eşitdikdən sonra düşünüb iman edənləri Cənnətə qoyacaqdır. Düşünmək üçün insanlara bir ömür boyu zaman vermişdir. Nəfslərinə, pis dostlara, zərərli kitablara və əcnəbi radiolara aldanaraq küfr və dəlalət yoluna düşənlərdən imana gələnləri əfv edir. Onları əbədi fəlakətdən qurtarır. Azğın, zalım olanlara hidayətini ehsan etmir. Onları bəyəndikləri, istədikləri, içinə düşdükləri inkar bataqlığında buraxır. Axirətdə Cəhənnəmə getməli olan möminlərdən istədiklərini Cəhənnəmdə günahları bitənə qədər yandırdıqdan sonra Cənnətə qovuşduracaqdır. Hər canlını yaradan, hər varı hər an varlıqda durduran, hamısını qorxu və dəhşətdən qoruyan yalnız Odur.

Hər hansı bir şəxs hər hansı bir zamanda hər hansı bir yerdə hər hansı bir kimsəyə hər hansı bir səbəbdən ötrü hər hansı bir yolla həmd və şükür edərsə, bu mədhü-sənaların və təşəkkürlərin hamısı Allahu təalaya məxsusdur. Çünki hər neməti [yaxşılığı] yaradan, göndərən yalnız Odur. O xatırlatmazsa, qüvvət və asanlıq verməzsə heç kim heç kimə yaxşılıq və pislik edə bilməz. Həmişə Onun istədiyi olur. Onun istəmədiyini kimsə edə bilməz. Hədisi-

qüdsidə: **“İnsanları məni tanımaqla şərəflənmələri üçün yaratdım”** buyuruldu. Bunu eşitdikdə “Kafirlər dünyada Allahu təalaya inanmırlar. Bu hədisi-şərifin həqiqəti hasil olmur” demək doğru deyildir. Çünki alimlər, vəlilər bəlli bir dərəcəyə yüksəldikdə, bəlli bir yaşa gəldikdə Allahu təalanı tanımağa başlayırlar. Kafirlər də axirətə getdikdə tanıyacaqlar. Tanımayan qalmayacaq.

Həmd, bütün nemətləri Allahu təalanın yaratdığına, göndərdiyinə inanmaq və söyləmək deməkdir. Şükür bütün nemətlərdən əhkamı-İslamiyyəyə uyğun istifadə etmək deməkdir. Nemət faydalı şey deməkdir. Nemətlər əhli sünnət alimlərinin kitablarında yazılmışdır. Əhli sünnət alimləri məşhur dörd məzhəbin alimləridir.

Onun sevgili Peyğəmbəri, insanların hər baxımdan ən gözəli, ən üstünü olan Muhamməd aleyhissəlama və onun gözəl əxlaq və elm saçan alinə, yəni əqrabasına və Əshabının hamısına (rıdvanullahi təala aleyhim əcmain) bizdən dualar və salamlar olsun.

Müsəlmanların öyrənməli olduqları bilgilərə **“İslam elmləri”** deyilir. İslam elmləri iki yerə ayrılır: din bilgiləri və fənn bilgiləri. Fənn bilgilərinə **“Hikmət”** deyilir. Dində reformçular fənn bilgilərinə rasional bilgilər, din bilgilərinə skolastik bilgilər deyir. Peyğəmbərimiz (sallallahu aleyhi və səlləm): **“Hikmət, müsəlmanın qeyb olmuş malı kimidir. Onu harda taparsa alsın!”** buyurdu. Bu hədisi-şərif fənn bilgilərini öyrənməyi əmr etməkdədir. Din bilgilərinin əsası iyirmi elmdir. Bunlardan səkkizi yüksək elmlər, on ikisi də köməkçi elmlərdir. Yüksək elmlərdən biri **“Əxlaq elmləri”**dir.

[Gözəl əxlaq sahibi olan və zamanının fənn bilgilərini yaxşı öyrənmiş müsəlmana **“Mədəni”**, yəni ziyalı, qabaqcıl deyilir. Fənn bilgilərini öyrənərək ağır sənaye qurmuş, lakin əxlaqı pis olan kimsəyə **“Zalım”**, yəni **“irticaçı”** (mürtəce), quldur və diktator deyilir. Fənn və sənətdə geri və əxlaqı pis olanlara **“Vəhşi”**, yəni alçaq deyilir. **“Mədəniyyət”,** təmiri bilad və tərfihi ibaddır. Yəni, şəhərlər tikmək və insanlara xidmətdir. Bu da fənn, sənət və gözəl əxlaq ilə olur. Qısacası, fənn və sənətin gözəl əxlaq ilə birlikdə olmasına **“Mədəniyyət”** deyilir. Mədəni insan, fənn və sənəti insanların xidmətində istifadə edir. Zalımlar isə insanlara işgəncə etmək üçün istifadə edir. Göründüyü kimi həqiqi müsəlman mütərəqqi,

qabaqcıl bir insandır. Yəni kafirlər, mürtəce, quldur və zavallı bir kimsədir. Göründüyü kimi mədəniyyət şəhərlər, binalar tikməkdir. Bu da fənn və sənət ilə əmələ gəlir. Təkmili sinaat, təlahuqi əfkar ilədir. Yəni, insanların rifah içində yaşamaları da İslam əxlaqı ilə olur.]

Hər müsəlmanın İslam bilgilərini lazımi qədər öyrənməsi fərzdir. Bunun üçün İslam alimləri bir çox kitab yazmışdırlar. Əxlaq kitablarından Nəsirüddini Muhamməd Tusinin yazdığı "**Əxlaqı nasıri**", Cəlalüddini Muhamməd Dəvaninin yazdığı "**Əxlaqı Cəlali**" və Hiratlı Hüseyn Vaizi Kaşifinin yazdığı "**Əxlaqı muhsini**" kitabları məşhurdur. Bu kitabımız Muhamməd Hadiminin (rahiməhullahü təala) "**Bəriqa**" kitabından tərcümə edilmişdir. Bu kitabda İslamiyyətin bəyənmədiyi əxlaqı və bunlardan qorunma və qurtulma çarələrini bildirəcəyik. Bu pis əxlaq qəlbi və ruhu əbədi ölümə düçar edən qəlbin xəstəlikləridir. Başqa kitablardan götürərək edilən əlavələr, böyük mötərizə [] içində yazılmışdır. Kitabımızın ikinci qismində, 979-cu [m. 1572] ildə Ədirnədə vəfat etmiş olan, Əli ibn Əmrullahın (rahimə-hullahü təala) yazdığı türkcə "**Əxlaqı alai**" kitabının baş hissəsini yazaraq, əxlaqın tərifini və növlərini açıqlayacağıq.

Bu kitabımızı oxuyan təmiz gənclər babalarının sağlam vücudlu, gözəl əxlaqlı, çalışqan, mədəni, ziyalı olduqlarını anlayacaq, İslam düşmənlərinin yalanlarına, iftiralarına aldanmaqdan qurtulacaqdır.

Nəsirüddini Tusinin adı Muhamməd ibn Fəxrəddindir. Hicri 597-ci ildə Tusda, yəni Məşhəd şəhərində təvəllüd, 672-ci [m. 1273] ildə Bağdadda vəfat etdi. Şiə etiqadında idi. Monqol hökmdarı Hülakünün vəziri oldu. Dörd yüz min kitabı olan bir kitabxana və Rəsədxana, bir akademiya tikdirdi. Çox kitab yazdı.

Muhamməd Cəlalüddini Dəvani (rahimə-hullahü təala) 829-cu ildə təvəllüd, 908-ci [m. 1503] ildə Şirazda vəfat etdi. İslam alimlərinin ən böyüklərindəndir. Çox kitab yazdı. "**Əxlaqı Cəlali**" kitabı farsca olub, 1304-cü [m. 1882] ildə Hindistanda səkkizinci nəşri çıxarılmışdır. İngilis dilinə də tərcümə edilmişdir.

Hüseyn ibn Əli Vaizi Kaşifi (rahimə-hullahü təala) Hiratda vaiz idi. Hicri 910-cu [m. 1505] ildə orada vəfat etdi.

Ey təmiz gənclər! Ey ömürlərini İslam dininin gözəl əxlaqını öyrənməkdə və yaymaqda keçirən və canlarını Allahın dinini insanlara yaymaqda fəda edən şəhidlərin mərd və qiymətli övladları! Şərəfli əcdadımızın sizlərə tam və doğru olaraq gətirdiyi və əmanət etdiyi mübarək İslam dinini və bunun bildirdiyi gözəl əxlaqı yaxşı öyrənin! Gözəl yurdumuza göz dikən, can, mal, din və əxlaq düşmənlərinin hücumlarına qarşı bu müqəddəs əmanəti bütün gücünüzlə müdafiə edin! Hər yerə yayaraq insanları səadətə qovuşdurmağa çalışın! Bilin ki, dinimiz gözəl əxlaqlı olmağımızı, sevişməyimizi, böyüklərə hörmət, kiçiklərə şəfqət etməyi, dinli-dinsiz hər kəsə yaxşılıq etməyi əmr etməkdədir. Hər kəsin haqqını, muzdunu verin! Qanunlara, hökumətin əmrlərinə qarşı çıxmayın! Vergilərinizi vaxtında ödəyin! Allahın doğruların yardımçısı olduğunu heç unutmayın! Sevişək, yardımlaşaq ki, Allahu təala yardımçımız olsun!

İslam alimləri buyururlar ki, "Allahu təala insanda üç şey yaratdı: Ağıl, qəlb və nəfs. Bunların heç biri görünmür. Varlıqlarını əsərləri ilə, etdikləri işlərlə və dinimizin bildirməsi ilə anlayırıq. Ağıl və nəfs beynimizdə, qəlb sinəmizin sol tərəfindəki ürəyimizdədir. Bunlar maddə deyildir. Yer tutmazlar. Buralarda olmaları, elektrikin ampulda, maqnitin induksiya çarxında olması kimidir. Ağıl fənn bilgilərini anlamağa çalışar, bunları anlayar, İslamiyyətə uyğun olanlarını pislərindən, zərərli olanlarından ayırar. Yaxşıları, pisləri İslamiyyət ayırmaqdadır. İslamiyyəti bilən və tabe olmaq istəyən ağıla "**Səlim ağıl"** deyilir. Ağlı az olan, həmişə azan kimsəyə "**Axmaq",** ağlı heç olmayana "**Məcnun"** deyilir. Səlim olan ağıl İslamiyyətin bildirdiyi yaxşı şeyləri qəlbə bildirir. Qəlb də bunları yerinə yetirməyi iradə edərək beyindən çıxan hərəkət sinirləri vasitəsi ilə əzalara, orqanlara etdirir. Yaxşı və ya pis şeyləri etmək arzusunun qəlbə yerləşməsinə "**Əxlaq", "Xasiyyət"** deyilir. Nəfs bədənə xoş gələn şeylərə düşkündür. Bunların yaxşı, pis, faydalı, zərərli olduqlarını düşünməz. Arzuları İslamiyyətin əmrlərinə uyğun olmaz. İslamiyyətin qadağan etdiyi şeyləri etmək nəfsi qüvvətləndirər. Daha betərini etdirmək istər. Pis, zərərli şeyləri yaxşı göstərib qəlbi aldadar. Qəlbə bunları etdirərək istəklərinə qovuşmaq üçün çalışar. Qəlbin nəfsə aldanaraq pis xüsusiyyətli olmama-

sı üçün əhkamı-İslamiyyəyə uyaraq qəlbi qüvvətləndirmək və nəfsi zəiflətmək lazımdır. Ağlı qüvvətləndirmək İslam bilgilərini oxuyub öyrənməklə olduğu kimi, qəlbin qüvvətlənməsi, yəni təmizlənməsi də əhkamı-İslamiyyəyə tabe olmaqla olur. İslamiyyətə tabe olmaq üçün ixlas lazımdır. **"İxlas"**, işləri, ibadətləri Allahu təala əmr etdiyi üçün etmək, başqa heç bir mənfəət düşünməməkdir. Qəlbdə ixlas hasil olması qəlbin zikr etməsi ilə, yəni Allah adını çox söyləməsi ilə olur. Zikrin əhəmiyyəti **"Qiyamət və Axirət"** kitabının 284-cü səhifəsindən başlayaraq geniş bildirilmişdir. Zikrin necə ediləcəyini mürşidi-kamildən öyrənmək və ağılda olan və hiss orqanlarından gələn dünya düşüncələrini qəlbdən çıxarmaq şərtdir. Dünya düşüncəsi heç qalmazsa, qəlb öz-özlüyündən zikr etməyə başlayar. Şüşədəki su boşaldıqda havanın şüşəyə öz-özlüyündən dərhal girməsi kimidir. Zikrin necə ediləcəyi **"Tam İlmihal"**ın 921-ci səhifəsində yazılmışdır. Qəlbi dünya düşüncələrindən qorumaq, qəlbin mürşidi-kamilin qəlbindən feyz (nur) alması ilə olur. Qəlbdən qəlbə **"Feyz"** məhəbbət yolu ilə axar. Mürşidin başqa ölkədə olması və ya vəfat etmiş olması feyz gəlməsinə mane olmaz. **"Mürşid"** İslam bilgilərini yaxşı bilən və İslamiyyətə tam tabe olan ixlas sahibi, əhli sünnət alimidir. İslamiyyətə tabe olmaq qəlbi qüvvətləndirdiyi kimi nəfsi zəiflədir. Bu səbəblə **"Nəfs"** qəlbin İslamiyyətə itaət etməsini, mürşidi-kamilin söhbətində iştirak etməyi, kitablarını oxumağı istəməz. Dinsiz, imansız olmasını istəyər. Ağıllarına deyil, nəfslərinə tabe olan kimsələr bunun üçün dinsiz olmaqdadır. Nəfs ölməz, lakin gücü, qüvvəti qalmadıqda qəlbi aldada bilməz."

Bu gün yer üzündə olan müsəlmanlar əsasən üç böyük firqəyə ayrılmışdır. Birinci firqə Əshabi-kiramın hamısını sevən və onlara tabe olan müsəlmanlardır. Bunlara **"Əhli sünnət"**, **"Sünni"** və **"Fırkayi-naciyyə"**, Cəhənnəmdən qurtulan firqə deyilir. İkinci firqə Əshabi-kiramın bəzilərini qəbul etməyənlərdir. Bunlar özlərinə **"Şiə"** deyirlər. Üçüncüsü, sünnilərə və şiələrə düşmən olanlardır. Bunlara **"Vəhhabi"** və **"Nəcdi"** deyilir. Çünki bunlar ilk olaraq Ərəbistanın Nəcd şəhərində meydana çıxmışdır. Bunlara **"Fırkayi-məlunə"** də deyilir. Çünki bunların müsəlmanlara müşrik dedikləri **"Qiyamət və Axirət"** və **"Səadəti Əbədiyyə"** kitab-

larımızda yazılmışdır. Müsəlmanlara kafir deyənə Peyğəmbərimiz lənət etmişdir.

Hansı firqədən olursa olsun nəfsinə tabe olan və qəlbi korlanmış olan Cəhənnəmə gedəcəkdir. Onun üçün hər mömin nəfsini tərbiyə üçün hər zaman çox **"Lə iləhə illəllah"** və qəlbini təmizləmək üçün **"Əstəğfirullah"** oxumalıdır. Əhkamı-İslamiyyəyə tabe olanın duası mütləq qəbul olar. Namaz qılmayanın, açıq gəzən qadınlara baxanın və haram yeyib-içənin əhkamı İslamiyyəyə əməl etmədiyi aydın olur. Bunların duaları qəbul olmaz.

***Miladi 2013, Hicri şəmsi 1392,***
***Hicri qəməri 1434***

# İSLAM ƏXLAQI

## BİRİNCİ HİSSƏ

Kitabımızın birinci qismində pis əxlaqdan mühüm olan qırx ədədi və bunların çarələri açıqlanacaqdır. Aşağıdakı yazıların hamısı Əbu Said Muhamməd Hadiminin (rahimə-hullahü təala) "**Bəriqa"** kitabının birinci cildindən tərcümə edilmişdir. Bu kitabı iki cild olub ərəbcədir. 1284-cü [m. 1868] ildə İstanbulda nəşr edilmiş, 1411-ci [m. 1991] ildə, "Həqiqət Kitabevi" tərəfindən təkrar çap edilmişdir. Hadimi həzrətləri 1176-cı hicri qəməri [m. 1762] ilində Konyanın Hadim qəsəbəsində vəfat etmişdir.

## PİS ƏXLAQ VƏ BUNLARDAN QURTULMAĞIN ÇARƏLƏRİ

İnsana dünyada və axirətdə zərər verən hər şey pis əxlaqdan meydana gəlməkdədir. Yəni, zərərlərin, pisliklərin başı pis əxlaqlı olmaqdır. Haramlardan [pisliklərdən] çəkinməyə "**Təqva"** deyilir. Təqva, ibadətlərin ən qiymətlisidir. Çünki bir şeyi bəzəmək üçün öncə pislikləri yox etmək lazımdır. Bunun üçün günahlardan təmizlənmədikcə taət-ibadətlərin faydası olmaz, heç birinə savab verilməz. Pisliklərin ən pisi **"küfr"**dür. Kafirin [Allaha düşmən olanın] heç bir yaxşılığı, xeyirxah əməlləri axirətdə faydalı olmaz. [Zülm ilə öldürülən kafir şəhid olmaz. Cənnətə girməz.] İmanı olmayanın heç bir yaxşılığına savab verilməz. Bütün yaxşılıqların təməli təqvadır. Hər şeydən öncə təqva sahibi olmağa çalışmaq lazımdır. Hər kəsə təqva sahibi olmağı əmr və nəsihət etmək lazımdır. Dünyada rahatlığa, hüzura qovuşmaq, sevişmək, qardaşca yaşaya bilmək, axirətdə də sonsuz əzabdan xilas olaraq əbədi nemətlərə, səadətlərə qovuşmaq ancaq təqva ilə nəsib olar.

Pis əxlaq qəlbi xəstə edər. Bu xəstəliyin artması qəlbin ölümünə [yəni küfrə] səbəb olur. Pis əxlaqın ən pisi olan şirk, yəni küfr isə qəlbin ən böyük zəhəridir. İmanı olmayanın, "Qəlbim təmizdir. Sən qəlbə bax" kimi sözləri boş sözlərdir. Ölmüş olan qəlb təmiz ola bilməz.

Küfrün növləri vardır. Hamısının da ən pisi, ən böyüyü **"şirk"-** dir. Bir pisliyin hər çeşidini bildirmək üçün çox vaxt bunların ən pisi söylənir. Bunun üçün ayəti-kərimələrdə və hədisi-şəriflərdə olan şirk kəliməsindən hər növ küfr mənası anlaşılır. Nisə surəsinin qırx səkkiz və yüz on altıncı ayəti-kərimələrində müşrikin heç əfv edilməyəcəyi bildirildi. Bu ayəti-kərimələr kafirlərin Cəhənnəm atəşində sonsuz yanacaqlarını bildirməkdədir.

["Şirk", Allahu təalaya ortaq qoşmaq, bənzətmək deməkdir. Bənzədən kimsəyə **"Müşrik",** bənzədilən şeyə **"Şərik"** deyilir. Bir kimsədə, bir şeydə üluhiyyət sifətlərindən birisinin olduğuna inanmaq onu şərik etmək olur. Allahu təalaya məxsus olan sifətlərə, yəni **"Sifəti-zatiyyə"** və **"Sifəti-sübutiyyə"**lərə **"üluhiyyət sifətləri"** deyilir. Sonsuz var olmaq, yaratmaq, hər şeyi bilmək, xəstələrə şəfa vermək üluhiyyət sifətlərindəndir. Bir insanda, günəşdə, inəkdə, hər hansı bir məxluqda üluhiyyət sifəti olduğuna inanaraq ona təzim, hörmət etməyə, ona yalvarmağa ona **"ibadət etmək",** tapınmaq deyilir. O şeylər **"Sanəm=büt"** olur. Belə zənn olunan insanın və kafirlərin heykəlləri, rəsmləri və məzarları önündə də təzim edici şeylər söyləmək, etmək də ibadət etmək, şirk olur. Bir insanda üluhiyyət sifətlərindən birinin olduğuna inanmayıb, Allahın sevgili qulu olduğuna və ya vətənə, millətə xidmətləri olduğuna inanaraq bunun rəsminə, heykəlinə, təzim etmək şirk olmaz, küfr olmaz.

Qəlb xəstəliklərinin şirkdən sonra ən pisi, **"Bidət"**lərə inanmaq və bidət işləməkdir. Bidətlərdən sonra günahlardan çəkinməmək gəlir. İstər kiçik olsun, istər böyük olsun şirkdən yəni küfrdən başqa günah işləyib, tövbə etmədən ölən bir mömin şəfaətə qovuşaraq, yaxud heç bir səbəb olmadan yalnız Allahu təalanın mərhəmət etməsi ilə əfv oluna bilər. Kiçik günah əfv edilməzsə, Cəhənnəmdə əzab çəkiləcəkdir. Qul haqqı da olan günahların əfvi çətindir və əzabları daha şiddətli olacaqdır. Zövcəsinin mehrini verməmək

və insanların haqq dini öyrənmələrinə mane olmaq qul haqlarının ən böyüyüdür. Hədisi-şəriflərdə buyuruldu ki, **“Bir zaman gələcək ki, insan qazancının halaldan, haramdan olduğunu düşünməyəcək”** və **“Bir zaman gələcək ki, İslamiyyətə tabe olmaq, əlində alov tutmaq kimi çətin olacaq.”** Bunun üçün haramların hamısından və təhrimi məkruhlardan çəkinmək təqva olur. Fərzləri və vacibləri tərk etmək haramdır. Müəkkəd sünnətləri üzrsüz tərk etmək təhrimən məkruh olur deyildi. Etiqadda, əxlaqda və əməldə əmr olunanları tərk edənə qiyamətdə əzab ediləcəkdir. Əzaba səbəb olan şeyləri tərk etmək lazımdır. Məsələn, namaz qılmamaq və qadınların, qızların açıq gəzmələri böyük günahlardandır. Bir günahı tərk etmək, məsələn, beş vaxt namazı hər gün qılmaq çox lazımdır. Lakin bu kitabımızda tərk edilməməsi lazım olanları deyil, tərk edilməsi lazım olanları bildirəcəyik.

Edilməməsi lazım olan şeylər, ya bəlli bir üzv ilə icra edilir, yaxud bütün bədən ilə edilir. Günah işlənən üzvlərdən səkkiz üzv məşhurdur. Bu üzvlər; qəlb, qulaq, göz, dil, əl, mədə, fərc (cinsiyyət orqanı) və ayaqlardır. Qəlb insanın sinəsində, sol tərəfində olan ürək deyilən ət parçasına üfürülmüş ruhani bir lətifdir. Ruh kimi maddə olmayan [mücərrəd olan] bir varlıqdır. Günah işləyən bu üzvlərin özləri deyildir. Bunlarda olan hiss qüvvətləridir. Dünyada və axirətdə səadətə qovuşmaq, rahat olmaq istəyən bu üzvlərin günah işləmələrinə mane olmalıdır. Günah işləməmək qəlbində təbii, adət halını almalıdır. Namaz qılan, haram işləməyən etiqadı doğru bir kimsəyə **“Müttəki”** və **“Saleh”** [yaxşı insan] deyilir. Allahu təalanın rızasına, sevməsinə qovuşaraq, **“Vəli”**si olur. Qəlbdə adət halını almadan, özünü məcbur edərək günahlardan çəkinmək də təqva olsa da, övliya olmaq üçün günah işləməmək adət halını almalıdır. Bunun üçün də qəlbin təmizlənməsi lazımdır. **“Qəlbin təmizlənməsi İslamiyyətə tabe olmaqla olur.”** **“İslamiyyət”** üç qismdir: Elm, əməl, ixlas. Yəni, əmrləri və qadağaları öyrənmək, öyrəndikləriylə əməl etmək, bunları yalnız Allah rizası üçün etmək lazımdır. Qurani-Kərim bu üçünü əmr və mədh etməkdədir. Bu **“İslam əxlaqı”** kitabında qəlbin təmizlənməsi üçün yalnız tərk edilməsi lazım olan günahlar bildiriləcəkdir. Bunlara **“Pis əxlaq”** deyilir.

# PİS ƏXLAQ VƏ ÇARƏLƏRİ

Müsəlmanın hər şeydən əvvəl qəlbini təmizləməsi lazımdır. Çünki qəlb bütün bədənin rəisidir. Bütün üzvlər qəlbin əmrindədir. Peyğəmbərimiz (sallallahu aleyhi və səlləm), **"İnsanın bədənində bir ət parçası vardır. Bu yaxşı olarsa, bütün üzvlər yaxşı olar. Bu pis olarsa, bütün orqanlar korlanmış olar. Bu qəlbdir"** buyurdu. Yəni bu ürək deyilən ət parçasındakı könüldür. Onun yaxşı olması pis əxlaqdan təmizlənməsi və yaxşı əxlaq ilə bəzədilməsidir. İnsanın surətinə, şəklinə **"Bədən", "Xəlq"** deyilir. İnsanın qəlbindəki qüvvətə, təbiətə, hala, **"Hulq"** deyilir. "**Əxlaqı zəmimə",** qəlbin xəstəlikləridir. Bunların müalicəsi çətindir. Dərmanlarını yaxşı bilmək və düzgün istifadə etmək lazımdır. Hulq, yəni əxlaq, qəlbdəki mənfəət və arzu, hal deməkdir. İnsanın etiqadı, sözləri, hərəkətləri, həmişə bu qüvvədən hasil olmaqdadır. İxtiyari hərəkətlər əxlaqın əsərləridir.

Əxlaqı dəyişdirmək, pisini yox edib, yerinə yaxşısını gətirmək mümkündür. Hədisi-şərifdə, **"Əxlaqınızı gözəlləşdirin!"** buyuruldu. İslamiyyət mümkün olmayan şeyi əmr etməz. Təcrübələr də belə olduğunu göstərməkdədir. [Təcrübə, qəti bilgi əldə etməyə yarayan üç vasitədən biridir. Bu vasitələrdən ikincisi, Muxbiri Sadiqin[1] xəbər verməsidir. Üçüncüsü, hesab ilə anlamaqdır.] İnsanların əxlaqlarını dəyişdirə bilmə istedadları eyni deyildir.

Əxlaqın mənşəyi, səbəbi insani ruhun üç qüvvəsidir. Bunlardan birincisi ruhun **"İdrak"** qüvvəsidir. Buna **"Nitq"** və **"Ağıl"** deyilir. Nitqin nəzəri qüvvəsinin orta miqdarına **"Hikmət"** deyilir. Hikmət, yaxşını pisdən, haqqı batildən ayıran qüvvədir. Bu qüvvənin lazımından artıq olmasına **"Cərbəzə",** yəni yaramazlıq deyilir. Cərbəzə insan mümkün olmayan şeyləri anlamağa cəhd edər. Mütəşabih, yəni açıq mənası bilinməyən ayələrə məna verər. Qəza, qədər haqqında danışar. Məkr, hiylə, sehr kimi zərərli şeylər edər. Bu qüvvənin lazımından az olmasına **"Bəladət",** yəni ax-

---

[1] Müxbiri Sadiq – Peyğəmbərimiz həzrəti Muhamməd (sallallahü aleyhi və səlləm), doğru xəbərləri insanlara çatdırmış.

maqlıq deyilir. Belə şəxs xeyri-şəri bir-birindən ayıra bilməz. Nitqin əməli qüvvəsinin orta olmasına **“Ədalət”** deyilir. Ədalətin azı-çoxu olmaz.

Əxlaqın qaynağı olan qüvvələrdən ikincisi **“Qəzəb”**dir. Heyvani ruhun qüvvəsidir. Bəyənmədiyi, istəmədiyi bir şey qarşısında qanı hərəkətə gəlir. Bu qüvvənin insani ruh tərəfindən təmin edilən orta miqdarına **“Şücaət”,** cəsarət deyilir. Lazımlı, faydalı işlərə can atmaqdır. Müsəlmanların iki mislindən çox olmayan kafirlərlə hərb etmələri, məzlumu zalımdan qurtarmaları buna aiddir. Bu qüvvənin çox olması **“Təhəvvür”,** inadlı, aqressiv olmaqdır. Tez hiddətlənər. Bu qüvvənin az olması **“Cübn”,** qorxaqlıqdır. Lazımlı olan şeyi etməkdən çəkinir.

Ruhun qüvvələrindən üçüncüsü **“Şəhvət”**dir. Heyvani ruhun ona şirin gələn şeyləri istəməsidir. Bunun insani ruh tərəfindən təmin edilən orta miqdarına **“İffət”,** namus deyilir. İnsan təbiətinin möhtac olduğu şeyləri İslamiyyətə və insanlığa uyğun olaraq edər. Lazımından çox olmasına **“Şərəh”,** ehtiras, fücur (günah işləmək) deyilir. İstər halaldan olsun, istər haramdan olsun hər istədiyini əldə etməyə çalışar. Başqalarının zərərinə də olsa bəyəndiyi şeyləri toplayar. Şəhvətin lazımından az olmasına **“Humud”,** fəaliyyətsizlik, həvəssizlik deyilir ki, xəstə olduğundan və ya həyasından, yaxud qorxusundan, kibrindən, möhtac olduğu şeylərə qovuşmaqda ləng davranar.

Yuxarıda bildirilən dörd orta dərəcə, yəni hikmət, ədalət, iffət və şücaət, yaxşı əxlaqın əsasıdır. İnsan, ruhun üç qüvvətindən hikmətə tabe olduqda, digər ikisinə, yəni qəzəbə və şəhvətə hakim olar. Bu ikisini orta dərəcəli olan iffətə və şücaətə qovuşduraraq səadət əldə edər. Əgər, ağlın nəzəri qüvvəsi, orta dərəcəsi olan hikməti tapa bilməyib, iki pis uca meyl edərsə, pis əxlaq hasil olar. Həddindən artıq olan altı xüsusiyyət hər zaman pisdir. Orta dərəcədə olan dörd xüsusiyyət də pis niyyət ilə olarsa, onlar pis olur. Mala, mövqeyə qovuşmaq üçün, din adamı olmaq, riya ilə, göstəriş olaraq namaz qılmaq və cihad etmək, hikmətdən sui-istifadə etməkdir. Bir istəyə və ya mövqeyə qovuşmaq üçün bəzi istəklərini tərk etmək, iffətdən sui-istifadədir.

Əsas olan dörd yaxşı xüsusiyyətdən hər birinin, əsərləri, əlamətləri vardır. Hikmətin yeddi əsəri vardır. Şücaətin və iffətin on bir əsəri vardır.

**Pis əxlaqın əlacı –** Pis əxlaqın hamısı üçün müştərək əlac, xəstəliyi və zərərini, səbəbini, ziddini, əlacın faydasını bilməkdir. Sonra bu xəstəliyi özündə müəyyən etmək, axtarmaq, tapmaq gəlir. Bunu ya özü edər, yaxud bir alimin, rəhbərin bildirməsi ilə anlayar. Mömin möminin aynasıdır. İnsan öz qüsurlarını çətin görər. Güvəndiyi yoldaşından soruşaraq qüsurunu öyrənər. Sadiq olan dost onu təhlükələrdən, qorxulardan mühafizə edən kimsədir. Belə bir dost tapmaq çox müşküldür. Bunun üçündür ki, İmamı Şafi buyurdu:

***Sadiq dost və xalis Kimya***
***Az olur heç axtarma!***

Həzrəti Ömər (radıyallahu anh) buyurdu:

***Dostum eybimə oyatdı məni,***
***Qardaşlıq sünnətinin budur təməli.***

Düşmənlərinin ona qarşı işlətdikləri kəlmələr də insana eyiblərini tanıtmağa yarayır. Çünki düşmən insanın eyiblərini axtarıb üzünə vurar. Yaxşı dostlar isə insanın eyiblərini çox görməzlər. Birisi İbrahim Ədhəm həzrətlərinə eybini qüsurunu bildirməsi üçün yalvardıqda, "Səninlə dost oldum. Hər halın, hərəkətlərin mənə gözəl görünür. Eybini başqalarından soruş", dedi. Başqasında bir eyib gördükdə, bunu özündə axtarmaq, özündə taparsa, bundan qurtulmağa çalışmaq da pis əxlaqın əlacıdır. **"Mömin möminin aynasıdır"** hədisi-şərifinin mənası budur. Yəni, başqasının eyiblərində öz eyiblərini görür. İsa əleyhissəlama, bu gözəl əxlaqını kimdən öyrəndin dediklərində, "Bir kimsədən öyrənmədim. İnsanlara baxdım. Xoşuma gəlməyən əxlaqlarından çəkindim. Bəyəndiklərimi mən də etdim" buyurdu. Loğman həkimə, "Ədəbi kimdən öyrəndin" dediklərində, "Ədəbsizdən!" dedi. Sələfi salehinin, Əshabikiramın, Vəlilərin (rahmətullahi təala aleyhim əcmain) həyat hekayələrini oxumaq da yaxşı əxlaqlı olmağa səbəb olur.

Pis əxlaqı olan kimsə buna yoluxmanın səbəbini araşdırmalı, bu səbəbi yox etməyə, bunun ziddini etməyə çalışmalıdır. Pis əxlaqdan qurtulmaq, bunun ziddini etmək üçün çox çalışmaq lazımdır. Çünki insanın alışdığı şeydən qurtulması müşküldür. Pis şeylər nəfsə şirin gəlir.

İnsanın pis şey etdikdən sonra bu şeydən çəkinməsi, nəfsə çətin gələn şeyi etməyi adət halına salması faydalı əlacdır. Məsələn, bir pislik etsəm bu qədər sədəqə verəcəyəm və ya oruc tutacağam, gecə namazları qılacağam deyə and içməlidir. Nəfs bu çətin şeyləri etməmək üçün onlara səbəb olan pis adətini etməz. Pis əxlaqın zərərlərini oxumaq, eşitmək də faydalı əlacdır. Bu zərərləri bildirən hədisi-şəriflər çoxdur. Bunlardan bir neçəsi belədir:

1 – **“Allah qatında pis əxlaqdan böyük günah yoxdur.”** Çünki insan bunun günah olduğunu bilməz, tövbə etməz. İşlədikcə günahı qat-qat artar.

2 – **“İnsanların heç çəkinmədən, sıxılmadan etdikləri günah pis əxlaqlı olmaqdır.”**

3 – **“Hər günahın tövbəsi vardır. Pis əxlaqın tövbəsi olmaz. İnsan pis əxlaqının tövbəsini etməyib, daha pisini edər.”**

4 – **“İsti su buzu əritdiyi kimi, gözəl əxlaq da xətaları əridər. Sirkə balı korladığı kimi, pis əxlaq yaxşı əməlləri məhv edər.”**

Pis niyyətlə olmayan hikmət, ədalət, iffət və şücaət gözəl əxlaqın qaynağıdır. Gözəl əxlaqlı olmaq üçün və bu əxlaqı mühafizə edə bilmək üçün saleh kimsələrlə, gözəl əxlaqlılarla dostluq etmək lazımdır. İnsanın əxlaqı dostunun əxlaqı kimi olar. Əxlaq xəstəlik kimi keçicidir. Pis əxlaqı olanla dostluq etməmək lazımdır. Hədisi-şərifdə, **“İnsanın dini dostunun dini kimi olar”** buyuruldu. Faydasız şeylərdən, oyunlardan, zərərli zarafatlaşmaqdan və münaqişə etməkdən çəkinmək lazımdır. Elm öyrənmək və faydalı işlər görmək lazımdır. Əxlaqı korlayan, şəhvəti hərəkətə gətirən əxlaqsız kitabları oxumamaq, belə radio və televizordan qorunmaq lazımdır. Gözəl əxlaqın faydaları və haramların zərərləri, Cəhənnəmdəki əzabları həmişə xatırlanmalıdır. Mal, mövqe arxasınca qaçanlardan heç biri muradına qovuşa bilməmişdir. Malı, mövqeyi xeyir üçün axtaran və xeyir işlərdə işlədən rahatlığa, hüzura qovuşmuşdur. Mal, mövqe qayə olmamalı, xeyrə vasitə olmalıdır.

Mal, mövqe bir dənizə bənzəyər. Çox kimsə bu dənizdə boğulmuşdur. Allahu təaladan qorxmaq bu dənizin gəmisidir. Hədisi-şərifdə, **“Dünyada qalıcı deyil, yolçu kimi yaşamaq, öləcəyini heç unutmamaq lazımdır!”** buyuruldu. İnsan dünyada qalıcı deyildir. Dünya zövqlərinə daldıqca dərdlər, üzüntülər, sıxıntılar artar. Aşağıdakı hədisi-şərifləri heç unutmamaq lazımdır:

1 – **“İbadətləri az olan bir qul gözəl əxlaqı ilə qiyamətdə yüksək dərəcələrə qovuşar.”**

2 – **“İbadətlərin ən asanı və çox faydalısı az danışmaq və gözəl əxlaqlı olmaqdır.”**

3 – **“Bir qulun ibadətləri çox olsa da pis əxlaqı onu Cəhənnəmin dibinə aparar. Bəzən küfrə aparar.”**

4 – Birinin gündüzləri oruc tutduğu, gecələri namaz qıldığı, lakin pis əxlaqlı olduğu, dili ilə qonşularına, dostlarına əziyyət etdiyi söyləndikdə, Rəsulullah (sallallahu aleyhi və səlləm) cavabında, **“Belə olmaq yaxşı deyildir. Gedəcəyi yer Cəhənnəm atəşidir”** buyurdu.

5 – **“Gözəl əxlaqı tamamlamaq, yerləşdirmək üçün göndərildim”.** Səmavi dinlərin hamısında gözəl əxlaqlar vardı. Bu din bunları tamamlamaq üçün göndərildi. Bu din var ikən gözəl əxlaq bildirəcək başqa qaynağa, başqa kimsəyə ehtiyac yoxdur. Bunun üçün Muhamməd aleyhissəlamdan sonra Peyğəmbər gəlməyəcəkdir.

6 – **“Gözəl əxlaqlı olan dünya və axirət səadətlərinə qovuşar.”** Çünki gözəl əxlaqlı insan Allahu təalaya və qullara qarşı olan haqları, vəzifələri ifa edər.

7 – **“Surəti və əxlaqı gözəl olanı Cəhənnəm atəşi yandırmaz.”**

8 – **“Özündən uzaqlaşanlara yaxınlaşmaq, zülm edənləri əfv etmək, özünü məhrum edənlərə ehsan etmək gözəl əxlaqlı olmaqdır”.** Gözəl əxlaqlı insan ondan inciyənə yaxşılıq edər. Malına, şərəfinə, bədəninə zərər verəni əfv edər.

9 – **“Hirsləndiyi zaman mülayim davrananın qəlbini Allahu təala əmniyyət və iman ilə doldurar.”** Qorxusuz və əmin olar. Pislik edənə yaxşılıq etmək gözəl əxlaqların ən üstünüdür. Kamil insan olmağın əlamətidir. Düşmənləri dost edər. İmamı Qəzali (rahiməhullahü təala) deyir ki, **“İncil”**də gördüm: İsa aleyhis-

sələm, "Pislik edənə pisliklə cavab verməyin! Sağ yanağınıza vurana sol yanağınızı çevirin! Pencəyinizi alana şalvarınızı da verin!" buyurdu. Xristianların indi əllərində mövcud olan bəzi **"İncil"** kitablarında da belə yazıldığı **"Cavab verə bilmədi"** kitabımız bildirməkdədir. Xristianların İspaniyada, Qüdsdə, Hindistanda və "Bosniya Herseqovina"da müsəlmanlara və yəhudilərə etdikləri qorxunc zülmlər və inkvizisiya məhkəmələrində bir-birlərinə etdikləri işgəncələr kitablarda mövcuddur. Bu vəhşi hərəkətləri həqiqi İncilə tabe olmadıqlarını göstərməkdədir.

Hər müsəlman qəlbindən bütün pis əxlaqı çıxarıb gözəl əxlaqı yerləşdirməlidir. Bir neçəsini çıxarıb bir neçəsini yerləşdirməklə insan gözəl əxlaqlı olmaz. Təsəvvüf insanı bu kamala qovuşduran yoldur. [Belə olmayan yola təsəvvüf deyilməz. Hər elmin, hər sənətin saxtaları, korlanmışları olduğu kimi dindən, İslamiyyətdən, İslamiyyətin gözəl əxlaqından xəbərləri olmayan saxtakarlar, yalançılar özlərinə təriqətçi, şeyx deyirlər. Heç kimsə bunlara aldanmamalı, cahillərin, əxlaqsızların kitablarını oxumamalı, radiolarını dinləməməli, tələlərinə düşməməlidir.]

Pis əxlaqın məşhurları altmış ədəddir. Bunlardan qırx ədədi tərcümə edilərək qırx maddə halında aşağıda bildirilmişdir. Bunlardan çəkinən və əksini edən gözəl əxlaqlı olar.

## İMANI APARAN ŞEYLƏR

1 – Pisliklərin ən pisi Allahu təalaya inanmamaq, ateist olmaqdır. Muhamməd aleyhissəlama inanmamaq **"küfr"** [Allaha düşmənlik] olur. Mələklərin, insanların və cinin iman etmələri, inanmaları əmr olundu. Muhamməd aleyhissəlamın Allahu təaladan gətirib bildirdiyi şeylərin hamısına qəlb ilə inanıb, dil ilə də təsdiq etməyə, söyləməyə **"İman"** deyilir. İmanın yeri **"Qəlb"**dir. Qəlb, ürək dediyimiz ət parçasında yerləşən bir qüvvədir. Bu qüvvəyə **"könül"** də deyilir. İmanı söyləməyə mane olan bir şey varsa, söyləməmək əfv olur. Məsələn, qorxudulduğu, xəstə, dilsiz olduğu, söyləyəcək vaxt tapmadan öldüyü zaman söyləmək gərəkli olmaz. Anlamadan, təqlid edərək inanmaq da iman olur. Alla-

hu təalanın var olduğunu anlamamaq, düşünməmək günah olar. Bildirilənlərdən birinə inanmamaq hamısına inanmamaq olur. Hər birini bilmədən hamısına inandım demək də iman olur. İman hasil olması üçün İslamiyyətin küfr əlaməti dediyi şeylərdən çəkinmək də lazımdır. İslamiyyətin əhkamından, yəni əmr və qadağaların-dan birinə əhəmiyyət verməmək, Qurani-Kərim ilə, mələk ilə, Peyğəmbərlərdən biri ilə (aleyhimüssaləvatü vəttəslimat) istehza etmək küfr əlamətlərindəndir. İnkar etmək, yəni eşitdikdən sonra inanmamaq, təsdiq etməmək deməkdir. Şübhə etmək də inkar olur.

Küfr üç növdür: Cəhli, cühudi [inadi] və hökmi.

1-) Küfr olduğunu hər kəsin bildiyi bir şeyi eşitmədiyi, düşünməsdiyi üçün kafir olanların küfrü **"Küfri-cəhli"**dir. Cəhl də iki cürdür: Birincisi bəsitdir. Belə kimsə cahil olduğunu bilir. Bunlarda yanlış etiqad olmaz, heyvan kimidirlər. Çünki insanı heyvandan ayıran elm və idrakdır. Bunlar heyvandan da aşağıdırlar. Çünki heyvanlar yaradıldıqları şeydə irəlidədirlər. Özlərinə faydalı olan şeyləri anlar və onlara yaxınlaşarlar. Zərərli olanları da anlayıb, onlardan uzaqlaşarlar. Halbuki bu insanlar cahil olduqlarını bildikləri halda bu çirkin haldan uzaqlaşmaz, elmə yaxınlaşmazlar.

[İmamı Rabbani (rahimə-hullahü təala), **"Məktubat"** kitabının birinci cildinin iki yüz əlli doqquzuncu məktubunda buyurur ki, "Bu fəqirə görə dağda yaşayıb, heç bir din barədə eşitməyib, bütə tapınan müşriklər nə Cənnətə, nə də Cəhənnəmə girməyəcəkdir. Axirətdə dirildikdən sonra hesaba çəkilib, zülmləri, qəbahətləri qədər məhşər yerində əzab çəkəcəklər. Hər kəsin haqqı verildikdən sonra bütün heyvanlar kimi bunlar da yox ediləcəklər. Bir yerdə sonsuz qalmayacaqlar. Hər kəsin ağlı dünya işlərində belə səhv edib yanılarkən, Allahu təalanın ağılları ilə tapa bilmədikləri üçün qullarını atəşdə sonsuz olaraq yandıracağını söyləmək bu bəndəyə çox ağır gəlməkdədir. Kiçik ikən ölən kafir uşaqları da belə yox olacaqdırlar.

Bir Peyğəmbərin (aleyhimüssaləvatü vəttəslimat) vəfatından sonra çox vaxt keçib, zalımlar tərəfindən din korlanaraq unudulduğu yerlərdə yaşayıb, Peyğəmbərlərdən və İslamiyyətdən xəbəri olmayan insanlar da Cənnətə və Cəhənnəmə atılmayacaq,

bu cür təkrar yox ediləcəkdirlər”. Kafir məmləkətlərində yaşayıb, İslamiyyəti eşitməyənlər də belədir.]

İman ediləcək şeyləri və fərzlərdən, haramlardan məşhur olanları lazımı qədər öyrənmək fərzdir. Bunları öyrənməmək haramdır. Eşidib öyrənməyə əhəmiyyət verməmək küfr olur. Cəhlin əlacı çalışıb öyrənməkdir. Cəhlin ikincisi, **“Cəhli mürəkkəb”**dir. Yanlış, təhrif olunmuş etiqad etməkdir. Yunan filosoflarından və müsəlmanlardan yetmiş iki bidət firqədən olub, imanı gedənlər belədir. Bu cəhalət birincisindən daha pisdir. Əlacı bilinməyən bir xəstəlikdir. İsa aleyhissəlam, “Karı, dilsizi müalicə etdim. Ölünü diriltdim. Lakin, cəhli-mürəkkəbin əlacını tapa bilmədim” demişdir. Çünki belə kimsə cəhlini elm və kamal sanmaqdadır. Cahil və ruh xəstəsi olduğunu bilməz ki, əlacını axtarsın! Ancaq Allahu təalanın hidayəti ilə xəstəliyini anlayan bu dərddən qurtula bilər.

2-) **“Küfri cühudi”**yə küfri-inadi də deyilir. Küfr olduğunu bilərək, inad edərək kafir olmaqdır. Kibr səbəbi ilə və mal, mövqe sahibi olmağı sevməkdən və ya tənqid edilməkdən qorxması səbəbi ilə hasil olur. Fironun və yoldaşlarının küfrü belə idi. Musa aleyhissəlamın möcüzələrini gördükləri halda iman etmədilər. Bizim kimi bir insana inanmarıq, dedilər. Özləri kimi bir insanın Peyğəmbər olacağını qəbul etmədilər. Peyğəmbərin mələkdən olduğunu sandılar. Halbuki, özləri kimi insan olan Firona ilah dedilər, ona tapındılar. Roma İmperatoru Heraklyus da taxtından, səltənətindən ayrılmaq qorxusu ilə iman etmədi. Yunan padşahlarına Qayser deyilir. Fars padşahlarına Kisra, Həbəş krallarına Nəcaşi və Türk sultanlarına Xaqan, Qıbti (Misirin yerli əhalisi) padşahlarına Firon, Misir sultanlarına Əziz, Himyer (Ərəb yarımadasının cənubunda xalq) sultanlarına Tübba deyilirdi. Əshabi-kiramdan Dıhyə (radıyallahu təala anh) Rəsulullahın (sallallahu aleyhi və səlləm) İslama dəvət edən məktubunu Mədinədən Şama, Heraklyusa gətirdi. Heraklyus bir gün əvvəl Məkkədən Şama gəlmiş olan Qureyş kafirlərinin ticarət karvanının rəisi Əbu Süfyanı sarayına çağırıb:

“Mədinədə birisinin peyğəmbərlik iddia etdiyini eşitdim. Özü tanınmış kimsələrdəndirmi? Yoxsa, aşağı təbəqədəndirmi? Ondan əvvəl başqası da belə iddia irəli sürdümü? Babalarından məlik və

əmir olanlar vardırmı? Ona tabe olanlar zəngindirmi, kasıb və aciz kimsələrdirmi? Çalışmaları irəliləyirmi, geriləyirmi? Dininə girib, sonra ayrılanlar olurmu? Sözündə durmadığı, yalan söylədiyi görüldümü? Hərblərində qalibdirmi, məğlubdurmu? Əbu Süfyan bunların cavablarını bildirdikdə bu sözlərinin hamısı Onun peyğəmbər olduğunu göstərir, dedi. Əbu Süfyan [o zaman hələ iman etmədiyi üçün], küfrü və həsədi səbəbilə: "Yalan söylədiyi də oldu. Bir gecə içində Məkkədən Qüdsdəki Məscidi Əqsaya aparıldığını söylədi", dedi. Heraklyusun yanında olub bunu eşidənlərdən biri söhbətə qarışıb:

"Mən, o gecə Məscidi Əqsada idim" dedi. O gecə gördüklərini anlatdı. Ertəsi gün Heraklyus məktubu oxutdu. Məktuba inandığını, Muhamməd aleyhissəlama iman etdiyini Dıhyəyə bildirdi. Lakin, "iman etdiyimi millətə bildirməkdən qorxuram. Bu məktubu filan rahibə apar. O, çox şey bilir. Onun da iman edəcəyini sanıram" dedi. Rahib Rəsulullahdan gələn məktubu oxuduqda dərhal iman etdi. Oradakılara da iman etmələrini söylədi. Onu öldürdülər. Dıhyə Heraklyusun yanına gəlib, olanları bildirdi. "Belə olacağını bildiyim üçün iman etdiyimi kimsəyə söyləmədim" dedi. Rəsulullaha məktub göndərib iman etdiyini bildirdi. Baş şəhər olan Xumsa getdi. Orada ona bir adamından gələn məktubda Muhamməd aleyhissəlamın peyğəmbərliyi və müvəffəqiyyətləri bildirildi. Nüfuzlu, sözü keçən adamları toplayıb, məktubu oxudaraq, özünün iman etdiyini açıqladı. Hamısı qarşı çıxdılar. İman etməyəcəklərini və rədd etdiklərini anladıqda onlardan üzr istədi. "Məqsədim dinimizə olan bağlılığınızın qüvvətini anlamaq idi" dedi. Bu sözü eşitdikdə hamısı ona səcdə etdilər, razı olduqlarını bildirdilər. Səltənətini əldən verməmək üçün küfrü imandan üstün tutdu. Müsəlmanlarla savaşmaq üçün Mutə deyilən yerə ordu göndərdi. Burada çox müsəlman şəhid edildi. Rəsulullaha (sallallahu aleyhi və səlləm) Heraklyusun məktubu gəldikdə, **"Yalan söyləyir. Xristian dinindən ayrılmadı!"** buyurdu. Heraklyusa göndərilən məktubi-nəbəvinin surəti, **"Buxari"**də, **"Məvahib"** və **"Bəriqa"**da yazılıdır.

3-) Küfrün üçüncü növü, **"Küfri hökmi"**dir. İslamiyyətin imansızlıq əlaməti dediyi sözləri söyləyən və işləri görən, qəlbində

təsdiq olsa və inandığını söyləsə də kafir olur. İslamiyyətin təzimini əmr etdiyi şeyi təhqir etmək, pisləmək belədir. Bunun üçün Allahu təalaya layiq olmayan şey söyləyən kafir olur. Məsələn, Allah Ərşdən və ya göydən bizə baxır demək, sən mənə zülm etdiyin kimi Allah da sənə zülm edir demək, filan müsəlman mənim gözümdə yəhudi kimidir demək, yalan bir sözə, Allah bilir ki, doğrudur demək, mələkləri təhqir edici şeylər söyləmək, Qurani-Kərimi, hətta bir hərfini hörmətdən salıcı söz söyləmək, bir hərfinə belə inanmamaq, çalğı çalaraq Quran oxumaq, həqiqi olan Tövrata və İncilə inanmamaq, bunları pisləmək, Qurani-Kərimi şaz olan (Qureyş ləhcəsindən başqa) hərflərlə oxuyub Quran budur demək imanı götürür. Peyğəmbərləri təhqir edici şeylər söyləmək, Qurani-Kərimdə adları bildirilən iyirmi beş Peyğəmbərdən (aleyhimüssaləvatü vəttəslimat) birinə inanmamaq, məşhur sünnətlərdən birini bəyənməmək, çox yaxşılıq edən biri üçün Peyğəmbər kimidir demək küfrdür. Peyğəmbərlər (aleyhimüssaləvatü vəttəslimat) möhtac idi demək küfr olur. Çünki onların kasıblıqları öz istəkləri ilə idi. Biri peyğəmbər olduğunu söyləsə, buna inananlar da kafir olur. **"Qəbrim ilə minbərim arası Cənnət bağçalarından bir bağçadır"** hədisi-şərifini eşitdikdə, mən minbər, həsir və qəbrdən başqa bir şey görmürəm demək küfr olur. Axirətdə olacaq şeylərlə istehza etmək küfrdür. Qəbrdəki və qiyamətdəki əzablara [ağıla, fənnə uyğun deyildir deyərək] inanmamaq, Cənnətdə Allahu təalanı görməyə inanmamaq, mən Cənnəti istəmirəm, Allahı görməyi istəyirəm demək küfr olur. İslamiyyətə inanmamaq əlaməti olan sözlər, fənn bilgiləri din bilgilərindən daha xeyirlidir demək, namaz qılsam da qılmasam da eynidir demək, zəkat verməm demək, faiz halal olsaydı, zülm etmək halal olsaydı demək, haramdan olan malı kasıba verib savab gözləmək, kasıbın verilən pulun haram olduğunu bilərək verənə xeyir-dua etməsi, İmamı Əzam Əbu Hanifənnin (rahimə-hullahü təala) qiyası[1] haqq deyildir demək küfrdür. **"Araf"** surəsinin əlli altıncı ayəti-kərimsində məalən, **"Allahu təala küləyi rəhməti olan**

[1] Qiyas - haqqında ayəti kərimə və hədisi şərif olmayan bir məsələnin hökmünü, buna bənzəyən və haqqında ayəti-kərimə və hədisi-şərif olan başqa bir məsələnin hökmünə bənzədərək anlama.

**yağışdan öncə müjdəçi göndərir. Küləklər ağır olan buludları hərəkət etdirər. Buludlardan ölü olan torpağa su yağdırarıq. O yağışla yerdən meyvələr çıxararıq. Ölüləri də məzarlarından belə çıxaracağıq”** buyuruldu. Bu ayəti-kərimə qiyasın haqq olduğunu isbat etməkdədir. Bu ayəti-kərimədə ixtilaflı olan bir şeyi söz birliyi ilə anlaşılmış olan şeyə bənzətməyi bildirilməkdədir. Çünki, Allahu təalanın yağış yağdırdığını və yerdən ot çıxardığını hamı bilirdi. Öldükdən sonra dirilmənin haqq olduğunu, yer üzünün quruduqdan sonra təkrar yaşıllaşmasına bənzədərək isbat etməkdədir.

İslam bilgilərinə inanmamaq, bunları və din alimlərini təhqir etmək də küfri-cühudi olur.

Kafir olmağı istəyən buna niyyət etdiyi anda kafir olur. Başqasının kafir olmasını istəyən kimsə, küfrü bəyəndiyi üçün istəyirsə, kafir olur. Pis, zalım olduğundan zülmünün cəzasını Cəhənnəm atəşində çəkməsi üçün istəyirsə, kafir olmaz. Küfrə səbəb olduqlarını bilərək və arzusu ilə küfr kəlimələrini söyləyən kafir olur. Bilməyərək söyləyərsə, alimlərin çoxuna görə yenə kafir olur. Küfrə səbəb olmayan kəlimə söyləmək istəyərkən çaşaraq küfrə səbəb olanı söylərsə kafir olmaz.

Küfrə səbəb olan bir işi bilərək edənin imanı gedər. Bilməyərək etdikdə də küfr olur deyən alimlər çoxdur. Müsəlman olmaq üçün nəfsin də iman etməsi lazım deyildir. Nəfsindən qəlbinə küfrə səbəb olan şeylər gələn kimsə bunları söyləməzsə imanının qüvvətinə əlamət olur. Küfrə səbəb olan şeyi edən kimsəyə kafir demək olmaz. Bir müsəlmanın bir işində və ya sözündə doxsan doqquz küfr ehtimalı, bir iman ehtimalı olsa, bu kimsəyə kafir deyilməz. Müsəlmana hüsni-zənn etmək lazımdır.

Ağıllı, bilgili, ədəbiyyatçı olduğunu göstərmək üçün və ya yanındakıları heyrətləndirmək, güldürmək, sevindirmək və ya ələ salmaq üçün söylənən sözlərdə “küfri-hökmi” təhlükəsi var. Qəzəb, əsəb və hirslə söylənən sözlər də belədir. Bunun üçün insan sözünün və işlərinin nəylə nəticələnəcəyini düşünməlidir. Hər şeydə dinini qorumalıdır. Heç bir günahı kiçik görməməlidir. Bir kimsə kiçik günah işləsə, buna tövbə et deyildikdə, tövbə edəcək bir şey etmədim desə, yaxud nə üçün tövbə edim desə, küfr olur. Uşaq ikən nikah edilmiş qız, ağıllı və yetkin (həddi-büluğa çat-

mış) olduğu zaman imanı, İslamı bilməsə və soruşduqda cavab verə bilməsə, zövcündən boş olur. Çünki nikahın səhih olması üçün və davam etməsi üçün imanlı olması lazımdır. Kiçik ikən anasına, atasına tabe olaraq imanı var idi. Yetkin olduqda onlara tabeliyi davam etməz. Oğlan uşağı da belədir. Bir mömini öldürən və ya öldürülməsini əmr edən kimsəyə, "yaxşı etdin" deyən kafir olur. Qətli vacib olmayan kimsə haqqında, "öldürülməsi lazımdır" demək küfr olur. Bir kimsəni haqsız olaraq döyən və ya öldürən zalıma, "yaxşı etdin, buna layiq idi" demək küfr olur. Yalan olaraq Allah bilir ki, səni övladımdan çox sevirəm demək küfr olur. Yüksək vəzifə sahibi bir müsəlman asqırdıqda, buna **"yərhamükallah"** deyən kimsəyə, "böyüklərə qarşı belə söyləmək olmaz" demək küfr olur. Vəzifə olduğuna inanmayaraq, əhəmiyyət verməyərək, namaz qılmamaq, oruc tutmamaq, zəkat verməmək küfr olur. Allahın rəhmətindən ümidini kəsmək küfrdür. Özü haram olmayıb, sonradan hasil olan bir səbəbdən dolayı haram olan mala, pula, **"haramı liqayrihi"** deyilir. Oğurlanan və haram yollardan gələn mal belədir. Bunlara halal demək küfr olmaz. Leş, donuz, şərab kimi özləri haram olan şeylərə "**haramı li-aynihi"** deyilir. Bunlara halal demək küfr olur. Qəti olaraq bilinən haramlardan birinə halal demək də küfrdür. Azan, məscid, fiqh kitabları kimi İslamiyyətin qiymət verdiyi şeyləri təhqir etmək küfr olur. Radiodan, səsgücləndiricidən eşidilən azan həqiqi azan deyildir. Azanın bənzəridir. Bir şeyin bənzəri onun özü deyildir. Dəstəmazsız olduğunu və ya namaz vaxtının gəlmədiyini bildiyi halda namaz qılmaq, bildiyi halda qiblədən başqa tərəfə dönərək qılmaq küfr olur. Bir müsəlmanı pisləmək üçün kafir demək küfr olmaz. Kafir olmasını istəyərək söyləməyin küfr olacağı yuxarıda bildirilmişdi. Allahu təalanın əmrlərinə **"Fərz"** deyilir. Qadağan etdiyi şeylərə **"Haram"** deyilir. Fərzlərə və haramlara **"İslamiyyət"** və **"Əhkamı İslamiyyə"** deyilir. İslamiyyətə uyğun olmayan şeyi etməyə **"Günah işləmək"** deyilir. Günah işləmək küfr olmaz. Günah olduğuna əhəmiyyət verilməzsə, küfr olur. İbadət etməyin və günahdan çəkinməyin lazım olduğuna inanmamaq küfr olur. Toplanan vergilərin sultanın mülkü olduğuna inanmaq küfr olur. Bir Vəlinin eyni gün və eyni saatda müxtəlif məmləkətlərdə görüldü-

yünü söyləməyin caiz olduğunu Sadr-ül-İslam bildirmişdir. Şərqdə olan bir qadınla qərbdə olan bir kişinin övladları ola biləcəyi fiqh kitablarında yazılıdır. Böyük alim Ömər Nəsəfi (rahimə-hullahü təala), "Allahu təalanın övliyasına adətini, qanunlarını pozaraq "kəramət" verməsi caizdir" demişdir. Bu söz doğrudur. Cahildən "İman nədir, İslam nədir?" deyə soruşmaq olmaz. Bunların cavablarını söyləyib, "doğrudurmu?", soruşmaq lazımdır. Nikah ediləcək oğlandan və qızdan öncədən belə soruşaraq müsəlman olduqlarını anlamaq lazımdır. Heç kəs küfrə səbəb olan sözlər və hərəkətlər gördükdə, kafir deməməli, küfrü iradə etdiyi, əhkamı-islamiyyəyə əhəmiyyət vermədiyi anlaşılmadıqca, sui-zənn etməməlidir.

Müsəlman imanın yox olmasına səbəb olacağı söz birliyi ilə bildirilmiş şeyləri qəsdən [istəklə] söylər və ya edərsə, kafir olur. Buna **"Mürtəd"** deyilir. Mürtədin mürtəd olmadan öncəki ibadətləri və savabları yox olur. Təkrar imana gələrsə, zəngindirsə, yenidən həcc etməsi lazımdır. Namazlarını, oruclarını, zəkatlarını qəza etməsi lazım olmaz. Mürtəd olmadan öncə qəzaya buraxdıqlarını qəza etməlidir. Çünki mürtəd olduqda öncəki günahlar yox olmaz. Mürtəd olanın nikahı pozulur. İmana gələrək təcdidi nikah (nikahı yeniləmək) etmədən öncəki uşaqları vələdi zina [bic] olur. Kəsdiyi leş olur, yemək olmaz. İmanının getməsinə səbəb olan şeydən tövbə etmədikcə, yalnız **"Kəlimeyi-şəhadət"** söyləməklə və ya namaz qılmaqla müsəlman olmaz. Mürtəd olacaq şeyi etdiyini inkar etməsi də tövbə olur. Tövbə etmədən ölərsə, Cəhənnəm atəşində əbədi olaraq əzab çəkər. Bunun üçün küfrdən çox qorxmaq, az danışmaq lazımdır. Hədisi-şərifdə, **"Həmişə xeyirli, faydalı danışın. Yaxud susun!"** buyuruldu. Hər kəs ciddi olmalı, zarafatcıl, oyunbaz olmamalıdır. Dinə, qanunlara, ağıla, insanlığa uyğun olmayan şeylər etməməlidir. Özünü küfrdən mühafizə etməsi üçün Allahu təalaya çox dua etməlidir. Hədisi-şərifdə, **"Şirkdən çəkinin. Şirk qarışqanın ayaq səsindən daha gizlidir"** buyuruldu. Bu hədisi-şərifdəki şirk küfr deməkdir. Bu qədər gizli olan şeydən qorunmaq necə olur deyildikdə, **"Allahummə innə nə'uzü bikə ən-nüşrikə-bikə şəy'ən na'ləmühu və nəs-tağfirukə limə lə-na'ləmühu, duasını oxuyun!"** buyuruldu. Bu duanı səhər və axşam çox oxumaq lazımdır. Kafirlərin Cəhənnəm atəşində sonsuz

əzab görəcəkləri, Cənnətə heç girməyəcəkləri söz birliyi ilə bildirilmişdir. Kafir dünyada sonsuz yaşasaydı, sonsuz kafir qalmaq niyyətində olduğu üçün cəzası da sonsuz əzabdır. Allahu təala hər şeyin xaliqi, sahibidir. Mülkündə istədiyini etməsi haqqıdır. Ona, niyə belə etdin deməyə kimsənin haqqı yoxdur. Bir şeyin sahibinin o şeyi istədiyi kimi istifadə etməsinə zülm deyilməz. Allahu təala Qurani-Kərimdə zalım olmadığını, heç bir məxluquna zülm etmədiyini bildirməkdədir.

[Allahu təalanın **"Əsmai-hüsna"**sı vardır. Bu adları da öz varlığı kimi əzəlidir. Hər şeyin yoxdan var olduğunu, bütün varlıqların yox olduğunu görürük. Bu hal sonsuzdan belə gəlmiş ola bilməz. Hər şeyi yoxdan var edən və heç yox olmayan bir yaradan yaratmışdır. Bu yaradan özünün varlığını bildirmək üçün Peyğəmbərlər və kitablar göndərmişdir. Peyğəmbərlər və kitablar məşhurdur. Adları dünyanın hər yerindəki kitabxanalarda yazılıdır. Meydanda olan şey inkar oluna bilməz. Allahu təalanın varlığına inanmamaq, meydanda olan şeyi inkar etmək olur. Allahu təalanın varlığına və birliyinə inanmamaq, gündəlik hadisələri kitabda oxuyub, inanmamaq kimidir. Bu da ağıllı bir kimsənin edəcəyi şey deyildir. Bu doxsan doqquz adının arasında yer alan **"Müntəkim"** və **"Şədid-ül-iqab"** kimi adlarından dolayı yeddi Cəhənnəmi yaratdı. **"Rahman", "Rahim", "Qaffar", "Lətif"** və **"Rauf"** kimi adlarından dolayı, səkkiz Cənnəti yaratdı. Cəhənnəmə və Cənnətə getməyə səbəb olacaq şeyləri əzəldə ayırd etdi. Çox mərhəmətli olduğu üçün bunları qullarına bildirdi. "Cəhənnəmə girməyə səbəb olan şeyləri etməyin! Onun atəşi çox şiddətlidir. Dözə bilməzsiniz!" deyərək, qullarına dönə-dönə xəbərdarlıq etdi. Sonsuz olan Cənnət nemətlərinə qovuşduracaq şeyləri edərək, [əhkamı İslamiyyəyə tabe olaraq] dünyada və axirətdə rahat və məsud yaşamağa dəvət etdi. Bu dəvəti bəyənib seçmələri üçün, insanlara ağıl və iradə, ixtiyar kimi nemətləri də verdi. Allahu təala heç bir kimsənin Cəhənnəmə girməsini, Cəhənnəmə aparacaq şeyləri etməsini əzəldə əmr etmədi, diləmədi. Lakin dünyada kimilərin Cənnət yolunu, kimilərin də Cəhənnəm yolunu tutacaqlarını əzəldə bilirdi. **"Qəza"** və **"qədər"**i, yəni, elmi də əzəlidir. Əbu Ləhəbin Cəhənnəmə gedəcəyini xəbər verməsi, onun

Cəhənnəmə getməsini əzəldə istədiyi üçün deyildir. Cəhənnəm yolunu diləyəcəyini bildiyi üçündür.

İmana gəlmək çox asandır. Məxluqlardakı hesablı nizama, intizama baxmaq və bunlardakı incəlikləri düşünmək hər kəsə vacibdir. Atomdan günəşə qədər bütün varlıqlardakı intizam, bir-birlərinə bağlılıqları, bunların təsadüfən var olmadıqlarını, bilgili, hikmətli və sonsuz qüvvətli bir varlıq tərəfindən yaradıldıqlarını açıq aydın göstərməkdədir. Ağlı başında olan bir kimsə, məktəblərdə və universitetlərdə, astronomiya, biologiya və tibb bilgilərini öyrəndikdə, bu varlıqların bir yaradanı olduğunu və hər cür eybdən uzaq olduğunu, Muhamməd aleyhissəlamın Onun Peyğəmbəri olduğunu, bildirdiklərinin hamısının Ondan gəlmiş olduğunu dərhal anlayar. Bu yaradana dərhal inanar. Kafirlərin, yəni kafir olaraq ölənlərin sonsuz Cəhənnəmdə qalacaqlarını, möminlərin də sonsuz olaraq Cənnət nemətləri içində yaşayacaqlarını öyrəndikdə sevə-sevə müsəlman olar. Ərzurumlu İbrahim Haqqı həzrətləri, 1195-ci [m. 1781] ildə Siriddə vəfat etmişdir. **“Mərifətnamə”** kitabının 9-cu fəslində türkcə buyurur ki, “Fənn və astronomiya bilgiləri və mexanizmlər, fabriklər, ağıl ilə, təcrübə ilə hasil olduqları üçün zamanla yeniləri tapılmış, bir çox köhnə bilgilərin yanlış olduğu anlaşılmışdır. Köhnə və yeni, yanlış və doğru bütün fənn bilgiləri bu aləmin yoxdan var edildiyini, sonsuz elm və qüdrət sahibi bir yaradanın varlığına inanmaq lazım olduğunu göstərməkdədir.” Muhamməd aleyhissəlamın gözəl əxlaqını və möcüzələrini oxuyan da Onun peyğəmbər olduğunu anlayar. Birinci cild, 46-cı məktubu oxuyun!]

Hər gün bir dəfə namaz qılmaq asandır. Hər gün beş dəfə namaz qılmaq çətindir və çox kimsələri usandırır. Mərhəməti sonsuz, bol olan Allahın asan şeyi əmr etməyib, çətin şeyi əmr etməsi ağıla uyğundurmu? [Müsəlman olmuş bir ingilis qadının bu suala verdiyi çox gözəl cavab, **“Hər kəsə Lazım Olan Iman”** kitabımızın 210-cu səhifəsinin son sətrində yazılmışdır.]

## CƏHALƏT

2 – Qəlb xəstəliklərinin, ikincisi, **“Cəhalət”**dir. Cahilliyin çeşidləri və zərərləri birinci maddənin baş tərəfində bildirilmişdir.

## MAL, MÖVQE HƏRİSLİYİ

3 – Qəlb xəstəliklərinin, yəni pis əxlaqın üçüncüsü mal və mövqe hərisliyidir. Aşağıdakı hədisi-şəriflər **“Hubbürriyasət”** deyilən bu xəstəliyin müayinə və müalicəsini öyrədir:

1) **“İki ac qurd bir qoyun sürüsünə girdiyi zaman verdikləri zərərdən mal və şöhrət hərisliyinin verəcəyi zərər daha çoxdur.”**

2) **“İnsana zərər olaraq din və dünya işlərində barmaqla göstərilməsi bəs edər.”** Yəni, insanın din və ya dünya işlərində şöhrət sahibi olması dininə də, dünyasına da çox zərər verir.

3) **“Mədh olunmağı sevmək insanı kor və kar edər. Qəbahətlərini, qüsurlarını görməz. Doğru sözləri, ona edilən nəsihətləri eşitməz.”**

Mövqe və şöhrət sahibi olmaq arzusu insanlarda üç şeydən hasil olur: Birinci səbəb, nəfsin arzularına qovuşmaqdır. Nəfs arzularının haram yollardan əldə edilməsini istəyər. İkincisi, özünün və başqalarının haqlarını zalımlardan qurtarmaq və müstəhəb olan, məsələn, sədəqə vermək üçün və yaxşı əməllər etmək üçün yaxud, mübah olan işlər etmək üçün, məsələn, yaxşı yemək, yaxşı geyinmək, yaxşı evlərdə yaşamaq və ailə-uşaq sahibi olub, rahat və məsud yaşamaq üçün və ya ibadətlərinə mane olacaq şeylərdən qurtulmaq üçün və İslam dininə, müsəlmanlara xidmət üçün mövqe sahibi olmaq istəmək olar. Bu niyyət ilə vəzifəyə qovuşarkən, riya kimi, haqqı batil ilə qarışdırmaq kimi, İslamiyyətin qadağan etdiyi şeyləri etməzsə və vacibləri, sünnətləri tərk etməzsə, bunun mövqe sahibi olması caizdir, hətta müstəhəbdir. Çünki, caiz və lazım olan şeylərə qovuşdurucu səbəbləri, vasitələri etmək də caiz və lazım olur. Allahu təala Qurani-Kərimdə yaxşı insanların necə olacağını

bildirərkən, bunların "Müsəlmanlara imam olmaq istədiklərini" də bildirməkdədir. Süleyman aleyhissəlam, "Ya Rəbb! Məndən sonra kimsəyə nəsib etməyəcəyin bir mülkü mənə ehsan eylə!" deyərək məlik və əmir olmaq istəmişdir. Öncəki dinlərdən bildirilən və rədd edilməyən xəbərlər bizim dinimizdə də mötəbərdir. Hədisi-şərifdə, **"Haqq və ədalət üzrə bir gün hakimlik etməyi, bir il davamlı qəza (cihad) etməkdən daha çox sevirəm"** buyuruldu. Bir hədisi-şərifdə, **"Bir saat ədalət ilə idarəçilik etmək, altmış il nafilə ibadət etməkdən daha yaxşıdır"** buyuruldu. Riya ilə və haqqı batil ilə qarışdıraraq vəzifə sahibi olmaq caiz deyildir. Yaxşı niyyətlə olsa da caiz deyildir. Çünki haramları və məkruhları yaxşı niyyət ilə də etmək caiz deyildir. Hətta, bəzi haramların yaxşı niyyətlə edilməsi daha böyük günah olur. Niyyətin yaxşı olması itaətlərdə, ibadətlərdə faydalı olur. Mübah, hətta fərz olan bir əməl niyyətə görə günah ola bilər. Günah işləyənin, "Sən qəlbimə bax! Qəlbim təmizdir. Allah qəlbə baxar" sözünün yanlış, hətta zərərli olduğu buradan da aydın olur.

Mövqe sahibi olmağı istəməyin səbəblərindən üçüncüsü nəfsini əyləndirməkdir. Nəfs, maldan olduğu kimi mövqedən də ləzzət alır. Arada İslamiyyətə uyğun olmayan işlər olmazsa, nəfsi ləzzət aldığı şeyə qovuşdurmaq haram olmasa da, təqvanın, himmətin az olduğunu göstərir. Mövqe əldə etdikdən sonra insanların könüllərini qazanmaq üçün, riya, yaltaqlıq və göstəriş etməsindən qorxulur. Hətta, münafiqlik və haqqı batillə qarışdırmaq və hətta hiylə və yalan kimi təhlükəli hallar da ola bilər. Halal ilə haram qarışıq olan şeyi etməmək lazımdır. Mövqe sahibi olmağın bu üçüncü səbəbi, haram deyilsə də, yaxşı olmadığı üçün əlacını bilmək və etmək lazımdır. Öncə mövqenin keçici, ötəri olduğunu və zərərlərini, təhlükələrini düşünmək lazımdır. Şöhrətdən və hörmət toplayaraq kibrli olmaqdan qurtulmaq üçün, İslamiyyətdə mübah, caiz olub, xalqın bəyənmədiyi işləri etmək lazımdır. Bir zamanlar bir əmir bir zahidin ziyarətinə gedir. Zahid əmirin və ətrafındakıların ona yaxınlaşmaq istədiklərini anladıqda, ziyafət verir. Özü iri tikələri tez-tez yeməyə başlayır. Əmir bu halı görüb, zahidi bəyənməyərək oradan ayrılır. Zahid arxasından, "Əlhamdülillah! Rəbbim məni qurtardı" deyir. Mövqe sahibi olmaq arzusunu yox edən ən qüvvətli

dərman insanlardan uzaq durmaqdır. Din və dünya üçün zəruri vəzifələrdən başqa insanlar arasına qarışmamaq lazımdır. Hədisi-şərifdə bu əlac tövsiyə edilmişdir.

## AYIBLANMAQ QORXUSU

4 – Qəlb xəstəliklərinin dördüncüsü, insanların tənqidlərinə, dedi-qodu etmələrinə, ayıblamalarına üzülməkdir. Küfri cühudiyə səbəb olan şeylərin üçüncüsü insanlardan utanmaq və başqalarının tənqidlərindən, ayıblamalarından qorxmaqdır.

İnsanların tənqidlərindən və ayıblamalarından qorxmağa qarşı əlac olaraq belə düşünmək lazımdır: Tənqidləri doğrudursa eyblərimi mənə bildirmiş olurlar. Bunları etməməyə qərar verdim demək, belə tənqidlərdən rahatlıq duymaq, onlara təşəkkür etmək lazımdır. Həsəni Bəsriyə (rahimə-hullahü təala), birisinin onu qeybət etdiyini xəbər verdilər. Ona bir qab halva göndərib, "Savablarını mənə hədiyyə etdiyini eşitdim. Qarşılığında bu şirniyyatı göndərirəm" dedi. İmamı Əzam Əbu Hanifəyə (rahiməhullahü təala), birisinin onu qeybət etdiyini söylədilər. Ona bir kasa qızıl göndərib, "Bizə verdiyi savabları artırarsa biz də qarşılığını artırarıq" dedi. Edilən pisləmə yalan isə, iftira isə, zərəri söyləyənə olur. Onun savabları mənə verilir. Mənim günahlarım ona yüklənir, demək lazımdır. İftira etmək, nəmmamlıq etmək (söz gəzdirmək) qeybət etməkdən daha pisdir. Nəmimə, müsəlmanlar arasında söz gəzdirməkdir. ["**Məktubatı Masumiyyə"** ikinci cild, 123-cü məktubuna baxın!]

## TƏRİFLƏNMƏYİ SEVMƏK

5 – Qəlb xəstəliklərinin beşincisi, **"Mədh və Səna"** olunmağı sevməkdir. Bunun səbəbi, insanın özünü bəyənməsi, böyük, yaxşı sanmasıdır. Mədh olunmaq belə kimsəyə şirin gəlir. Bunun üstünlük, yaxşılıq olmadığını, olsa da keçici olduğunu düşünmək lazımdır. Kibr xəstəliyi mövzusunda bununla bağlı geniş məlumat veriləcəkdir.

## BİDƏT ETİQADI

6 – **“Bidət etiqadı”,** yanlış inanmaqdır. İmanın pozulmuş və yanlış olmasıdır. Müsəlmanların çoxu bu pis xəstəliyə tutulmuşdurlar. Hiss orqanları ilə anlaşıla bilməyən, hesab ilə əldə oluna bilməyən şeylərdə ağıl işlətmək və ağlın yanıldığı şeylərə inanmaq insanı bu xəstəliyə gətirib çıxarar. Hər müsəlmanın **“etiqadda məzhəb”**in iki İmamından birinə, yəni **“Matüridi”** və ya **“Əşari”** məzhəbinə tabe olması lazımdır. Bu iki İmamdan birini təqlid etmək insanı bu xəstəlikdən qurtarar. Çünki **“Əhli sünnət”** alimləri (rahimə-hümullahü təala) ağlın çatmadığı bilgilərdə yalnız Qurani-Kərimə və Hədisi-şəriflərə tabe olmuş, ağıllarını yalnız bu ikisinin mənalarını axtarıb tapmaqda və anlamaqda işlətmişdirlər. Bu mənaları Əshabi-kiramdan, Onlar da Rəsulullahdan öyrənmiş və öyrəndiklərini kitablarına yazmışdırlar. [Qurani-Kərimdə və Hədisi-şəriflərdə açıqca bildirilmiş olan bir şeyə inanmayan və ya şübhə edən **“Qeyri-müsəlman”** [Allahın düşməni] olur. Açıq olaraq bildirilməmiş, şübhəli olan əmrlərə yanlış məna vermək **“Bidət”** olur. Qurandan, hədisdən yanlış məna çıxarana **“Bidət sahibi”** deyilir. Öz anladıqlarına, düşüncələrinə Quran, hədis deyənə **“Zındıq”** deyilir. Bu yanlış anladığına inanan, bidət sahibi olur. Belə şey olmaz, ağlım qəbul etməz desə, kafir olur. Bir harama mübah deyən kimsə, bir ayətə və ya hədisi-şərifə istinad edərək söyləyirsə, kafir olmaz, bidət sahibi olur. Muhamməd Şihristani (rahimə-hullahü təala), **“Miləl və Nihal”**da deyir ki, Hənəfi məzhəbinin alimləri etiqadda Əbu Mansur Matüridi (rahimə-hullahü təala) həzrətlərinə tabe olmuşdurlar. Çünki Əbu Mansur həzrətləri üsul və füruda İmamı Əzam Əbu Hanifənin məzhəbindədir. **“Üsul”**, etiqad deməkdir. **“Füru”**, əhkamı İslamiyyə deməkdir. Maliki, Şafii və Hənbəli məzhəblərinin alimləri etiqadda Əbül-Həsən Əşari (rahimə-hullahü təala) həzrətlərinə tabe olmuşdurlar. Əbül-Həsən Əşari həzrətləri Şafii məzhəbində idi. Şafii alimlərindən Əbül-Həsən Əli Sübqinin oğlu Abdülvəhhab Tacüddini Sübqi (rahimə-hullahü təala) deyir ki, hənəfi alimlərinin kitablarını araşdırdım, on üç məsələdə Şafii etiqadından ayrıldıqlarını gördüm. Lakin bu

ayrılıqları onları doğru yoldan çıxarmır. Əsasda ayrılıqları yoxdur. Hər ikisi də haqq yoldadır. Muhamməd Hadimi (rahimə-hullahü təala) **"Bəriqa"** kitabının üç yüz on yeddinci səhifəsində, Matüridi və Əşari məzhəbləri arasındakı ən kiçik fərqləri də hesaba qataraq hamısının yetmiş üç ədəd olduğunu bildirmişdir. Bidət sahiblərinin mütləq Cəhənnəmə gedəcəkləri **"Hadiqa"** və **"Bəriqa"** kitablarında geniş yazılmışdır.]

## HƏVAYİ NƏFS

7 – Qəlb xəstəliklərinin, yəni pis əxlaqın yeddincisi, **"nəfsin həvası"**na, şəhvətlərinə, istəklərinə, ləzzətlərinə tabe olmaqdır. Bunun pis olduğu Ayəti-kərimələrdə açıqca bildirilmişdir. Nəfsin arzularının insanı Allah yolundan azdırıcı olduqları, Qurani-Kərimdə xəbər verilmişdir. Çünki nəfs daim Allahu təalanı inkar, Ona inad, üsyan etmək istər. Hər işdə nəfsin arzularına tabe olmaq, nəfsə tapınmaq olur. Nəfsinə tabe olan, küfrə və ya bidət sahibi olmağa yaxud fisqə yəni haram işləməyə başlar. Əbu Bəkr Tamistani (rahimə-hullahü təala) deyir ki, "Nəfsə tabe olmaqdan qurtulmaq, dünya nemətlərinin ən böyüyüdür. Çünki nəfs, Allahu təala ilə qul arasındakı pərdələrin ən böyüyüdür". Səhl ibn Abdullah Tüstəri [283 h. Bəsrədə] deyir ki, "İbadətlərin ən qiymətlisi, nəfsə uymamaqdır". İslam ibn Yusif Bəlhi, Hatəm-ül-əsama [237 h.] bir şey hədiyyə etdi. Hatəm bunu qəbul etdikdə, "bunu qəbul etmək nəfsin arzusuna tabe olmaq deyilmi?" dedilər. "Qəbul etməklə özümü zəlil, onu əziz eylədim. Rədd etsəydim, özüm əziz, o zəlil olardı. Nəfsimin xoşuna gələrdi", dedi. Rəsulullah (sallallahu aleyhi və səlləm), uzun bir Hədisi-şərifin sonunda buyurdu ki, **"İnsanı fəlakətə sürükləyən şeylər üçdür: Xəsislik, nəfsə tabe olmaq, özünü bəyənmək."** İmamı Qazali (rahimə-hullahü təala) buyurdu ki, Allahu təalanın insana yardımına mane olan pərdələrin ən pisi, **"Ucb"**dur. Yəni eyblərini görməyib ibadətlərini bəyənməkdir. Isa aleyhissəlam buyurdu ki, "Ey havarilər! Külək çox işıqları söndürmüşdür. Ucb da çox ibadətləri söndürmüş, savablarını yox etmişdir."

Hədisi-şərifdə, **“Ümmətimin iki pis əxlaqa yoluxmalarından çox qorxuram. Bunlar, nəfsə tabe olmaq və ölümü unudub dünya arxasınca getməkdir”** buyuruldu.

Nəfsə tabe olmaq İslamiyyətə tabe olmağa mane olur. Ölümü unutmaq, nəfsə tabe olmağa səbəb olur. Hədisi-şərifdə, **“Ağlın əlaməti, nəfsə qalib və hakim olmaq və öldükdən sonra lazım olanları hazırlamaqdır. Axmaqlıq əlaməti, nəfsə tabe olub, Allahdan əfv, mərhəmət gözləməkdir”** buyuruldu. Nəfsə tabe olub tövbə və istiğfar etmədən, əfv və Cənnət gözləmək axmaqlıqdır. Səbəbinə yapışmadan bir şey gözləməyə **“Təmənni”** deyilir. Səbəbinə yapışdıqdan sonra, gözləməyə **“Rəca”** deyilir. Təmənni, insanı tənbəlliyə aparır. Rəca isə, çalışmağa səbəb olur. Nəfsin sevdiyi, istədiyi şeylərə **“Həva”** deyilir. Nəfs yaradılışında pislikləri, zərərli şeyləri sevici və istəyicidir. “Nəfsindən çəkin daim. Ona güvənmə əsla. Yetmiş şeytandan daha artıq düşməndir sənə” beyti tam yerində söylənmişdir. Nəfsin insanı haramlara və məkruhlara sürükləməsinin zərərləri meydandadır. İstəkləri daima heyvani arzulardır. Heyvani arzular isə hər zaman dünyadakı ehtiyaclardır. İnsan bu arzuların arxasınca getdiyi qədər, axirət ehtiyaclarını hazırlamaqda geri qalır. Çox mühüm olan bir şeydə nəfs mübahlarla doymaz. Mübahlardan istifadə etməyi artırdıqca istəklərini artırır. Yenə də doymaz. İnsanı haramlara sürükləyər. Bundan başqa mübahlardan həddən artıq istifadə məyusluğa, dərdlərə, xəstəliklərə səbəb olur. Belə insan daima mədəsini, istəklərini düşünür. Xəsis və rəzil olur.

[İmamı Rabbani (rahimə-hullahü təala) buyurur ki, “Bütün varlıqların əsli “Adəm”dir, yoxluqdur. Hər şey yox ikən Allahu təala bunları yoxluqda bilirdi. Elmindəki bu adəmlərə öz sifətlərindən əks etdirdi, yansıtdı. Varlıqların əsilləri hasil oldu. Elmdəki bu əslləri xaricə çıxardı. Alma çəyirdəyinin alma ağacına əsl olması kimi varlıqlar hasil oldu. İnsanın quruluşunu anlamaq üçün bir şeyin aynadakı xəyalını düşünək. Aynadakı bu görüntü o şeydən gələn şüaların aynadakı əksidir. Ayna adəm (yoxluq) kimidir. İnsanın qəlbi və ruhu bu şüalara bənzər. Ayna insanın bədəninə, şüşənin parlaqlığı isə nəfsə bənzər. Yəni, nəfsin əsli adəmdir. Qəlb ilə, ruh ilə əlaqəsi yoxdur”. Nəfsə tabe olan həmişə İslamiyyətdən kənara

çıxar. Heyvanlarda ağıl və nəfs olmadığı üçün ehtiyaclarını tapdıqda ödərlər. Yalnız bədənlərinə zərər verən, onları incidən şeylərdən qaçarlar. İslam dini rahat və hüzur içində yaşamaq üçün lazım olan şeylərdən və dünya ləzzətlərindən faydalı olanları qadağan etmir. Bunların əldə edilməsində və istifadə olunmasında ağla və dinə tabe olmağı əmr edir. İslam dini insanların dünyada da, axirətdə də rahat və hüzur içində yaşamasını istəyir. Bunun üçün ağıla tabe olmağı əmr edir. Nəfsə tabe olmağı qadağan edir. Ağıl yaradılmasaydı insan hər zaman nəfsinə tabe olar, fəlakətlərə sürüklənərdi. Nəfs olmasaydı insan yaşaması və törəməsi üçün, mədəni həyat üçün lazım olan şeyləri qazanmaqdan ötrü çalışmasında qüsur edərdi və nəfs ilə cihad savabından məhrum qalardı. Mələklərdən daha üstün olmaq yolu bağlı qalardı. Hədisi-şərifdə buyuruldu ki, **"Axirətdə olacaqlardan sizin bildiklərinizi heyvanlar bilsəydi, yemək üçün ət tapa bilməzdiniz!"** Yəni, heyvanlar axirətdəki əzabların qorxusundan yeməkdən, içməkdən kəsilərdilər. Bir dəri, bir sümük qalardılar. İnsanlarda nəfs olmasaydı, heyvanlar kimi qorxudan yeyə, içə və yaşaya bilməzdilər. İnsanların yaşaya bilmələri, nəfslərinin qəfləti və dünya ləzzətlərinə düşkün olması ilədir. Nəfs iki tərəfi kəskin bıçaq kimidir. Həm də zəhərli dərman kimidir. Həkimin tövsiyəsinə görə istifadə edən bundan fayda qazanar. Həddən artıq işlədən həlak olar. İslamiyyət nəfsin həlak edilməsini, yox edilməsini deyil, tərbiyə edilməsini, ondan istifadə edilməsini əmr edir.]

Nəfsin İslamiyyətdən qırağa çıxmasının qarşısını almaq üçün onunla iki cihad vardır: Birincisi, ona tabe olamamq, onun arzularını yerinə yetirməməkdir. Buna, **"Riyazət"** çəkmək deyilir. Riyazət, vəra və təqva ilə olur. **"Təqva",** haramlardan çəkinməkdir. **"Vəra"** haramlardan və mübahları ehtiyacdan artıq istifadədən də çəkinməkdir. Cihadın ikincisi, nəfsin istəmədiyi şeyləri etməkdir. Buna **"Mücahədə"** deyilir. Bütün ibadətlər mücahədədir. Bu iki cihad nəfsi tərbiyə edər. İnsanı kamilləşdirir. Ruhları qüvvətləndirir. Siddiqlərin, şəhidlərin və salehlərin yoluna qovuşdurur. Allahu təala qullarının itaətlərinə, ibadətlərinə möhtac deyildir. Qullarının günah işləməsi Ona heç zərər verməz. Qullarının nəfslərini tərbiyə etmək, nəfslə cihad etmək üçün bunları əmr etmişdir.

İnsanlarda nəfs olmasaydı, insanlıq qalmaz, mələklik hasil olardı. Halbuki, bədən bir çox şeylərə möhtacdır. Yemək, içmək, yatmaq, istirahət etmək lazımdır. Süvariyə heyvan lazım olduğu kimi, insana da bədən lazımdır. Heyvana baxmaq lazım olduğu kimi, bədənə xidmət etmək də lazımdır. İbadətlər bədən ilə edilir. Bir nəfərin gecələri yatmayıb, ancaq namaz qıldığı söyləndikdə, **"İbadətlərin qiymətlisi az olsa da davamlı edilənlərdir"** buyuruldu. İbadətin davamlı edilməsində qulluğa alışmaq vardır.

Niyyət edərək İslamiyyətə tabe olmağa **"İbadət"** etmək deyilir. Allahu təalanın əmrlərinə və qadağalarına **"Əhkamı İslamiyyə"** və **"Əhkamı ilahiyyə"** deyilir. Əmr edilənlərə **"Fərz"**, qadağan edilənlərə **"Haram"** deyilir. Hədisi-şərifdə, **"İbadətləri taqətiniz çatacaq qədər edin. Zövqlə edilən ibadətin qiyməti çox olur"** buyuruldu. Bədən istirahət edincə ibadətlər həvəslə edilir. Bədən və zehn yorğun ikən edilən işdən sıxıntı hasil olur. Yorğunluğu aradan qaldırmaq üçün arabir mübah olan şeylərlə bədənə nəşə gətirmək lazımdır. İmamı Qəzali (rahimə-hullahü təala) buyurur ki, "Çox ibadət etdikdə bədən yorulur. Hərəkət etmək istəməz. Bu zaman yatmaqla və ya salehlərin həyat hekayələrini oxumaqla, yaxud mübah olan əyləncələrlə bədəni nəşələndirmək lazımdır. Belə etmək sıxılaraq ibadət etməkdən əfdaldır (daha yaxşıdır)." İbadət etməkdə məqsəd həm mücahədə edərək nəfsi tərbiyə etmək, həm də qəlbə sakitlik, rahatlıq vermək, qəlbi Allaha bağlamaq üçündür. **"Namaz insanı pis və çirkin işlər etməkdən qoruyar"** buyuruldu. Sevərək, nəşə ilə qılınan namaz belə olur. Bu nəşəni hasil etmək üçün nəfsin mübahlardakı arzularını ehtiyac olduğu qədər yerinə yetirmək lazım olur. Belə etmək İslamiyyətə tabe olmaq olur. İbadətlərə səbəb olan mübahlar da ibadət sayılır. **"Alimin yuxusu cahilin ibadətindən xeyirlidir"** hədisi-şərif, bu sözümüzün şahididir. Mürgüləyərək, yuxulayaraq, təravih namazı qılmaq məkruhdur. Yuxulu hal gedincə sevinclə qılmaq lazımdır. Yuxulayaraq qılınan namazda zəiflik və qəflət olur.

[Yuxarıdakı yazıları yanlış anlamaq lazım deyil. Yorğunluq və sıxıntı hasil olduğu zaman ibadət təxir edilir, tərk edilməz. Fərzləri üzrsüz tərk etmək böyük günahdır. Qəza etmək fərz olur. Vacibləri də qəza etmək vacib olur. Sünnətləri tərk edən bunların savabın-

dan məhrum qalır. Üzrsüz tərk etməyi adət edərsə, bu sünnətlərə məxsus olan şəfaətdən məhrum qalar. Yorğun, halsız, nəşəsiz olmaq, fərzləri vaxtından sonraya saxlamaq üçün üzr olmaz. Vaxtından sonraya saxlamaq günahından və əzabından insan qurtula bilməz. Əhkamı İslamiyyəyə, yəni fərzlərə və haramlara əhəmiyyət verməməyin küfr olduğu aqaid (iman bilgiləri) kitablarında bildirilmişdir. İslam düşmənləri bu nöqtədən də gəncləri aldatmağa, İslamiyyəti içəridən yıxmağa çalışırlar. Bunlara aldanmamaq üçün Əhli sünnət alimlərinin yazdıqları fiqh və elmihal kitablarını oxuyub, fərzləri, haramları yaxşı öyrənməkdən başqa çarə yoxdur.]

## TƏQLİD İLƏ İMAN

8 – Qəlb xəstəliklərinin səkkizincisi, tanımadığı kimsələri **"təqlid"** etməkdir. Əhli sünnət alimi olduğu anlaşılmayan kimsənin sözlərinin, kitablarının və özünün mədh olunmasına, şişirdilmiş, atəşli propaqandalara aldanaraq, buna tabe olmaq caiz deyildir. Necə kimsə olduğunu araşdırmadan, onu güvəndiyi kimsələrdən soruşmadan, etiqadında, sözlərində və ibadətlərində ona tabe olmaq insanı fəlakətə düçar edər. Müsəlman olmaq üçün, yəni Allahu təalanın varlığını, bir olduğunu, qüdrətini, sifətlərini anlamaq üçün əslində kimsəni təqlidə ehtiyac yoxdur. Fənn bilgilərini yaxşı öyrənən, ağlı başında bir kimsə yalnız düşünməklə Onun var olduğunu anlayar. İmana qovuşar. Əsəri görərək müəssirin, yəni əsəri ortaya çıxaranın varlığını anlamamaq axmaqlıq olar. Hər insanın belə düşünərək imana gəlməsini dinimiz əmr etməkdədir. Sələfi salehin (hicri ilk əsrin müsəlmanları) bu əmri söz birliyi ilə bildirmişdir. Hicrətin dörd yüzüncü ilindən sonra meydana çıxan bəzi yanlış firqədəkilər, nəzər [incələmək] və istidlal etməyə [əsəri görüncə, müəssirini anlamağa] ehtiyac yoxdur, dedilərsə də, bunların sözlərinin qiyməti yoxdur. Çünki, sonra gələnlərin xilafı (qarşı çıxması), sabiqlərin icmasını rədd etməz. Bunun üçün anasını, atasını, müəllimlərini təqlid edərək doğru etiqada qovuşan kimsənin imanı səhih olsa da nəzəri və istidlalı tərk etdiyi üçün, yəni fənn bilgilərini qısaca öyrənib, Allahu təalanın varlığını düşünmədiyi

üçün günah işləmişdir. Fənn dərslərini öyrənməmiş bir kimsə anadan-atadan, kitabdan öyrənərək iman etdiyi, düşünərək qəbul etdiyi, ağlını işlədərək inandığı üçün istidlalı tərk etmiş sayılmaz deyənlər vardır.

Əməllərdə, ibadətlərdə, ictihad dərəcəsinə yüksəlmiş olan alimlərdən birini seçərək hər işində bunu təqlid etməsi lazımdır. Dörd məzhəb alimlərindən birini təqlid edər. Belə həqiqi Əhli sünnət alimi tapa bilməzsə, kitablarını təqlid edər. **"İctihad",** nasslarda açıq bildirilməmiş, gizli bildirilmiş olan bilgiləri anlamaq, açıqlamaq deməkdir. Ayəti-kərimələrə və hədisi-şəriflərə **"Nass"** deyilir. İctihad etmək şərtlərinə malik olan dərin alimlərə **"Müctəhid"** deyilir. Hər din kitabına tabe olaraq ibadət etmək caiz deyildir. Əhli sünnət olmayan din adamlarının kitablarına və sözlərinə tabe olmamaq lazımdır. **"Kadihan", "Haniyyə", "Hülasa", "Bəzzaziyyə"** və **"Zahiriyyə", "İbni Abidin"** fətva kitabları hənəfi məzhəbində, **"Müxtəsəri Xalil"** malikidə, **"Əl-Ənvar li-amali əbrar", "Tuhfət-ül-möhtac"** şafidə və **"Əl-fiqh-u aləl-məzahib-il-ərbəa"** dörd məzhəbdə sağlam və səhihdirlər. İbadət və əhkam bilgiləri hədis kitablarından asan anlaşılmaz. **"Əhkam",** halal, haram olan şeylər deməkdir. Hədis kitablarının ən mötəbəri **"Buxari", "Müslim"** və **"Kütübi sittə"** deyilən digər dörd hədis kitabıdır.

Təsəvvüfdən bəhs edən kitabların ən qiymətlisi **"Məsnəvi"**dir. Təsəvvüfdən və İslamiyyətdən birlikdə bəhs edən ən qiymətli kitab İmamı Rabbaninin **"Məktubat"**ıdır.

Alim görünən və din adamı deyilən hər kəsin sözünə və ya kitabına tabe olaraq əməl etmək caiz deyildir. Yuxarıda bildirilən qiymətli kitablardan toplanmış, tərcümə edilmiş Əhli sünnət alimlərinin yazdıqları **"Elmihal kitabları"**nı oxumaq lazımdır. Belə tərcümə edilməmiş, öz başından yazılmış ilmihal kitablarını və uydurma təfsirləri oxumaq insanı dünya və axirət fəlakətlərinə sürükləyər. [Kazanlı reformcu Musa Beykiyev özünə müsəlman deməkdə, Qurani-Kərimə və Hədisi-şəriflərə inanmayıb, yeni bir din uydurub buna İslamiyyət demişdir. Şişirdilmiş, yalan kəlimələrlə, müsəlmanlara mürtəce, Əhli sünnət alimlərinə dini fanat deyir. Quran və hədislər bu günki fənn bilgiləri ilə yetişmiş

olan gənclərin tabe olacaqları bir din deyildir deyərək, uydurduğu düşüncələrinə din deməkdə, kitabları ilə gəncləri aldatmaqdadır. Buna aldananlar çıxardıqları aylıq tatarca "Xəbər bülleteni" məcmusında pozulmuş, alçaq yalanlarla Əhli sünnət alimlərinə hücum etmişdir. Onların Əhli sünnət kitablarını oxuyaraq doğru yola qovuşmaları üçün dua edirik.]

Şirkdən, yəni küfrdən, yəni imansızlıqdan sonra ən böyük günah bidət etiqadında olmaqdır. Bu yanlış və pozğun etiqadın əksinə, **"Əhli sünnət vəl-cəmaat"** etiqadı deyilir. Allaha imandan sonra ibadətlərin, üstünlüklərin ən qiymətlisi Əhli sünnət etiqadında olmaqdır. Əhli sünnət demək, etiqadda, söyləməkdə, hər işdə, ibadətlərdə və insanlara qarşı edilən işlərdə, Muhamməd aleyhissəlamın sünnətinə, yəni yoluna, Əshabi-kirama, Tabiinin və daha sonra gələn Əhli sünnət alimlərinin (radıyallahu təala anhüm əcmain) icmasına, yəni söz birliyinə tabe olmaqdır. Bunların yolunu fiqh və elmihal kitablarından oxuyub öyrənmək lazımdır. Həqiqi müsəlman bu yolda olanlardır.

[Pis kimsə [Fasiq] ilə dost olmağın sonu fəlakətdir. Pis insan İslamiyyəti bəyənməyən şəxs deməkdir. Muhamməd aleyhissəlamın əmrlərinə və qadağalarına **"İslamiyyət"** və **"Əhkamı ilahiyyə"** deyilir. İnsanların ən pisi **"Zındıq"**lardır. Bunlar müsəlman adını daşıyır, böyük çalma (əmmamə), köhnə cübbə içində gizlənirlər. Peyğəmbərimizi və İslamiyyəti mədh edərlər. Lakin Qurani-Kərimə və Hədisi-şəriflərə yanlış məna verərək İslamiyyəti istədikləri şəklə salarlar. Bunlar ingilis nökərləridir. Londondakı mason mərkəzindən aldıqları bol pul, saxta diplom, şöhrət ilə, kafirlərə satılmış axmaqlardır. Ağlı olan Əhli sünnət kitablarını oxumuş olan bunlara aldanmaz. Peyğəmbərimiz bu münafiqlərin gələcəyini və Cəhənnəmin dibində çox acı əzabda əbədi yanacaqlarını xəbər verdi. Gənc qardaşlarımızı bu xain düşmənlərə aldanmaqdan qorumaq üçün bu sətirləri yazırıq. Bu nəsihətimiz ağlı olana çox faydalı olacaqdır. "Ağlı olana nəsihət dinləmək saz, ağlı olmayana davul, zurna az" sözü məşhurdur. Bu bilgilər **"Qiyamət və Axirət"** kitabımızın 18-ci və sonrakı maddələrində ətraflı yazılıdır.]

## RİYA

9 – Qəlb xəstəliklərinin, yəni pis əxlaqın mühümlərinin altmış ədəd olduğunu bildirmişdik. Bunlardan doqquzuncusu riyadır. Riya, bir şeyi olduğunun tərsinə göstərməkdir. Qısaca göstəriş deməkdir. Axirət əməllərini yerinə yetirməklə axirət yolunda olduğunu göstərərək, dünya arzularına qovuşmaq deməkdir. Qısaca, dünya qazancına dini alət, vasitə etməkdir. İbadətlərini göstərərək insanların sevgisini qazanmaqdır. [Sözləri və ya ibadətləri riya ilə olan kimsənin din bilgisi varsa, buna **“Münafiq”** deyilir. Din bilgisi yoxdursa, buna **“Din cahili”** deyilir. Fənn bilgisi olmayıb, özünü fənn adamı kimi tanıdıb, öz düşüncələrini fənn bilgisi olaraq söyləyib müsəlmanları aldatmağa, bunların dinlərini, imanlarını pozmağa çalışan İslam düşmənlərinə **“Zındıq”** və ya **“Fənn cahili”** deyilir. Din cahillərinə və fənn cahillərinə aldanmaq olmaz]. Riya, ancaq mülci olan ikrah edildikdə caiz olur. **“İkrah”**, bir kimsəni istəmədiyi şeyi etməyə məcbur etmək deməkdir. Ölümlə və ya bir üzvünü yox etməklə hədələməyə **“Mülci ikrah”** deyilir. [Zalımların, quldurların işgəncə etmələri də mülci ikrah olur.] Bu zaman məcbur edilən işi etmək zərurət olur. Həbs etməklə və döyməklə hədələməyə zəif ikrah deyilir. Zəif ikrah qarşısında qalan kimsənin riya etməsi caiz deyildir. Riyanın ziddi, əksi **“İxlas”**dır. **“İxlas, dünya faydalarını düşünməyib ibadətlərini yalnız Allahu təalanın rizası üçün etməkdir.”** İxlas sahibi ibadət edərkən başqalarına göstərməyi heç düşünməz. Bunun ibadətlərini başqalarının görməsi ixlasına zərər verməz. Hədisi-şərifdə, **“Allahu təalanı görür kimi ibadət et! Sən görmürsənsə də O, səni görür”** buyuruldu.

Başqalarının sevgisinə və mədh etmələrinə qovuşmaq üçün dünya işləri ilə onlara yaxşılıq etmək riya olur. İbadət ilə olan riya bundan daha pisdir. Allahu təalanın rizasını heç düşünmədən edilən riya hamısından daha betərdir. İbadət edərək Allahu təaladan dünya mənfəətlərini istəmək riya olmaz. Yağmur duasına çıxmaq, istixarə etmək belədir. Maaşla imamlıq, xətiblik, müəllimlik etmək, sıxıntıdan, xəstəlikdən və yoxsulluqdan qurtulmaq üçün ayəti-kərimələr

oxumaq da belədir, deyildi. Bunlarda həm ibadət, həm də mənfəət niyyətləri vardır. Ticarət məqsədi ilə həccə getmək də belədir. İbadət niyyəti olmazsa riya olurlar. İbadət niyyəti çox olarsa savab hasil olur. İbadətlərini başqalarına göstərmək onlara öyrətmək və təşviq etmək niyyəti ilə olarsa, yenə riya olmaz və çox savab olar. Ramazan orucunu tutmaqda riya olmaz. Allahu təalanın rizası üçün namaza başlayıb, sonradan hasil olan riyanın zərəri olmaz. Riya ilə yerinə yetirilən fərzlər səhih olur. İbadət borcu ödənmiş olsa da savabı olmaz. Ət ehtiyacını ödəmək niyyəti ilə qurban kəsmək caiz olmaz. Allahu təala üçün və bir insan üçün birlikdə niyyət edərək qurban kəsmək caiz deyildir. Allahu təalanın rizası üçün olmayıb, yalnız həcdən, savaşdan gələn üçün və gələn əmiri, rəisi qarşılamaq üçün kəsilən heyvan leş olur. Kəsilməsi və yeyilməsi haram olur. Riyadan qorxaraq ibadəti tərk etmək caiz deyildir. Allahu təalanın rızası üçün namaza durub, namazı bitirincəyə qədər yalnız dünya işlərini düşünərsə, namazı səhih olur. Şöhrətə səbəb olacaq şəkildə geyinmək də riya olur. Din adamlarının, təmiz, qiymətli paltar geymələri lazımdır. Bunun üçün imamların, Cümə və bayram günləri zinətli paltar geymələri sünnətdir.

Şöhrət üçün moizə vermək, nəsihət etmək, kitab yazmaq da riya olur. **"Moizə"**, əmri-maruf və nehyi-münkər[1] deməkdir. Münaqişə etmək, başqalarından üstün görünmək və təriflənmək üçün elm öyrənmək də riya olur. Dünyalıq əldə etmək, yəni mal, vəzifə əldə etmək üçün elm öyrənmək də riyadır. Riya haramdır. Allahu təala üçün olan elm Allahu təaladan qorxmağı artırır. Öz eyblərini görməyə səbəb olur. Şeytanın aldatmasına mane olur. Elmini dünya qazancına, mala və vəzifəyə qovuşmağa vasitə edən din adamlarına **"uləmai su",** yəni pis din adamları deyilir. Bunların gedəcəyi yer Cəhənnəmdir. Hər kəsin yanında sünnətlərə uyğun olaraq, yalnızkən isə ədəblərə uymayaraq edilən ibadətlər riya olur. On birinci maddənin sonuna baxın!

Edilən ibadətin savabını ölü və ya diri başqasına hədiyyə etmək caizdir. Həcc, namaz, oruc, sədəqə, Qurani-Kərim, mövlid oxu-

[1] Əmri maruf-dində əmr edilən şeyləri öyrətmək, nehyi münkər-günahlardan və pisliklərdən çəkindirmək.

maq, zikr və dua oxuyub, savablarını başqasına hədiyyə etmək hənəfi məzhəbində caizdir. Bu ibadətləri pul qarşılığında, bazarlıq edərək yerinə yetirmək caiz deyildir. Allahu təala üçün Quran oxuyub, verilən hədiyyə qəbul edilir. Maliki və şafi məzhəblərində sədəqə, zəkat və həcc kimi mal ilə edilən ibadətlərin savabını hədiyyə etmək caiz olub, namaz, oruc və Qurani-Kərim oxumaq kimi bədən ilə edilənləri hədiyyə etmək caiz deyildir. Hədisi-şərifdə, **“Qəbristandan keçən kimsə on bir ixlas surəsi oxuyub, savabını qəbirdəkilərə hədiyyə edərsə, meyitlər ədədincə savab verilir”** buyuruldu. Hənəfi olan savabını hədiyyə edər. Maliki və Şafi isə meyyitin əfvi üçün dua edər.

İbadətlərin səhih olması üçün Allahu təalanın rızası üçün etməyə niyyət etmək lazımdır. Niyyət qəlb ilə olur. Yalnız söyləmək ilə niyyət edilmiş olmaz. Qəlb ilə birlikdə olmaq şərti ilə söyləyərək niyyət etmək caiz olur deyildi. Qəlb ilə niyyət, söz ilə niyyətə bənzəməzsə, qəlbdəki niyyətə baxılır. Yalnız and içmək belə deyildir. And içməkdə söz əsasdır. İbadətlərdə niyyətin söz ilə ediləcəyini bildirən heç bir hədisi-şərif və xəbər mövcud deyildir. Dörd məzhəbin İmamları da bildirməmişdir. Niyyət, ibadət etməyi qəlbə gətirmək, xatırlamaq deyildir. Allahu təala üçün etməyi iradə etmək, istəmək deməkdir. Niyyət, ibadətə başlarkən edilir. Daha öncə, məsələn bir gün öncə edilərsə, niyyət olmaz. Buna əməl, arzu, vəd deyilir. Məsələn, hənəfi məzhəbində oruca niyyət etmək zamanı, bir gün əvvəl, günəşin batmasından başlayaraq, ertəsi gün, **“Dahvəyi-kübra”**[1] vaxtına qədərdir.

Başqalarının günaha girməmələri üçün bir kimsənin mübahları tərk etməsi yaxşıdır. Lakin sünnətləri, hətta müstəhəbləri tərk etməsi caiz olmaz. Məsələn, qeybət etməmələri üçün misvaq istifadə etməyi, sarıq sarmağı, başı açıq gəzməyi, uzunqulaq minməyi tərk etmək yaxşı olmaz. Misvaq, misvaq ağacının və ya zeytun, tut ağaclarının budağından kəsilən bir çubuqdur. Bir barmaq qalınlığında, bir qarış uzunluğundadır. Qadınların misvaq yerinə saqqız çeynəmələri də caizdir. Misvaq tapa bilməyən, baş və şəhadət barmaqlarını dişlərinə sürtər. Bişri Hafi küçədə başı açıq gəzərdi.

---

[1] Dahvəyi-kübra- oruc müddətinin yarısı, günortadan bir saat əvvəlki vaxt.

Günah işləyəcək kimsənin bu günahdan əl çəkməsi, Allahu təaladan qorxduğu üçün və ya insanlardan həya etdiyi üçün, yaxud başqalarının bu günahı işləməsinə səbəb olmamaq üçün olur. Allahu təaladan qorxaraq tərk etməyin əlaməti, o günahı gizli olaraq da işləməməkdir. İnsanlardan həya etmək, onların pisləmələrindən qorxmaq deməkdir. Başqalarının günah işləmələrinə səbəb olmaq, yalnız etməkdən daha çox günahdır. Başqalarının bu günahı işləmələrinin günahları da qiyamətə qədər bunlara səbəb olana yazılır. Bir hədisi-şərifdə, **"İnsan günahını dünyada gizlərsə, Allahu təala da qiyamət günü bu günahı qullarından gizlər"** buyuruldu. Hər kəsə vəra sahibi olduğunu göstərmək üçün, günahını gizləmək və gizli olaraq davam etmək riya olur.

İbadətlərini başqalarına göstərməkdən həya etmək caiz deyildir. **"Həya"**, günahlarını, qəbahətlərini göstərməməyə deyilir. Bunun üçün nəsihət verməkdən, əmri-maruf və nehyi-münkər etməkdən [din kitabı, elmihal kitabı yazmaqdan və satmaqdan], imamlıq, müəzzinlik etməkdən, Qurani-Kərim və mövlid oxumaqdan həya etmək caiz deyildir. **"Həya imandandır"** hədisi-şərifində həya pis, günah şeyləri göstərməkdən utanmaq deməkdir. Möminin öncə Allahu təaladan həya etməsi lazımdır. Bunun üçün ibadətlərini sidq ilə, ixlas ilə etməlidir. Buxara alimlərindən birisi sultanın oğullarının küçədə boş, mənasız oyun oynadıqlarını gördü. Əlindəki əsa ilə bunları döydü. Qaçdılar, atalarına şikayət etdilər. Sultan onu çağırıb, "sultana qarşı çıxanın həbs olacağını bilmirsənmi?" dedi. Alim cavab olaraq, "Rəhmana qarşı çıxanın Cəhənnəmə gedəcəyini bilmirsənmi?" dedi. Sultan, "əmri maruf etmək vəzifəsini sənə kim verdi?" dedi. Alim, "səni kim Sultan etdi?" cavabını verdikdə, "məni xəlifə sultan etdi", dedi. "Məni də xəlifənin Rəbbi vəzifələndirdi" dedi. Sultan, "sənə Səmərqənd şəhərində əmri-maruf etmək vəzifəsini verirəm" dedikdə, "mən də özümü bu vəzifədən azad etdim" cavabını verdi. "Bu cavabına təəccüb etdim, əmr olunmadan, izn verilmədən vəzifə yerinə yetirdiyini söylədin. İzn verildikdə də azad olunmağını istəyirsən" dedi. "Sən izn verib, sonra azad edərsən. Rəbbimin verdiyi vəzifədən məni heç kim azad edə bilməz", dedi. Bu sözdən sonra Sultan, "dilə məndən istədiyini verim" dedi. "Gənclik halımı mənə qay-

tar" dedi. "Bu iş əlimdən gəlməz" deyincə, "mənə bir fərman yaz ki, Cəhənnəmdəki mələklərin rəisi olan Malik məni atəşdə yandırmasın" dedi. "Bunu da edə bilmərəm" dedikdə, "mənim elə bir Sultanım var ki, hər şeyimi Ondan istəyirəm. Hər dilədiyimi ehsan etdi. Bunu edə bilmərəm, sözünü heç demədi", dedi. Sultan, "məni duada unutma" deyərək sərbəst buraxdı.

Hədisi-şərifdə, **"Başqalarına göstəriş üçün namazını gözəl qılan, yalnız olduğu zaman belə qılmayan Allahu təalanı təhqir etmiş olur",** və **"Sizdə olmasından ən çox qorxduğum şey, şirki-asqara düşmənizdir. Şirki-asqar, riya deməkdir",** və **"Dünyada riya ilə ibadət edənə qiyamət günü, "ey pis insan! Bu gün sənə savab yoxdur. Dünyada kimlər üçün ibadət etdinsə, savablarını onlardan istə" deyilər"** və **"Allahu təala buyurur ki, mənim şərikim yoxdur. Başqasını mənə şərik edən savablarını ondan istəsin. İbadətlərinizi ixlas ilə edin! Allahu təala ixlas ilə edilən işləri qəbul edər"** buyuruldu. İbadət, Allahu təalanın rızasına qovuşmaq üçün edilir. Başqasının məhəbbətinə, ehsanına qovuşmaq üçün edilən ibadət ona tapınmaq olur. Allahu təalaya ixlas ilə ibadət etməyimiz əmr olundu. Hədisi-şərifdə, **"Allahu təalanın birliyinə iman edəndən və namazı, zəkatı ixlas ilə edəndən Allahu təala razı olur"** buyuruldu. Rəsulullah (sallallahu aleyhi və səlləm) Muaz bin Cəbəli (radıyallahu təala anh), Yəmənə vali olaraq göndərərkən, **"İbadətlərini ixlas ilə et. İxlas ilə edilən az əməl qiyamət günü sənə yetişər",** və **"İbadətlərini ixlas ilə edənlərə müjdələr olsun. Bunlar hidayət ulduzlarıdır. Fitnələrin qaranlıqlarını yox edərlər"** və **"Dünyada haram edilmiş olan şeylər məlundur. Ancaq Allah üçün edilən şeylər qiymətlidir"** buyuruldu. Dünya nemətləri keçicidir. Ömürləri çox qısadır. Bunları ələ keçirmək üçün dinini vermək axmaqlıqdır. İnsanların hamısı acizdir. Allahu təala diləmədikcə kimsə kimsəyə fayda və zərər verə bilməz. İnsana Allahu təala kafidir.

Allahu təaladan qorxmaq, Onun rəhmətindən ümidi kəsməmək lazımdır. Ümid rəca, qorxudan çox olmalıdır. Belə olanın ibadətləri zövqlü olur. Gənclərdə qorxunun, yaşlılarda rəcanın daha çox olması lazımdır, deyildi. Xəstələrdə rəca çox olmalıdır. Qorxusuz rəca və rəcasız qorxu caiz deyildir. Birincisi əmin olmaq, ikincisi ümid-

siz olmaqdır. Hədisi-qüdsidə, **“Qulumu məni zənn etdiyi kimi qarşılaram”** buyuruldu. Zümər surəsinin 53-cü ayəti-kəriməsində məalən, **“Allah bütün günahları əfv edər. O qafurdur, rahimdir”** buyuruldu. Bunlardan rəcanın çox olmasının lazım olduğu anlaşılmaqdadır. **“Allah qorxusundan ağlayan Cəhənnəmə girməz”** və **“Mənim bildiyimi bilsəydiniz, az gülər çox ağlardınız”** Hədisi-şərifləri də qorxunun çox olması lazım gəldiyini göstərməkdədir.

***Kimsəyə etməm şikayət, ağlaram mən halıma,***
***Titrərəm mücrim kimi, baxdıqca istiqbalıma!***

## TULİ ƏMƏL

10 – Qəlb xəstəliklərinin onuncusu **“Tuli əməl”**dir. Tuli əməl, zövq və səfa sürmək üçün çox yaşamağı istəməkdir. İbadət etmək üçün çox yaşamağı istəmək tuli əməl olmaz. Tuli əməl sahibləri ibadətləri vaxtında etməzlər. Tövbə etməyi tərk edərlər. Qəlbləri qatı olur. Ölümü xatırlamazlar. Söhbət və nəsihətdən ibrət almazlar. Hədisi-şərifdə, **“Ləzzətlərə son verən şeyi çox xatırlayın”** buyuruldu. Hədisi-şərifdə, **“Ölümdən sonra olacaq şeyləri bildiyiniz kimi heyvanlar da bilsəydilər, yemək üçün kök, yağlı heyvan tapa bilməzdiniz”** və **“Gecə və gündüz ölümü xatırlayan şəxs qiyamət günü şəhidlər yanında olacaqdır”** buyuruldu. Tuli əməl sahibi daim dünya malına və vəzifəsinə qovuşmaq üçün ömrünü sərf edər, axirəti unudar, yalnız zövq və səfasını düşünər. Ailəsinin bir illik qidasını hazırlamaq uzun əməl olmaz. Bir illik nəfəqəyə **“Havayıci aslıyyə”** deyilir. Lazımlı əşyadan sayılır. Nisab hesabına qatılmaz. Buna malik olan zəngin sayılmaz. Buna malik olmayan subay şəxsin qırx günlük qida maddəsi saxlaması caizdir. Daha artıq saxlamaları təvəkkülü pozar. Hədisi-şərifdə, **“İnsanların ən yaxşısı ömrü uzun və əməli gözəl olan kimsədir”**, və **“İnsanların ən pisi ömrü uzun, əməli pis olandır”, “Ölmək istəməyin. Qəbr əzabı çox acıdır. Ömrü uzun olub İslamiyyətə tabe olmaq böyük səadətdir”** və **“Müsəlmanlıqda ağaran tüklər qiyamət günü nur olacaqdır”** buyuruldu.

Tuli əməlin səbəbləri dünya zövqlərinə düşkün olmaq və ölümü unutmaq, səhhətinə, gəncliyinə aldanmaqdır. Tuli əməl xəstəliyindən qurtulmaq üçün bu səbəbləri yox etmək lazımdır. Ölümün hər an gələcəyini düşünmək, səhhətin, gəncliyin ölümə mane olmadıqlarını unutmamaq lazımdır. Uşaqlardakı və gənclərdəki ölüm sayısının yaşlılardakı ölüm sayısından çox olduğunu statistika göstərir. Çox xəstələrin yaxşı olub yaşadıqları, çox sağlam insanın tez öldükləri hər zaman görülmüşdür. Tuli əməl sahibi olmağın zərərlərini və ölümü xatırlamağın faydalarını öyrənmək lazımdır. Hədisi-şərifdə, **"Ölümü çox xatırlayın. Onu xatırlamaq insanı günah işləməkdən qoruyar və axirətə zərərli olan şeylərdən çəkindirməyə səbəb olar"** buyuruldu. Əshabi-kiramdan Bəra ibn Azib (radıyallahu təala anh) deyir ki, bir cənazəni götürdük. Rəsulullah (sallallahu aleyhi və səlləm), qəbr başında oturdu. Ağlamağa başladı. Mübarək göz yaşları torpağa damladı. Sonra, **"Ey qardaşlarım! Hamınız buna hazırlaşın"** buyurdu. Ömər ibn Abdüləziz (rahimə-hullahü təala), bir alimi gördükdə nəsihət istədi. O da, indi xəlifəsən, istədiyin kimi əmr verirsən. Bir gün öləcəksən, dedi. Bir az daha söylə, dedikdə, Adəm aleyhissəlama qədər bütün ataların ölümü daddı. İndi sıra sənə gəldi, dedi. Xəlifə uzun zaman ağladı. Hədisi-şərifdə, **"İnsanlara nəsihət olaraq ölüm yetişər. Zənginlik istəyənə qəza və qədərə iman etmək yetişər"** buyurdu və **"İnsanların ən ağıllısı ölümü çox xatırlayandır. Ölümü çox xatırlayan insana, dünyada şərəf, axirətdə yüksək dərəcələr nəsib olar"**, və **"Allahu təaladan həya edin. Başqalarına qalacaq olan şeyləri toplamaqla vaxtınızı itirməyin. Qovuşa bilməyəcəyiniz şeyləri ələ keçirmək üçün çalışmayın. Ehtiyacınızdan artıq binalar tikməklə həyatınızı sərf etməyin"**, və **"Evlərinizi haram mallarla tikməyin. Dininizin və dünyanızın xarab olmasına səbəb olar"** və çox sevdiyi Üsamə ibn Zeydin (radıyallahu təala anhüma) bir ay sonra ödəmək üzrə yüz qızıla bir kölə satın aldığını eşitdikdə, **"Siz buna heyrət etmədinizmi? Üsamə tuli əməl sahibi olmuşdur"** buyurdu. Ehtiyac maddələrinin nisyə də alınması caizdir. Bir hədisi-şərifdə, **"Cənnətə getmək istəyən uzun əməl sahibi olmasın. Dünya işləri ilə məşğul olması ölümü unutdurmasın. Haram işləməkdə Allahdan həya etsin"** buyurdu. Ha-

ram olan ləzzətlərin içində yaşamaq üçün uzun əməl sahibi olmaq haramdır. Mübahlarla ləzzətlənmək üçün tuli əməl sahibi olmaq haram olmasa da yaxşı deyildir. Çox yaşamağı deyil, səhhətli və sağlam yaşamağı istəmək lazımdır.

## TAMA

11 – Qəlb xəstəliklərinin on birincisi **"Tama"**dır. Dünya ləzzətlərini haram yollardan axtarmağa **"Tama"** deyilir. Tamanın ən pisi insanlardan ummaqdır. Kibrə, ucba səbəb olan **"Nafilə"** ibadətləri və axirəti unutduran **"Mübah"**ları etmək də Tama olur. Tamanın ziddinə, əksinə **"Təfviz"** deyilir. Təfviz, halal və faydalı şeyləri qazanmağa çalışıb, bunlara qovuşmağı Allahu təaladan gözləməkdir.

Şeytan riyanı ixlas olaraq və tamanı təfviz olaraq göstərərək insanı aldatmağa çalışır. Allahu təala hər kəsin qəlbinə bir mələk vəzifələndirmişdir. Bu mələk insana yaxşı düşüncələr **"ilham"** edər. Şeytan da insanın qəlbinə pis düşüncələr, **"vəsvəsə"**lər gətirər. Halal yeyən insan ilham ilə vəsvəsəni bir-birindən ayırır. Haram yeyənlər ayıra bilməz. İnsanın nəfsi də qəlbinə pis düşüncələr gətirir. Bu düşüncələrə və arzulara **"Həva"** deyilir. İlham və vəsvəsə davamlı olmaz. Nəfsin həvası isə davamlıdır və getdikcə artar. Vəsvəsə dua edərək, zikr edərək azalır və yox olur. Həva isə ancaq qüvvətli **"mücahədə"** ilə azalır, yox olur. Şeytan köpək kimidir. Köpək qovaladıqda qaçsa da başqa tərəfdən yenə gələr. Nəfs pələng kimidir. Hücum etməsi ancaq öldürməklə bitər. İnsanlara vəsvəsə verən şeytana bunun üçün **"Xannas"** deyilmişdir. İnsan şeytanın bir vəsvəsəsinə uymazsa bundan əl çəkər. Başqa vəsvəsəyə başlayar. Nəfsi əmmarə daim zərərli şeylər istəyər. Şeytan isə çox xeyirli işə mane olmaq üçün az xeyirli olan şeyi də vəsvəsə edər. Böyük günaha sürükləmək üçün kiçik xeyirli əməl etməyi də vəsvəsə edər. Şeytanın vəsvəsəsi olan xeyirli iş insana şirin gələr və dərhal etmək istəyər. Bunun üçün hədisi-şərifdə, **"Tələsmək şeytandandır. Beş şey bundan müstəsnadır: Qızını evləndirmək, borcunu ödəmək, cənazə xidmətlərini tez görmək, qonağı doyuzdurmaq, günah etdikdə dərhal tövbə**

**etmək"** buyuruldu. **"Əşiat-ül-ləməat"**da, namazı gecikdirməmək mövzusundakı hədisi-şərifdə, **"Ya Əli! Üç şeyi gecikdirmə! Namazı əvvəl vaxtında qıl! Hazırlanmış cənazə namazını dərhal qıl! Dul və ya qızı küfüvü** (tayı) **istədikdə dərhal ver!"** Yəni, namazını qılan, günah işləməyən və nəfəqəsini halaldan qazanan birini tapdıqda dərhal ona ver, buyuruldu. İlham olunan xeyir Allahu təalanın qorxusu ilə yavaş-yavaş edilir və sonu düşünülür. Bir hədisdə, **"Mələkdən gələn ilham İslamiyyətə uyğun olur. Şeytandan gələn vəsvəsə İslamiyyətdən ayrılmağa səbəb olur"** buyuruldu. İnsan ilham olunan şeyləri etməlidir. Vəsvəsəni etməmək üçün cihad etməli, çalışmalıdır. Nəfsə tabe olan vəsvəsələrə tabe olur. Nəfsin həvasına tabe olmayanın ilhama tabe olması asan olur. Bir hədisi-şərifdə, **"Şeytan qəlbə vəsvəsə verər. Allahın adı zikr edildikdə, söyləndikdə qaçar. Söylənməzsə vəsvəsələrinə davam edər"** buyuruldu. [Zikr etmək lazım olduğu bu hədisi-şərifdən də aydın olur.] Qəlbə gələn xatirənin cinsini anlamaq üçün İslamiyyətə uyğun olub olmadığına baxılır. Belə aydın olmazsa saleh olan bir alimdən soruşulur. Saleh olmayan, dini dünya qazanclarına alət edən pis din adamından soruşmaq olmaz. Yaxud, Rəsulullaha (sallallahu aleyhi və səlləm) qədər ustadlarının hamısı məlum olan həqiqi bir rəhbərdən soruşulur. **"Qütbi mədar"** deyilən Övliya az olsa da qiyamətə qədər mövcuddur. **"Qütbi irşad"** deyilən Əhli sünnət alimi hər zaman və hər yerdə tapılmaz. Uzun zaman aralıqları ilə və nadir olaraq tapılır. Hər yerdə çox görülən cahil təriqətçiləri və yalançı şeyxləri həqiqi rəhbər sanmaq olmaz. Belələrin tələlərinə düşərək dünyada və axirətdə səadətdən məhrum qalmamaq üçün çox ayıq olmaq lazımdır. Qəlbə gələn xatirə nəfsə acı gələrsə xeyir olduğu aydın olur. Şirin gələr, dərhal etmək istərsə, şər olduğu aydın olur.

Şeytanın hiylələri çoxdur. Bunlardan onu mühümdür: Birincisi, Allahu təalanın sənin ibadətinə ehtiyacı yoxdur, deyər. Buna qarşı Bəqərə surəsi, 62-ci ayətinin **"Əməli salehin faydası bunu edənədir"** məali-şərifini xatırlamaq lazımdır.

Şeytanın ikinci hiyləsi, Allahu təala rəhimdir, kərimdir, səni də əfv edər, Cənnətə qoyar, deməsidir. Buna qarşı Loğman surəsi, 33-cü ayətinin **"Allahın kərim olması sizi aldatmasın"** və Məryəm

surəsi, 63-cü ayətinin, **“Cənnətə qullarımızdan müttəqi olanları varis qılarıq”** məali şəriflərini xatırlamaq lazımdır.

Üçüncü hiyləsi, sənin ibadətlərin həmişə qüsurludur. Riya qarışıqdır. Belə ibadətlərlə müttəqi ola bilməzsən. Allahu təala, Maidə surəsində, **“Allah, yalnız müttəqilərin ibadətlərini qəbul edər”** buyurur. Sənin ibadətlərin qəbul olmaz. Boş yerə çalışırsan. Boş yerə çomaq yeyən heyvan kimi əziyyət çəkirsən, deyər. Bunun qarşılığında, mən, Allahu təalanın əzabından qurtulmaq və əmrinə tabe olmaq üçün ibadət edirəm. Mənim vəzifəm əmri yerinə yetirməkdir. Qəbul olub olmayacağı Onun biləcəyi şeydir. Şərtlərinə uyğun olan və fərzləri yerinə yetirilən ibadətin səhih olması mütləqdir, demək lazımdır. Fərzləri tərk etmək böyük günahdır. Bu günahlardan qurtulmaq üçün ibadətləri yerinə yetirmək lazımdır. İbadət etmədən Cənnətə girmək üçün dua etmək günahdır. Hədisi-şərifdə, **“Ağlı olan nəfsinə tabe olmaz və ibadət edər. Axmaq olan nəfsinə uyar, sonra Allahın rəhmətini gözləyər”** buyuruldu. Axirət üçün lazım olan şeyləri bu fani dünyada hazırlamaq lazımdır.

Şeytanın hiylələrindən dördüncüsü, indi dünyanı qazanmaq üçün çalış, rahatlığa qovuş, o zaman rahat-rahat, hüzur içində ibadət edərsən, deyərək ibadət etməyə mane olur. Buna cavab olaraq, əcəl mənim əlimdə deyildir. Hər kəsin ömrünü Allahu təala əzəldə təqdir etmişdir. Bəlkə tezliklə öləcəm. İbadət vəzifələrini vaxtında etməliyəm, demək lazımdır. Hədisi-şərifdə, **“Haləkəlmüsəvvifün”** buyuruldu ki, bu günki vəzifələrini sabaha saxlayanlar zərər etdilər, deməkdir.

Şeytanın hiylələrindən beşincisi, ibadətləri tərk etdirə bilmədiyi zaman, tez qıl, vaxtını qaçırma, deyərək şərtlərini, fərzlərini tam yerinə yetirtməmək istəyər. Bunun qarşılığı olaraq, fərzlər çox azdır. Bunları yavaş-yavaş və şərtlərinə uyğun olaraq etmək lazımdır. Fərz olmayanları da şərtlərinə uyğun olaraq az etmək, şərtləri nöqsan olaraq çox etməkdən yaxşıdır, demək lazımdır.

Altıncı hiylə olaraq riyanı tövsiyə edər. Hər kəs görsün, bəyənsin, deyər. Buna cavab olaraq, özünə fayda və zərər vermək kimsənin əlində deyildir. Başqalarına isə heç verə bilməzlər. Belə olan kimsələrdən bir şey gözləmək əbəs olur, batil olur. Fayda və zərər

verən ancaq Allahu təaladır. Yalnız onun görməsi mənə kifayətdir, demək lazımdır.

Yeddinci hiylə olaraq, ibadətlərə mane ola bilmədiyini anladıqda, insana ucb, yəni ibadətlərini bəyənmək vəsvəsəsi verir. Sənin kimi ağıllı, ayıq kimsə varmı? Bu zamanda hər kəs qəflət yuxusunda ikən, sən ibadət edirsən, deyər. Bunun qarşılığında, bu ağıl və ayıqlıq məndən deyildir. Rəbbimin ehsanıdır. Onun ehsanı olmasa, ibadət edə bilmərəm, demək lazımdır.

Səkkizinci hiylə olaraq, ibadətlərini gizli et. Allahu təala sənin sevgini və şərəfini insanların qəlbinə yerləşdirər, deyərək gizli riyaya yol açmaq istəyər. Bunun qarşılığında, mən Allahu təalanın quluyam. O, mənim sahibimdir. İbadətimi istərsə bəyənər, istərsə rədd edər. İnsanlara bildirib bildirməməsinə qarışa bilmərəm, demək lazımdır.

Doqquzuncu hiylə olaraq da, ibadət etməyə nə gərək var? İnsanların said (cənnətlik) və şaki (cəhənnəmlik) olacaqları əzəldə təqdir edilmişdir. Said olan ibadəti tərk etdikdə əfv edilir, Cənnətə gedər. Əzəldə şaki olan, nə qədər ibadət edərsə etsin faydası olmaz, mütləq Cəhənnəmə gedər. O halda, özünü boş yerə yorma! Rahatlığına bax, deyər. Buna cavab olaraq, mən qulam, qulun vəzifəsi sahibinin əmrini etməkdir, demək lazımdır. Buna qarşı, “Əmri etmədikdə əzab qorxusu olarsa, əmri etmək lazım olur. Əzəldə said olan üçün bu qorxu yoxdur”, desə, buna cavab olaraq da Rəbbim hər şeyi bilir və dilədiyini edər. Dilədiyinə xeyir, dilədiyinə şər verər. Kimsə də Ona sual vermək haqqı yoxdur, demək lazımdır. İblis, İsa aleyhissəlama görünərək, “Əzəldə Allahu təalanın təqdir etdikləri hasil olur” deyirsən elədirmi? dedi. Bəli, elədir buyurdu. Elə isə özünü bu dağın təpəsindən aşağı at. Əgər əzəldə salamatlığın təqdir edilmişdirsə, sənə bir şey olmaz, dedi. Cavabında, ey məlun! Allahu təala qullarını imtahan edər. Qulun, sahibini imtahan etməyə haqqı yoxdur, buyurdu. Şeytanın bu hiyləsinə qarşı, “İbadət etmək faydalıdır. Çünki, əzəldə said isəm savabların artması, dərəcələrin yüksəlməsi üçün ibadətləri etmək lazımdır. Şaki isəm, ibadət etməmək əzabından qurtulmaq üçün, ibadət edəcəyəm” demək lazımdır. İbadət etməyin mənə heç bir zərəri də olmaz. Çünki, Allahu təala hakimdir. İbadət edənlərə

əzab etməsi Onun hikmətinə yaraşmaz. İbadəti tərk etməyin, əzəldə said olana zərəri olmasa belə, faydası da yoxdur. Belə olduqda, tərk etməyi necə seçə bilərəm? Ağlı olan kimsə faydalı olanı edər. Faydasız olanı tərk edər. Əzəldə şaki isəm, asi olaraq Cəhənnəmə girməkdənsə, Rəbbimə itaət etmiş olaraq Cəhənnəmə girməyi, seçərəm. Bundan başqa, Allahu təala ibadət edənləri Cənnətə qoyacağını, ibadət etməyənlərə Cəhənnəmdə əzab edəcəyini vəd etmişdir. Allahu təala vədində sadiqdir. Vədindən dönməyəcəyi söz birliyi ilə bildirilmişdir.

Allahu təala hər şeyi səbəb ilə yaradır. Adəti ilahiyyəsi belədir. Ancaq möcüzə və kəramət olaraq adətini pozmaqdadır. İbadətləri Cənnətə girmək üçün səbəb etdiyini bildirir. Yəni, Cənnət nemətlərini ibadətlərə qarşılıq olaraq yaratmışdır. Hədisi-şərifdə, **“Heç kimsə Cənnətə ibadəti səbəbi ilə girməz”** buyuruldu. Qarşılıq başqadır, səbəb olmaq başqadır.

Şeytan hiylələrinin onuncusu olaraq, ibadət etmək əzəldə təqdir edilmişdirsə, mümkün olur. Allahu təalanın təqdiri dəyişməz. İbadət etməkdə və tərk etməkdə insanlar məcburdur, deyər. Şeytanın bu sözü əvvəlkinin eynidir. Əzəldə said olanlara ibadət etmək nəsib olur. Şaki olanların da tərk etmələri lazım olur. Şeytanın bu hiyləsinə qarşı, hər şeyi və insanların yaxşı, pis hər işini Allahu təala yaradırsa da, insanlara və heyvanlara **“iradəyi-cüziyyə”** vermişdir. İradəyi-cüziyyə insandan meydana gəlir. Lakin insan bunu yaratdı deyilə bilməz. Çünki iradə xaricdə mövcud bir şey deyildir. İnsanın qəlbində hasil olur. Xaricdə mövcud olan şeyin meydana gəlməsinə **“Xəlq etmək”,** yaratmaq deyilir. Allahu təalanın **“İradəyi-külliyə”**si isə xaricdə vücudu var olan bir qüvvədir. Allahu təala insanın ixtiyari hərəkətini yaratmaq üçün insanın iradəsini səbəb qılmışdır. Bu şərt olmasa da yaradar. Lakin bu şərt ilə, bu səbəb ilə yaratması adətidir. Peyğəmbərlərində (aleyhimüssaləvatü vəttəslimat) və Övliyasında (qaddəsallahu təala əsrarəhümül aziz) bu adətini pozaraq səbəbsiz də yaratdığı çox görülmüşdür. Buna **“Kəramət”** deyilir.

İnsanların işləri yalnız iradəyi-cüziyyə ilə meydana gəlməz. Yəni, insanın hər istədiyi vücuda gəlməz. Yalnız Allahu təalanın iradəsi ilə də yaratmaq adəti deyildir. Bunun üçün insanlar işlərində

məcbur deyildirlər. İnsan iradə edər. Hərəkət etməsini istər, qüdrətini sərf edər, Allahu təala da iradə edərsə, iş meydana gələr. Şeytan, "İnsan, Allahu təala istərsə ibadət edər, istəməzsə etməz. O halda insan, işləri edib etməməkdə məcbur olunmaqdadır. İnsan çalışsa da, çalışmasa da əzəldəki qəza və qədər hasil olacaqdır" deyərək aldatmaqdadır. İnsanın işləri əzəldəki təqdir ilə meydana gəlsə də, meydana gəlmələri üçün öncə qul iradəyi-cüziyyəsini işlədir. İşin edilməsini və ya edilməməsini istəyir. İnsanın işlərini Allahu təalanın əzəldə təqdir etməsi demək, insanın nələri iradə edəcəyini bilməsi və diləməsi deməkdir. Bunları Levhül mahfuzda yazmışdır. Belə olduğu üçün qulun məcbur olması lazım gəlmir. Böyük İslam alimi seyid Abdülhakim əfəndi, "Əzəldəki qəza və qədər, Allahu təalanın qullarının nələri etmək istədiyini əzəldə bilməsidir. Nələri etməsini əzəldə əmr etməsi deyildir" buyurdu. Yəni, qəza və qədər, əmri-əzəli deyildir, elmi-əzəlidir. Yəni, bir cəbri mütəhakkim deyil, elmi mütəqaddimdir. Bir kimsə, birisinin bir gündə edəcəyi şeyləri bilsə, bunları etməsini iradə etsə və hamısını bir kağıza yazsa, bunları edəcək olan kimsə, o kimsənin məcburiyyəti olmaz. "Edəcəklərimi bilirdin, edilməsini istədin və kağıza yazdın. O halda, bunları sən etdin" də deyə bilməz. Çünki, bunları öz iradəsi ilə və özü etmişdir. O, kimsənin bildiyi, dilədiyi və yazdığı üçün etməmişdir. Allahu təalanın əzəldə bilməsi, diləməsi və levhül mahfuza yazması da insanları məcbur etmək deyil. Allahu təala əzəldə dilədiyi üçün levhül mahfuza yazmışdır. Qulun edəcəyini bildiyi üçün edilməsini iradə etmişdir. Allahu təalanın əzəldəki bilgisi qulun öz iradəsi ilə edəcəyi işə bağlıdır. Qulun işi də Allahu təalanın bu elmi, iradəsi ilə və yaratması ilə meydana gəlir. Qul iradəsini işlətməzsə, Allahu təala qulun iradəsini işlətməyəcəyini əzəldə bilər və bildiyi üçün iradə etməz və yaratmaz. Deməli, elm məluma tabedir. İnsanların iradəsi olmasaydı, insanların işləri yalnız Allahu təalanın iradəsi ilə yaradılsaydı, insanlar məcburdur deyilərdi. Əhli sünnət məzhəbinə görə, insanların işləri insanın qüdrəti ilə Allahu təalanın qüdrətinin birlikdə təsiri ilə meydana gəlir.

[İnsanın qəlbi, yəni, könlü maddə deyildir. Elektrik və maqnit dalğaları kimidir. Yer tutmaz. Lakin sinəmizin sol tərəfində olan,

ürək dediyimiz ət parçasında qüvvəti, təsirləri hasil olur. Ağıl, nəfs və ruh da qəlb kimi bir varlıqdırlar. Bu üçünün də qəlb ilə bağlantısı, əlaqəsi vardır. İnsanın gözü, qulağı, burnu, ağzı və cildi ilə hiss etdiyi rəng, səs, qoxu, zövq [dad] və istilik, sərtlik kimi şeylər duyğu sinirləri ilə beyninə gəlir. Beyin də bunları dərhal qəlbə bildirir. Ağlın, nəfsin, ruhun və şeytanın arzuları, istəkləri də qəlbə gəlir. Qəlb nə edəcəyinə qərar verir, iradə edir, seçir. Bu şeyləri ya rədd edər, yox edər. Yaxud beyinə bildirər. Beyin də bunları hərəkət sinirləri ilə üzvlərə, orqanlara bildirir. Orqanlar da Allahu təala istərsə və qüvvət verərsə, hərəkət edərək qəlbin iradə və ixtiyar etdiyi şey edilir.]

***Pis əxlaqdan səfər etsə insan,***
***hüsnü əxlaq şəhərinə girsə insan!***
***Zikri Haqdan bir nəfəs uzaq olmasa,***
***zatı Haqqı heç unutmuş olmasa.***
***Nəfsi asi, aqibət muti olur,***
***ruhi mömin Sidrədən eylər ubur.***
***Küfrü inkardan keçib nəfsi dəni,***
***burda olur, xalisiyyət mədəni.***

## KİBR

12 – Qəlb xəstəliklərinin on ikincisi **“Kibr”**dir. Kibr, özünü başqasından üstün görməkdir. Özünü ondan üstün görməklə qəlbi rahat olar. **“Ucb”** da özünü ondan üstün bilməkdir. Burada başqasını düşünməz. Özünü və ibadətlərini bəyənir. Kibr pis xüsusiyyətdir. Haramdır. Xaliqini, Rəbbini unutmağın əlamətidir. Çox din adamı bu pis xəstəliyə tutulmuşdur. Hədisi-şərifdə, **“Qəlbində zərrə qədər kibr olan kimsə Cənnətə girməz”** buyuruldu. Kibrin əksinə **“Təvazö”** deyilir. Təvazö özünü başqaları ilə bir görməkdir. Başqalarından daha üstün və daha aşağı görməməkdir. Təvazö, insan üçün çox yaxşı bir əxlaqdır. Hədisi-şərifdə, **“Təvazö edənə müjdələr olsun”** buyuruldu. Təvazö sahibi özünü başqalarından aşağı görməz. Zəlil və miskin olmaz. Malını halaldan qazanıb çox hədiyyə verər.

Alimlərlə və fənn adamları ilə tanış olar. Kasıblara mərhəmət edər. Hədisi-şərifdə, **“Təvazö edən, halal qazanan, əxlaqı gözəl olan, hər kəsə qarşı yumşaq olan və kimsəyə pislik etməyən çox yaxşı bir insandır”** və **“Allah üçün təvazö edəni Allahu təala yüksəldər”** buyuruldu. Təkəbbür edənə, yəni kibr sahibi olana qarşı təkəbbür etmək caizdir. Allahu təala qullarına qarşı mütəkəbbirdir. Allahu təala kibriya sahibidir. Kibr sahibinə təkəbbür etmək sədəqə vermək kimi savabdır. Kibr sahibinə qarşı təvazö edən kimsə özünə zülm etmiş olur. Bidət sahiblərinə və zənginlərə qarşı da təkəbbür etmək caizdir. Bu təkəbbür özünü yüksək göstərmək üçün deyildir. Onlara dərs vermək, qəflətdən oyandırmaq üçündür. Hərbdə düşmənə qarşı təkəbbür etmək savabdır. Bu təkəbbürə **“Huyəla”** deyilir. Sədəqə verərkən nəşə və sevinc ilə qarışıq təkəbbür etmək lazımdır. Sədəqə verənin təkəbbür etməsi kasıba qarşı deyildir. Verdiyi malı alçaltmaqdır. Mala qiymət vermədiyini göstərir. Hədisi-şərifdə, **“Verən əl alandan yüksəkdir”** buyuruldu. Riya edən və göstəriş edənlərə qarşı da təkəbbür etmək caizdir. Özündən aşağı olanlara qarşı təvazö göstərmək yaxşıdırsa da bunun ifrata qaçmaması, yəni həddən artıq olmaması lazımdır. Artıq olan təvazöya **“Təməllük”** deyilir. Təməllük, ancaq ustada və alimə qarşı caizdir. Başqalarına qarşı caiz deyildir. Hədisi-şərifdə, **“Təməllük, müsəlman əxlaqından deyildir”** buyuruldu. Şer:

***Müəllim ilə təbibə***
***təməllük etmək lazımdır.***
***Biri batin, biri zahir,***
***Tədavisinə hadimdir.***

Kibr çeşidlərinin ən pisi Allahu təalaya qarşı kibrli olmaqdır. Nemrud belə idi. Tanrı olduğunu elan etdi. Allahu təalanın nəsihət vermək üçün göndərdiyi Peyğəmbəri (aleyhissalatü vəssəlam) atəşə atdı. Firon da belə axmaqlardan biri idi. Misirdə ilahiliyini elan etdi. Mən sizin güclü tanrınızam, dedi. Allahu təala nəsihət vermək üçün Musa aleyhissəlamı göndərdi. Buna inanmadı. Allahu təala onu Süveyş dənizində boğdu. Bunlar kimi, bu dünyanın yaradıcısına inanmayanlara **“Dehri”,** ateist deyilir. [Hər əsrdə

belə axmaqlar gəlmişdir. Mao kimi, Stalin kimi zalımlar milyonlarla insanı öldürərək, işgəncə edərək və din, İslam adamlarını və kitablarını yox edərək, millətlərini susdurmuş, qorxutmuşdurlar. Hər istədiklərini zorla etdirərək azğınlaşmışdırlar. İlaha, məbuda məxsus üstünlüklərə malik olduqlarını sanmış və söyləmişdirlər. İslam kitablarının yurdlarına daxil olmasını, oxunmasını qadağan etmiş, dindən, Allahu təaladan bəhs edənləri öldürmüşdürlər. Allahu təalanın məhv etməsindən, qəzəbindən qurtula bilməyib yox olmuşdurlar. Tarixdə keçən bütün zalımlar kimi lənət və nifrət ilə anılmışdırlar. Qiyam və hiylə yolu ilə bəzi ərəb məmləkətlərinin başına keçən, zəhərli təbliğatlarla beyinləri doldurmuş zalımlar, diktatorlar da, o ateistləri təqlid edir, İslam düşmənliyi edirlər. Tarix kitablarında oxuduqları zalımların faciəvi aqibətlərindən ibrət almırlar. Dünyada, axirətdə başlarına gələcək olan əzabları, fəlakətləri heç düşünmürlər.]

Rəsulullaha (sallallahu aleyhi və səlləm) qarşı da təkəbbür edənlər çox eşidildi. Allahın göndərdiyi Peyğəmbər (aleyhissalatü vəssəlam) budurmu? dedilər. Bu Quran Məkkə şəhərinin öndə gedənlərinə endirilsəydi yaxşı olardı, dedilər. Tarix boyunca İslamın böyüklərinə qarşı da belə təkəbbür edənlər, istehza edənlər heç əskik olmadı. Bu təkəbbürlər aciz, zəif, əlindən bir şey gəlməyən, hətta özündən və bədəninin quruluşundan xəbəri olmayan qulun öz məlikinə, sahibinə, qüvvəti, gücü sonsuz olan Rəbbinə qarşı bir savaş idi. Vaxtilə iblis də belə təkəbbür etdi. Mələklərə, Adəm aleyhissəlama qarşı səcdə etmələri əmr olunduqda, torpağa qarşı niyə səcdə edim? Mən ondan daha üstünəm. Məni atəşdən, onu palçıqdan yaratdın, deyərək Rəbbinə qarşı çıxdı. Atəşin alovunu, lətifliyini və işıq yaydığını gördükdə, onu sudan və torpaqdan üstün sandı. Halbuki üstünlük, özünü üstün görməkdə deyil, təvazö göstərməkdədir. Cənnətdə torpaq vardır və müşk kimi ətri olacaqdır. Cənnətdə atəş yoxdur. Atəş, Cəhənnəmdə əzab vasitəsidir. Atəş, xarab etməyə, torpaq, bina tikməyə yarayar. Məxluqlar torpaq üstündə yaşayır. Xəzinələr, dəfinələr torpaqda olur. Kəbə də torpaqdan tikilmişdir. Atəşin işığı gecələrə son verir, gündüzü gətirirsə də, torpaqdan çiçəklər, meyvələr hasil olur. Kainatın, varlıqların ən üstünü olan Muhamməd aleyhissəlamın yeri torpaqdır.

Hədisi-şəriflərdə, **“Allahu təala buyurur ki, kibriya, üstünlük və əzəmət mənə məxsusdur. Bu ikisində mənə ortaq olanı Cəhənnəmə ataram, heç acımaram”** və **“Qəlbində zərrə qədər kibr olan Cənnətə girməyəcəkdir”** buyurduqda, gözəl paltar və təmiz nalın[1] geyməyi sevən kimsə belədirmi? soruşuldu. Cavabında, **“Allahu təala cəmildir. Cəmal sahiblərini sevər”** buyurdu. [Çirkin, iyrənc olmamaq üçün, çirkinliklə məşhur olmamaq üçün edilən təmizliyə, gözəlliyə, cəmal sahibi olmaq deyilir. Ehtiyac əşyasını xoş və sevimli görünəcək şəkildə istifadə etmək cəmal sayılır. Bəzənmək, gözəl görünərək, başqasından üstün olmaq üçün bədənində, paltarında, əşyasında edilən dəyişikliklərə zinət deyilir və bədənini, səhhətini, şərəfini, dəyərini qorumaq üçün ehtiyac olunandan artıq şeylərdir. Kişilərin hər yerdə, qadınların isə yad kişilərin yanında, zinət əşyası istifadə etməsi caiz deyildir.] Allahu təalanın hər işi gözəldir. Əxlaqı gözəl olanları sevər. Bu hədisi-şərif kibr sahiblərinin, digər günah işləyənlər kimi əzabsız birbaşa Cənnətə girə bilməyəcəklərini bildirir. Cənnətə girməyənlərin gedəcəkləri yer Cəhənnəmdir. Çünki axirətdə bu ikisindən başqa gedəcək yer yoxdur. Zərrə qədər imanı olan Cəhənnəmdə sonsuz qalmayacaq, Cənnətə gedəcəkdir. Böyük günah işləyib tövbə etməyən, şəfaətə, əfvə qovuşmayan mömin Cəhənnəmdə günahlarının qarşılığı olan əzabları çəkdikdən sonra çıxarılacaq, Cənnətə qoyulacaqdır. Cənnətə girən Cənnətdən heç çıxmayacaqdır. Hədisi-şərifdə, **“Kibri, xəyanəti və qul borcu olmayan mömin, hesabsız Cənnətə girəcəkdir”** və **“Qul haqqı möminin eybi, qüsurudur”** buyuruldu. Nəfəqə üçün borc almaq və malı olduqda dərhal ödəmək lazımdır. Yuxarıdakı hədisi-şərifdə ehtiyac olmadan alınan və malı olduqda ödənməyən, haram yollarla alınan borc, zövcəsinə olan mehr borcu, din bilgisi öyrətmək borcu bildirilir. Rəsulullah (sallallahu təala aleyhi və səlləm) vəfat edəcəyi zaman, **“Ya Əli! Filan yəhudiyə borcum var. Onu ödə!”** buyurdu. Yəhudidən borc arpa almışdı. Ödənməsi üçün vəsiyyət etdi. Yəhudi alimlərinin böyüklərindən olduğu halda Rəsulullah ilə (sallallahu aleyhi və səlləm) bir kərə danışmaqla, haqq Peyğəmbər olduğunu

---

[1] Nalın-altı dəri, üstü açıq və xaltalı olan ayaqqabı.

anlayaraq imana gələn Abdüllah bin Səlam (radıyallahu təala anh), belində odun daşıyırdı. Bunu görənlər, o qədər çox malın, pulun var ikən, nə üçün bu zəhməti çəkirsən, dedikləri zaman, nəfsimi kibrdən qurtarmaq üçün, dedi. Zənginin hambalın zəhmət haqqını verməmək üçün malını özü daşıması, təzəllüldür (təvazönün ifrat dərəcəsi), bayağılıqdır. Sünnətə riayət etmək və nəfsini qırmaq üçün daşıması yaxşıdır və savabdır. Hədisi-şərifdə, **"Allahu təala qiyamət günü üç kimsə ilə danışmayacaq, hamısına çox acı əzab edəcəkdir: Zina edən yaşlı, yalan söyləyən hökumət rəisi və kibrli olan kasıb"** buyuruldu. Ömər (radıyallahu anh) Şama gəldikdə, Əbu Ubeydə bin Cərrah (radıyallahu təala anh) əmrində olanlarla birlikdə onu qarşıladı. Xəlifə dəvəsindən endi, yerinə köləsini mindirdi. Çünki dəvəyə köləsiylə növbə ilə minirdilər. O an dəvəyə minmək növbəsi köləyə çatmışdı. Özü cilovu tutdu, su kənarından keçərkən məstlərini çıxardı, ayaqlarını suya saldı. Şam ordusunun sərkərdəsi olan Əbu Ubeydə (radıyallahu təala anh): "Ya Xəlifə! Nə edirsən? Bütün Şamlılar, xüsusən də yunanlar, müsəlmanların xəlifəsini görmək üçün toplandılar. Sənə baxırlar. Bu etdiyini bəyənməyəcəklər" dedikdə, "Ya Əbu Ubeydə! Sənin bu sözün burada toplananlar üçün çox zərərlidir. Eşidənlər insanın şərəfini vasitəyə minərək getməkdə və bəzəkli paltar geyinməkdə sanacaqlar. Şərəfin müsəlman olmaqda və ibadət etməkdə olduğunu anlamayacaqlar. Biz sadə, bayağı insanlardıq. [Acəm şahlarının əlində əsir idik.] Allahu təala müsəlman etməklə bizləri şərəfləndirdi. Allahu təalanın verdiyi bu izzətdən, bu şərəfdən başqa şərəf axtarsaq, Allahu təala bizi yenə zəlil edər, hər şeydən alçaq edər buyurdu. İzzət İslamdadır. İslamın əhkamına tabe olan əziz olar. Bu əhkamı bəyənməyib, izzəti, hüzuru, səadəti başqa şeylərdə axtaran zəlil olar, dedi. İslamın əmrlərindən biri təvazödür. Təvazö göstərən əziz olur, yüksəlir. Təkəbbür edən zəlil olur. Bir hədisi-şərifdə, **"Qiyamət günü dünyadakı kibr sahibləri kiçik qarışqa kimi zəlil və dəyərsiz olaraq qəbrdən çıxarılacaqdır. Qarışqa kimi lakin insan şəklində olacaqlar. Hər kəs bunları kiçik, dəyərsiz görəcəkdir. Cəhənnəmin ən dərin və əzabı ən şiddətli olan Bolis çuxuruna atılacaqlar. Buraya girənlər qurtulmaqdan məyus olduqları üçün Bolis deyilmişdir. Atəş içində qeyb**

**olacaqdırlar. Su istədikləri zaman onlara Cəhənnəmdəkilərin irinləri veriləcəkdir”** buyuruldu. Mədinə valisi olan Əbu Hüreyrə (radıyallahu təala anh) odun daşıyırdı. Muhamməd ibn Ziyad (rahimə-hullahü təala) onu tanıyaraq, yanındakılara, “yol verin, Əmir gəlir” dedi. Gənclər valinin belə təvazökarlığına heyrət etdilər. Hədisi-şərifdə, **“Öncəki ümmətlərdə kibr sahibi birisi, ətəklərini yerdə sürüyərək gəzirdi. Qeyrəti ilahiyyəyə toxunaraq, yer onu uddu”** və **“Eşşəyə minmək, yun paltar geyinmək və qoyunun südünü sağmaq kibrsizlik əlamətidir”** buyuruldu.

Kibrin başlıca yeddi səbəbi vardır: Elm, yəni din bilgiləri, ibadət, nəsəb, camal, qüvvət, mal, vəzifə. Bu sifətlər cahillərdə olduqda kibrə səbəb olurlar. Elm kibrə səbəb olduğu kimi, kibrin dərmanı da elmdir. Kibrə səbəb olan elmin əlacı çox çətindir. Çünki elm çox qiymətli bir şeydir. Bunun üçün elm sahibi özünü üstün və şərəfli sanır. Belə kimsənin elminə cahillik demək daha doğru olar. Həqiqi elm insana acizliyini, qüsurunu və Rəbbinin böyüklüyünü, üstünlüyünü bildirir. Xaliqinə qarşı qorxusunu və məxluqlara qarşı təvazökarlığını artırır. Qul haqlarına əhəmiyyət verir. Belə elmi öyrətmək və öyrənmək fərzdir. Buna **“Elmi nafi”** deyilir. İxlas ilə ibadət etməyə səbəb olur. Kibrə səbəb olan elmin əlacı iki şeyi bilməklə olur. Birincisi, elmin qiymətli, şərəfli olması saleh niyyətə bağlıdır. Cəhalətdən və nəfsinin həvasından qurtulmaq üçün öyrənmək lazımdır. İmam olmaq, müfti olmaq, din adamı kimi tanınmaq üçün öyrənməmək lazımdır. İkincisi, elmi ilə əməl etmək və başqalarına öyrətmək, eləcə də bunları ixlas ilə etmək lazımdır. Əməl və ixlas ilə olmayan elm zərərlidir. Hədisi-şərifdə, **“Allah üçün olmayan elmin sahibi Cəhənnəmdə atəşlər üzərinə oturdulacaqdır”** buyuruldu. Mal, vəzifə və şöhrət üçün elm sahibi olmaq belədir. Dünyalıq ələ keçirmək üçün elm öyrənmək, yəni dini dünyaya vəsilə etmək, qızıl qaşıqla nəcasət yeməyə bənzəyir. Dini dünya qazancına alət edənlər din oğrularıdır. Hədisi-şərifdə, **“Din bilgilərini dünyalıq ələ keçirmək üçün əldə edənlər Cənnətin qoxusunu duymayacaqlar”** buyuruldu. Fənn bilgilərini dünya mənfəəti üçün öyrənmək caizdir. Hətta lazımdır. Hədisi-şərifdə, **“Bu ümmətin alimləri iki cür olacaqdır: Birinciləri, elmləri ilə insanlara faydalı olacaqlar. Onlar-**

**dan bir qarşılıq gözləməyəcəklər. Belə olan insana dənizdəki balıqlar, yer üzündəki heyvanlar və havadakı quşlar dua edəcəklər. Elmi başqalarına faydalı olmayan, elmini dünyalıq ələ keçirmək üçün istifadə edənlərə qiyamətdə Cəhənnəm atəşindən xalta vurulacaqdır"** buyuruldu. Yerdə və göydə olan məxluqların hamısının təsbeh etdiklərini Qurani-Kərim xəbər verir. **"Alimlər, Peyğəmbərlərin varisləridir"** Hədisi-şərifindəki alim, Rəsulullahın (sallallahu təala aleyhi və səlləm) yolunda olan, Onun yoluna tabe olan din alimi deməkdir. İslamiyyətə tabe olan alim ətrafına ziya saçan işıq qaynağı kimidir. **"Qiyamət günü bir din adamı gətirilib Cəhənnəmə atılar. Cəhənnəmdəki tanıdıqları ətrafına toplanıb, sən dünyada Allahın əmrlərini bildirirdin. Nə üçün bu əzaba düşdün, deyə soruşarlar. Bəli, "günahdır, etməyin" deyərdim, özüm edərdim. "Edin" dediklərimi də etməzdim. Bunun üçün cəzasını çəkirəm, deyər";** və **"Merac gecəsi göyə aparılarkən insanlar gördüm. Atəşdən qayçılarla dodaqlarını kəsirdilər. Bunların kim olduqlarını Cəbrayıldan soruşdum. Ümmətinin xətiblərindən, vaizlərindən, özlərinin etmədiklərini "edin" deyənlərdir, dedi"** və **"Cəhənnəm zəbaniləri günah işləyən hafizlərə, bütə tapınanlardan daha öncə əzab edəcəklər. Çünki bilərək edilən günah bilməyərək ediləndən daha pisdir"** hədis-şərifləri məşhurdur. Əshabi-kiram çox alim olduqları üçün kiçik günahlardan da böyük günahlar kimi qorxardılar. Buradakı hafizlər gərək ki, Tövrat hafizləridir. Çünki günah işləyən müsəlmanlara kafirlərdən daha şiddətli əzab edilməyəcəkdir. Yaxud, bu ümmətdən olub, günahlardan, haramlardan çəkinməyə əhəmiyyət verməyib, kafir olan hafizlərdir. Hədisi-şərifdə, **"Alimlər dövlət adamlarına qarışmadıqca və dünyalıq toplamaq arxasınca qaçmadıqca Peyğəmbərlərin əminləridir. Dünyalıq toplamağa başladıqda və hökumət adamlarının arasına qarışdıqda bu əmanətə xəyanət etmiş olurlar"** buyuruldu. Əmanətçinin özünə verilən malları mühafizə etməkdə əmin olması lazım gəldiyi kimi, din aliminin də İslam bilgilərini pozulmaqdan mühafizə etməkdə əmin olması lazımdır. Rəsulullah (sallallahu aleyhi və səlləm), Kəbəni təvaf edərkən, "hansı insan daha pisdir?" deyə soruşuldu. **"Pis olanı soruşma!**

**Yaxşı olanları soruş. Alimlərin pisi insanların ən pisidir”** buyurdu. Çünki alimlər bilərək günah işləyir. İsa aleyhissəlam, “Pis alimlər su yolunu bağlayan qaya kimidir. Su qayadan sızıb keçə bilməz. Axmasına da mane olar” dedi. Pis din adamı kanalizasiyaya bənzəyər. Görünüşdə sağlam sənət əsəridir. İçi isə pisliklə doludur. Hədisi-şərifdə, **“Qiyamət günü əzabların ən şiddətlisi elmi özünə faydalı olmayan din adamınadır”** buyuruldu. Bunun üçün, münafiqlər, yəni müsəlman görünən kafirlər Cəhənnəmin dibinə gedəcəklər. Çünki bunlar eşitdikləri, bildikləri halda inad edərək kafir olmuşdurlar. Elm sahibi, yəni din bilgilərini öyrənən kimsə ya sonsuz səadətə qovuşur, yaxud nəhayətsiz fəlakətə düçar olur. Hədisi-şərifdə, **“Cəhənnəmdə əzab çəkənlərdən bəziləri pis qoxular yayar. Bu qoxu digərlərinə atəşdən daha çox əzab verir. Sən nə günah işlədin ki, səndən belə pis qoxu gəlir, deyildikdə, mən din adamı idim, bildiklərimi etməzdim deyər”** buyuruldu. Əbüddərda (radıyallahu təala anh) deyir ki, “Elmi ilə amil olmayan din adamına alim deyilməz.” İblis bütün dinləri bilirdi. Lakin elmi ilə əməl etmədi. Çöldə qalan kimsənin yanında on ədəd qılınc və müxtəlif silahlar olsa, bunlardan yaxşı istifadə edə bilsə və çox cəsur olsa, ona hücum edən aslana qarşı bunları işlətməsə, bu silahların faydası olarmı? Əlbəttə olmaz. Bunun kimi din bilgilərindən yüz min məsələ öyrənsə, bunlardan istifadə etmədikcə faydalarını görməz. Xəstə olan kimsə də dərdinin ən faydalı əlacı tapılsa, istifadə etmədikcə faydasını görməz.

**“Axır zamanda ibadət edənlərin çoxu din cahili olacaqdır. Din adamlarının çoxu da fasiq olacaqdır”**, hədisi-şərifində bildirilən fasiq din adamları dünyalıq ələ keçirmək üçün hökumət adamları arasına qarışacaqlar. Süfyanı Səvri (rahimə-hullahü təala) deyir ki, Cəhənnəmdə atəşdən bir vadi vardır. Bu vadidə hökumət adamları arasına qarışan riyakar hafizlər əzab görəcəkdir. Yenə, Süfyan deyir ki, elmdə o qədər irəlilədim ki, bir ayəti-kəriməyə otuz üç cür məna verirdim. Sultanın ziyafətinə getdim. Yediyim tikələrin təsiri ilə bildiklərimin hamısını unutdum. Muhamməd bin Sələmə (rahimə-hullahü təala) deyir ki, dünya mənfəəti üçün hökumət adamlarının qapısında gözləyən bir hafizin halı, pislik üzərinə qonmuş milçəyin halından daha pisdir.

**“Allahu təalanın ehsan etdiyi elmi insanlara öyrətməyənə qiyamət günü atəşdən xalta bağlanacaqdır”** hədisi-şərifi yuxarıda bildirilmişdi. Elmi insanlardan saxlayan din adamları belə olacaqdır. Nisə surəsinin, **“Mallarınızı səfehlərə verməyin!”** məalindəki beşinci ayəti-kəriməsi alçaqlara, münafiqlərə elm öyrətməyi qadağan edir.

**“İslamiyyət hər tərəfə yayılacaqdır. Hətta İslam tacirləri ticarət üçün böyük dənizlərdə sərbəst səfər edəcəklər və qazilərin atları başqa məmləkətlərə yayılacaqdır. Sonra, hafizlər törəyəcək, “məndən daha yaxşı oxuyan varmı? Məndən daha çox bilən varmı?” deyəcəklər. Cəhənnəmin odunları bunlardır”** hədisi-şərifindən aydın olur ki, riya ilə oxumaları və təkəbbür etmələri özlərini Cəhənnəmə sürükləyəcəkdir.

Hədisi-şərifdə, **“Alim olduğunu söyləyən şəxs cahildir”** buyuruldu. Hər soruşulana cavab verən, hər gördüyündən məna çıxaran və hər yerdə bilgi satan şəxs cahilliyini ortaya qoyar. Bilmirəm, öyrənib söyləyərəm deyən kimsənin dərin alim olduğu aydın olur. Rəsulullaha (sallallahu aleyhi və səlləm), ən qiymətli yer haradır, deyildikdə, **“Bilmirəm, Rəbbim bildirərsə söyləyərəm”** demişdir. Bunu Cəbrail aleyhissəlamdan soruşmuş, ondan da eyni cavabı almışdır. O da Allahu təaladan soruşmuş, **“Məscidlər”**dir cavabını almışdır. Araf surəsinin **“Əfv et və marufu əmr et”** məalindəki 198-ci Ayəti-kəriməsi gəldikdə Cəbrail aleyhissəlamdan bunu açıqlamasını istəmiş, o da Rəbbimdən öyrənərəm, deyərək getmişdir. Təkrar gəldikdə, Allahu təala, **“Səndən uzaqlaşana yaxınlaş! Səndən əsirgəyənə ehsan et! Sənə zülm edənləri əfv et!”** əmrini verdi, dedi. Şabi (rahimə-hullahü təala), ondan soruşulanlardan birinə “bilmirəm” dedikdə, “Sən İraq məmləkətinin müftisisən. Bilmirəm demək sənə yaraşarmı?” dedikləri zaman, “mələklərin üstünləri bilmirik, dedilər. Mənim söyləməyimdən nə çıxar”, buyurdu. İmamı Əbu Yusif (rahimə-hullahü təala), bir suala “bilmirəm” dedikdə, “həm Beytül maldan maaş alırsan, həm də cavab vermirsən”, dedilər. “Beytül maldan bildiklərim qədər maaş alıram. Bilmədiklərim üçün alsaydım, Beytül malda olanların hamısı çatmazdı” dedi. Nəfsinə tabe olmayan cahil ilə dostluq etmək, nəfsinin əsiri olan din adamı ilə dostluq etməkdən yaxşıdır.

Din adamı olduğu üçün təkəbbür etmək cahil olmağın əlamətidir. Çünki elm təvazökarlığa səbəb olur, kibrdən çəkindirir.

Təkəbbür etmək haramdır. Təkəbbür Allahu təalanın bir sifətidir. Kibr və Kibriya sifəti ona məxsusdur. İnsan nəfsini nə qədər alçaldarsa, Allahu təala qatında qiyməti o qədər yüksələr. Özünə qiymət verənin Allahu təala qatında qiyməti olmaz. Kibrin zərərini bilməyənə alim demək yalan olar. İnsanın elmi artdıqca Allahu təaladan qorxusu artar. Günah işləməyə cəsarət edə bilməz. Bunun üçün Peyğəmbərlər (aleyhimüssəlam) təvazö sahibi idilər. Allahu təaladan çox qorxardılar. Onlarda kibr və ucb kimi pis xüsusiyyətlər heç yox idi. Kiçiklərə, fasiqlərə və facirlərə qarşı da kibrli olmamaq lazımdır. Yalnız təkəbbür sahibinə qarşı təkəbbür etmək lazımdır. Bir alim cahili gördükdə, “bu, bilmədiyi üçün günah işləyir. Mən isə bilərək işləyirəm,” deməlidir. Bir alimi gördükdə, “bu məndən daha çox bilir və elminin haqqını verir. İxlas ilə əməl edir. Mən belə deyiləm”, deməlidir. Özündən daha yaşlı bir kimsəni gördükdə, “bu məndən daha çox ibadət etdi”, deməlidir. Gəncləri gördükdə, “bunların günahı az, mənim günahım çoxdur” deməlidir. Özü yaşındakıları gördükdə, “günahlarımı bilirəm, onun nə etdiyini bilmirəm. Bilinən pislikləri təhqir etmək lazımdır”, deməlidir. Bir bidət sahibini və ya kafiri gördükdə, “insanın halı son nəfəsdə bəlli olur. Görəsən mənim halım nə olacaq”, deməli, bunlara da təkəbbür etməməlidir. Lakin bunları sevməməlidir. Hələ küfrü, bidəti yaymağa çalışan **“Dində Reformçular”**, Rəsulullahın (sallallahu aleyhi və səlləm) sünnətinə düşməndirlər. Sünnətin nurlarını söndürməyə və bidəti, dələləti yaymağa, Əhli sünnət alimlərini (rahimə-hümullahü təala) pisləməyə, ayəti-kərimələrə və hədisi-şəriflərə yanlış mənalar verərək, İslamiyyəti içəridən yıxmağa çalışırlar.

[Kitabevimizin bütün yayınları, Əhli sünnət alimlərinin (rahimə-hümullahü təala) kitablarından tərcümə edilmişdir. Öz düşüncələrimiz deyildir. Kitablarımızın hamısında, Əhli sünnət alimlərinin (rahimə-hümullahü təala) böyüklüklərini, üstünlüklərini gənclərə eşitdirməyə çalışırıq. Bu səadəti, qurtuluş yolunu insanlığa tanıtmağa çalışırıq. Bunun qarşılığında heç bir dünya mənfəəti düşünmürük. Kimsədən bir şey gözləmirik. Bidət sahibləri, məzhəbsizlər, hər növ İslam düşmənləri kitablarımızın

oxunmasını, yayılmasını istəməyə bilər. Kitablarımıza qarşı şeytanca iftiralar edə bilər. Elm sahibi olmadıqları üçün elmi bir qüsur tapa bilmirlər. “Kitablardan pul qazanır, mənfəət əldə edirlər” də deyə bilməzlər. Bu kitablar səhvdir, bunları oxumayın deyənlər olur. “Harada səhv var, göstərin” deyildikdə, “elə eşitdik, elə imiş”deyirlər. Əlhamdülillah! Ayıq gənclər bu bölücülərə aldanmır. Oxuyanlar həmişə artır.]

Bu yıxıcıları, bölücüləri də sevməmək lazımdır. Lakin insanın öz günahlarını unutmaması, əzəldə onun haqqında necə təqdir olunduğunu və son nəfəsinin necə olacağını düşünməsi lazımdır. Axirətdə kimin kimdən üstün olacağı dünyada dəqiq bilinməz. Çox din adamı kafir olaraq can vermişdir. Çox kafirlərə də iman ilə can vermək nəsib olmuşdur. İndi kafirə Cəhənnəmlik, özünə Cənnətlik deyən kimsə, qeybi bildiyini iddia etmiş olur. Bu isə küfrdür. Çünki Cənnətlik və Cəhənnəmlik olmaq son nəfəsdə bəlli olur. Son nəfəsin necə olacağını söyləmək qeybi bilmək olur. Ona görə kimsəyə təkəbbür etmək caiz deyildir.

**Sual:** “Kafirə və bidət sahibinə nehyi münkər etmək, nəsihət vermək lazımdır. Özünü bunlardan aşağı görən şəxs onlara necə nəsihət verə bilər? Bundan başqa, adəti ilahiyyə belədir ki, insan necə yaşadısa, elə can verər. Bunun əksi olmuşdursa da nadirdir. Həm də Allahu təala möminləri mədh edir, imansızlardan üstün olduqlarını bildirir” deyilərsə, buna **“cavab”** olaraq deyərik ki, onları sevməməyin lazım olması Allahu təala **“Sevməyin!”** dediyi üçündür. Onlardan daha üstün olduğumuz üçün deyildir. Sultan kiçik oğlunu xidmətçisi ilə bir yerə göndərərkən, uşaq qəbahət edərsə acıqlanmasını, hətta döyməsini əmr edər. Xidmətçi də uşaq qəbahət etdikdə, onu döyər. Lakin döyərkən, özünün uşaqdan daha qiymətli olmadığını bilir. Ona təkəbbür edə bilməz. Möminin kafiri sevməməsi buna bənzəyir. Allahu təala möminlərin özlərinin deyil, imanlarının üstün olduğunu bildirdi. İman kimdə varsa o üstün olur. Sonsuz üstünlük son nəfəsdə bəlli olur.

İbadətin qiymətli olması da şərtlərə bağlıdır. Müsəlman, **“malayani”** ilə, yəni faydasız şeylərlə vaxt keçirməz. Həzrəti Əbu Bəkr buyurdu ki, biz bir harama düşmək qorxusundan, yetmiş halalı işləməkdən çəkinirdik. Bunun üçün heç kim ibadətinə

güvənməməlidir. Çox ibadət etdiyi üçün təkəbbür etməməlidir. İbadətin qəbul olması üçün niyyətin xalis olması, yəni yalnız Allahu təalanın rızası üçün edilməsi lazımdır. Bu ixlası əldə etmək asan deyildir. Nəfsi təmizləmək təqva ilə olur. Təqva, haramlardan çəkinmək deməkdir. Nəfsi təmizlənməyən kimsənin ibadətlərini ixlas ilə etməsi çox çətindir. Ataları, babaları ilə öyünmək və təkəbbür etmək cahillik və axmaqlıqdır. Qabil Adəm aleyhissəlamın oğlu idi. Kənan Nuh aleyhissəlamın üç oğlundan biridir. Digər adı Yamdır. Qardaşı Yafəs din alimi idi. Özü isə küfrdən qurtula bilmədi. Atasının Peyğəmbər olması onu küfrdən qurtarmadı. İnsanın öyündüyü babaları bir ovuc torpaq oldu. Torpaq ilə öyünmək ağla uyğun olarmı? Onların saleh olmaları ilə öyünmək deyil, onlar kimi saleh olmağa, onların yolunda getməyə çalışmaq lazımdır.

Qadınların çoxu gözəllikləri ilə təkəbbür edər. Halbuki gözəllik insanda qalıcı deyil tez gedər, insana mülk olmaz. Keçici olan şeylə təkəbbür etmək axmaqlıqdır. Zahirin gözəlliyi qəlbin gözəlliyi ilə, yəni gözəl əxlaqla birlikdə olduqda qiymətlidir. Qəlbin təmizliyi də Rəsulullahın sünnətinə tabe olmaqla bəlli olur. İnsanın qəlbinə, ruhuna, əxlaqına qiymət verilməzsə, insanın heyvandan fərqi olmaz. Hətta heyvanlardan aşağı olar. Pisliklə dolu, pozulan, parçalanan bir maşın olar. Hər zaman bəslənməsi, təmizlənməsi, təmir edilməsi lazım gələn xarab bir maşına bənzəyər. Belə kimsəyə təkəbbür etmək yaraşarmı? Bunun ancaq təvazö göstərməsi lazımdır.

Gənc və qüvvətli olmaqla təkəbbür etmək də cahillikdir. Heyvanların fiziki və hiss orqanlarındakı qüvvəti insanlardan qat-qat çoxdur. Heyvanların insanlara təkəbbür etməsi lazımdır. Həmişə qüvvətli qalacağını, xəstəliyə, təhlükəyə, qəzaya düşməyəcəyini kim iddia edə bilər? Gəncliyindən, gücündən, qüvvətindən, hətta hərəkətindən, tənəffüsündən ayrılmayan şəxs görülmüşdürmü? Belə keçici, davamı çox qısa olan və heyvanlarla ortaq olan şeylərlə təkəbbür etmək ağla uyğun olarmı?

Mal ilə, övlad ilə, vəzifə ilə və rütbə ilə təkəbbür etmək insana heç yaraşmaz. Çünki bunlar onda olan üstünlüklər deyildir. Gəlib keçən, özündə qalmayan, insandan tez ayrılan şeylərdir. Bunlar əxlaqsızlarda, pis insanlarda da olur. Həm də onlarda daha çoxdur. Bunlar üstünlük olsaydı, bunlara qovuşmayanların və qovuşub

ayrılanların, çox aşağı kimsələr olması lazım gələrdi. Mal, şərəf vəsiləsi olsaydı, oğruların az vaxtda belə olsa şərəfli kimsələr olmaları lazım gələrdi.

**"Hıqd"** da, təkəbbürə səbəb olmamalıdır. Hıqd, lüğətdə kin tutmaq, kin bəsləmək deməkdir. Qəlbindən düşmənlik bəsləməkdir. Özü ilə eyni dərəcədə olan və ya daha üstün olan kimsəyə hirslənər, bir şey etmək əlindən gəlmədiyi üçün ona təkəbbür edər. Təvazö göstərilməsi lazım olan kimsəyə təvazö edə bilməz. Onun haqlı sözlərini, nəsihətlərini qəbul etməz. Hər kəsə qarşı ondan daha üstün olduğunu göstərmək istər. Ona əziyyət verərsə üzr diləməz.

**"Həsəd"** də təkəbbürə səbəb olur. Başqasında olan nemətlərin ondan ayrılaraq özünə gəlməsini istər. Onun haqlı olan sözlərini və nəsihətlərini rədd edər. Ondan bir şey soruşub öyrənmək istəməz. Özündən yüksək olduğunu bildiyi halda ona təkəbbür edər.

**"Riya"** da təkəbbür etməyə səbəb olur. Riya ilə, göstəriş edərək, tanımadığı insana başqalarının yanında təkəbbür edər. Yalnız olduqları zaman etməz. Belə insanların təkəbbüründən qurtulması üçün alimlərin vüqarlı olmaları, şərəflərinə uyğun paltar geymələri lazımdır. Bunun üçün İmamı Əzam Əbu Hənifə (rahimə-hullahü təala), sarğınız böyük olsun və cübbənizin qol ağzı geniş olsun, buyururdu. İnsanlara moizə və nəsihət edəcək kimsələrin yeni, təmiz paltar geyərək özlərinə camal verməlləri ibadət olur. Hörmət edilməzlərsə sözləri dinlənməz. Çünki, cahillər insanın zahirinə baxar, elmindən, əxlaqından anlamazlar.

Çox kimsə kibrli olduğunun fərqində deyildir. Bunun üçün kibrin əlamətlərini bilmək lazımdır. İçəri girdikdə hər kəsin onun üçün ayağa qalxmasını sevər. Özünə hörmət edildiyini anlayaraq onlara nəsihət vermək istəyən alimin özü üçün ayağa qalxılmasını arzu etməsi kibr olmaz. Özü oturub başqalarının özünə qarşı ayaq üstə durmalarını istəmək, təkəbbürdür. Həzrəti Əli (radıyallahu anh) buyurdu ki, "Cəhənnəmlik bir kimsə görmək istəyən özü oturub başqalarını ayaq üstə saxlayan adama baxsın!" Əshabikiram (aleyhimürrıdvan), Rəsulullahı (sallallahu aleyhi və səlləm) hər şeydən çox sevərdi. Gəldiyi zaman ayağa qalxmazdılar. Çünki ayağa qalxılmasını istəmədiyini bilirdilər. Bununla yanaş, alimlər gəldikdə, elmin şərəfini göstərmək üçün ayağa qalxmaq lazımdır.

Yəhya ibn Kattan (rahimə-hullahü təala), ikindi namazını qıldıqdan sonra caminin minarəsinə söykənərək oturmuşdu. Yanına zamanın məşhur alimlərindən bir neçəsi gəldi. İçlərində Əhməd ibn Hanbəl (rahimə-hullahü təala) də vardı. Hamısı ayaq üstə olaraq hədis elmindən soruşdular. Yəhya hər birinin cavabını verdi. Heç birinə otur demədi. Heç biri də oturmağa cəsarət etmədi. Söhbətləri axşam namazına qədər davam etdi. Gənc olan alim yaşlı olan cahilin baş tərəfinə oturar. Tələbə xocasından əvvəl sözə başlamaz. Xocası yox ikən onun yerinə oturmaz. Küçədə önündə getməz. Bir kimsə özü üçün ayağa qalxılmasını sevər, lakin bu sevgidən qurtulmaq istərsə sevgisi **“Meyli təbii”,** yəni təbiii hal olar. Yaxud şeytanın vəsvəsəsindən olar. Hər ikisi də günah deyildir. Əlində deyildir, iradəsindən kənardır.

Yalnız olaraq gəzməyib, arxasından başqalarının da gəlməsini istəmək, yaxud özü heyvan üstündə, tələbələrinin yerdə getmələrini sevmək də kibr əlamətidir. Rəsulullah (sallallahu aleyhi və səlləm), Mədinənin Baki qəbristanına gedirdi. Bir neçə nəfər görüb arxasından gəldilər. Duraraq önə keçmələrini əmr buyurdu. Arxalarından getdi. Səbəbi soruşulduqda, **“Ayaq səsini eşitdim. Qəlbimə kibrdən bir zərrə gəlməməsi üçün belə etdim”** buyurdu. Ona kibr gəlməz. Əshabına dərs vermək üçün belə etdi. Əbüddərda (radıyallahu təala anh) deyir ki, kibrli kimsənin arxasında gəzənlərin sayı artdıqca, onun Allahu təaladan uzaqlaşması da artar.

Üzərində haqqı olanları, yəni tanıdıqlarını ziyarət etməmək də kibr əlamətidir. Özündən aşağı olanları ziyarət etmək təvazö əlamətidir.

Yanında başqasının oturmasını istəməmək və xəstələrlə birliktdə oturmamaq, evinin işini görməmək, evinə lazım olan şeyləri satın alıb evinə gətirməmək və geyinilmiş paltarı təkrar geymək istəməmək kibr əlamətlərindəndir. İş başında iş paltarı geymək istəməmək də belədir. Kasıbların dəvətinə getməyib, zənginlərin dəvətinə getmək də təkəbbürdür. Əqrəbasının və uşaqlarının möhtac olduqları şeyləri təmin etməmək və doğru sözü qəbul etməyib münaqişə etmək, qüsurunu, qəbahətini bildirənlərə təşəkkür etməmək hər kəsin yanında olarsa riya olur. Həm yalnız ikən, həm də başqalarının yanında olarsa, kibr olur.

Təvazö sahibi ola bilmək üçün dünyaya haradan gəldiyini, hara gedəcəyini bilmək lazımdır. Heç yox idi. Öncə bir şey edə bilməyən, hərəkət edə bilməyən uşaq oldu. İndi də hər an xəstə olmaq, ölmək qorxusundadır. Nəhayət öləcək, çürüyəcək və torpaq olacaqdır. Heyvanlara, böcəklərə qida olacaqdır. Edam otağına salınıb, edam olunacağı zamanı gözləyən kimsənin ölüm otağında çəkdiyi sıxıntılar kimi dünya zindanında hər an nə zaman əzaba götürüləcəyini gözləməkdədir. Öləcək, leş olacaq, böcəklərə yem olacaq, qəbir əzabı çəkəcək, sonra dirildilib qiyamət sıxıntılarını çəkəcəkdir. Cəhənnəmdə sonsuz yanmaq qorxusu içində yaşayan kimsəyə təkəbbür yaraşar, yoxsa təvazö? İnsanların yaradıcısı, yetişdiricisi, hər an təhlükələrdən qoruyucusu olan və qiyamətdə hesaba çəkəcək, sonsuz əzab edəcək olan, sonsuz qüvvət, qüdrət sahibi, bənzəri, ortağı olmayan tək hakim və qadir olan Allahu təala, **"Təkəbbür edənləri sevmərəm, təvazö edənləri sevərəm"** buyurur. Aciz, əlindən heç bir şey gəlməyən zavallı insana bunlardan hansını etmək yaraşar? Ağlı başında olan, özünü və Rəbbini tanıyan heç təkəbbür edə bilərmi? İnsan alçaqlığını, acizliyini Rəbbinə qarşı hər an izhar etmək məcburiyyətindədir. Bunun üçün hər an, hər yerdə acizliyini göstərməli, təvazö üzrə olmalıdır. Əbu Süleyman Darani (rahimə-hullahü təala) deyir ki, "Bütün insanlar məni olduğumdan daha alçaltmaq, təhqir etmək istəsələr, bunu edə bilməzlər. Çünki hər kəsin təhqir dərəcələrinin ən aşağısı olaraq düşünə biləcəklərindən daha aşağı olduğumu bilirəm". İnsan özünü hər kəsdən, hətta İblisdən, Firondan daha aşağı düşünə bilərmi? Çünki bu ikisi [eləcə də Stalin, Mao və bunun kimi İslam və insanlıq düşməni olan zalımlar] kafirlərin ən pisləridir. Tanrılıq davası edən, istədiklərini etmələri üçün milyonlarla insanı öldürən və işgəncə altında inlədənlərin, kafirlərin ən aşağısı olduqları mütləqdir. Allahu təala bunlara qəzəblənmiş, küfrün ən pisinə düçar etmişdir. "Mənə isə mərhəmət etmiş, iman və hidayət ehsan etmişdir. İstəsəydi bunun əksini edərdi. Əlhamdulillah, etmədi. Bununla yanaşı, bu yaşa gələnə qədər çox günah işlədim. Kimsənin etmədiyi pislikləri etdim. Son nəfəsimin necə olacağını da bilmirəm", deyərək təvazö etmək lazım gəldiyini hər kəs özü-özünə deməlidir.

Hədisi-şəriflərdə buyuruldu ki: **“Allahu təala təvazö üzrə olmağı mənə əmr etdi. Heç biriniz heç bir kimsəyə təkəbbür etməyin!”** Zimmi deyilən qeyri-müsəlman vətəndaşlara və icazə ilə [pasport ilə] gəlmiş xarici tacirlərə, əcnəbi iş adamlarına, turistlərə də təkəbbür etməmək lazım olduğu bu hədisi-şərifdən aydın olur. Hər insana təvazö etmək lazım olduğu halda, onlara xəyanət etmək, incitmək heç caiz deyildir.

[Darül hərbdə[1]olan kafirlərin mallarına, canlarına, şərəflərinə, namuslarına təcavüz etmək, orada da oğurluq, quldurluq etmək, can almaq, kafirlərin də qanunlarına qarşı çıxmaq, idarə edənləri təhqir etmək, asayişi pozmaq, qarışıqlıq çıxarmaq, vergidən yayınmaq, nəqliyyat vasitələrinin rüsumunu ödəməmək, o cümlədən İslamın şərəfinə və gözəl əxlaqına yaraşmayan hər hansı bir çirkin hərəkət etməyin caiz olmadığı bu hədisi-şərifdən və yuxarıda yazılan açıqlamasından da aydın olur. Kafir məmləkətlərindəki xristian qanunlarına qarşı çıxmamaq, onları ulül-əmr[2]olaraq tanımaq demək deyildir. Allahu təalaya üsyana səbəb olacaq əmrlərə qarşı çıxmaq olmaz. Ülül-əmrin də, kafirlərin də, belə əmrlərinə qarşı üsyan etmək olmaz. Hökumətə, qanunlara qarşı çıxmaq, harada olursa olsun, fitnə çıxmasına səbəb olur. Fitnəyə səbəb olmaq haramdır. Fiqh kitablarında, ikrah qismində və Muhamməd Masumun (rahmətullahi aleyh) üçüncü cild, 55-ci məktubunda bunun açıqlaması mövcuddur. Bir kimsə İslam məmləkətində və ya Darül-hərbdə, yəni kafir məmləkətində Peyğəmbərimizin (sallallahu aleyhi və səlləm) bu əmrinə uymayaraq kafirlərə qarşı da ədəbsizlik, azğınlıq edərsə, onların idarələrinə qarşı çıxaraq cinayət işlərsə, günah işləmiş olacağı kimi İslamiyyəti və müsəlmanları bütün dünyaya qarşı barbar, zalım olaraq tanıtmış olur və İslamiyyətə böyük xəyanət etmiş olur.

Cihad, **“Əmri maruf və nehyi anil-münkər”** deməkdir. Bu cihad iki yerə ayrılır: Birincisi, kafirlərə İslamiyyəti tanıtmaq, onları küfr fəlakətindən qurtarmaq deməkdir. İkincisi, müsəlmanlara elmi-hallarını öyrətmək, onların haram işləmələrinə mane ol-

---
[1] Darül hərb-savaş yeri, qeyri-müsəlman ölkə.
[2] Ulül-əmr-müsəlmanları idarə edən zatlar.

maqdır. Bunların hər ikisi də üç yolla edilir. Birincisi, bədən ilə etməkdir. Bədən ilə, yəni hər cür hərbi vasitələr ilə cihad etmək, İslamiyyətdən xəbərləri olmayaraq, başqalarından görməklə və ya zalımların, istismarçıların təzyiqləri, işgəncələri və aldatmaları ilə küfrə sürüklənmiş zavallılara İslamiyyəti bildirməyə əngəl olan diktatorlara, imperyalist güclərə qarşı olur. Ən modern hərbi vasitələr ilə döyüşərək, bu zalım diktatorların, imperyalistlərin gücləri, qüvvətləri yox edilərək, bunların pəncələri, təzyiqləri altında inləyən zavallı millətlər əsarətdən, köləlikdən qurtarılır. Bunlara İslamiyyət öyrədilərək, sevə-sevə müsəlman olmaları təklif olunur. Qəbul etməzlərsə, müsəlmanlarla birlikdə İslam dininin adil, hürriyyətçi və bərabərlik əmr edən əmrləri altında, müsəlmanlarla eyni haqlara malik olaraq, öz dinlərinin hökmlərini və ibadətlərini sərbəst şəkildə etmək surətiylə yaşamalarına izn verilir. Bu silahlı cihadı, muharibəni yalnız dövlət edər. Yəni dövlətin ordusu, müdafiə qüvvələri edər. Dövlətin əmri, bilgisi, izni olmadan heç bir müsəlmanın kafirlərə hücum etməsi, quldurluq etməsi caiz deyildir. Dövlətin sülh bağladığı kafirlərdən birini öldürən müsəlmanı İslam dini ən ağır cəzaya məhkum edir. Göründüyü kimi, İslam dinində cihad demək, məmləkətləri yıxmaq, insanları öldürmək deyildir. İnsanlara İslamiyyəti tanıdaraq, öz istəklərilə sevə-sevə müsəlman olmalarına çalısmaq deməkdir. Peyğəmbərimiz (sallallahu aleyhi və səlləm) və Əshabi-kiram (radıyallahu təala anhüm əcmain), eləcə də həqiqi müsəlman olan İslam dövlətləri, məsələn Osmanlılar, həmişə belə cihad etdilər. Gücsüz, müdafiəsiz insanlara hücum etmədilər. Bu insanlara İslamiyyətin çatdırılmasına, tanıdılmasına mane olan İslam düşməni kafir diktatorlarla, imperyalistlərlə və müsəlman adını daşıyan bidət sahibi bölücülərlə hərb edərək, onların istismarçı, əzici güclərini yox etdilər. Bu işgəncə güclərinin altında inləyən insanları qurtararaq hürriyyətə qovuşdurdular. Onlara İslamiyyəti öyrədib, öz istəkləri ilə sevə-sevə həqiqi müsəlman olmalarına, əbədi səadətə qovuşmalarına səbəb oldular.

İslam dövlətinin, İslam ordusunun ikinci vəzifəsi müsəlmanları və İslam dinini yox etmək üçün İslam məmləkətlərinə hücum edən kafirlərə və yanlış inanclı bölücülərə qarşı cihad edərək müsəlmanları və İslam dinini qorumaqdır. Allahu təala Ənfal surəsində, İslam

dövlətinin kafir məmləkətlərində hazırlanan hərbi silahları araşdırıb, öyrənib, bunların hamısını sülh zamanında hazırlamalarını əmr edir. Bunu etməyən bir hökumət İslamiyyətə uymamış olur. Düşmənlərin hücumlarına cavab verə bilməyib, minlərlə müsəlmanın şəhid olmasına və İslamiyyətin zəifləməsinə səbəb olur.

İslam cihadının ikinci şəkli, hər cür nəşr vasitəsi ilə İslamiyyəti insanlara yaymaq, eşitdirməkdir. Bu cihad İslam alimləri tərəfindən, İslam dövlətinin yardımı və nəzarəti ilə edilir. Əsrimizdə İslam düşməni olan kafirlər, missionerlər, masonlar, komunistlər və məzhəbsizlər hər cür nəşr orqanları ilə İslamiyyətə hücum edirlər. Yalanlarla, iftiralarla insanları, hətta cahil müsəlmanları aldadaraq İslam dinini yox etməyə çalışırlar. Xristianların on bir sual uyduraraq bütün İslam məmləkətlərinə apardıqlarını 1992-ci ildə xəbər aldıq. Banqladeşdəki İslam alimləri bunlara cavab yazaraq, keşişləri rəzil etmişdilər. İstanbuldakı **"Həqiqət Kitabevi",** bu cavabları, **"Əl-Əkazib-ül-cədidə-tül-xristiyaniyyə"** adı altında, **"Əssırat-ul-müstəqım"** kitabına əlavə edərək bütün dünyaya göndərməkdədir. **"Kadiyani"**, yəni əhmədilər, **"Bəhailər", "Məvdudicilər", "Təbliği cəmaatçılar", "Sələfiçilər", "Məzhəbsizlər"** və **"Vəhhabilər"**, Qurani-Kərimdən və hədisi-şəriflərdən yanlış mənalar çıxararaq İslamın doğru yolundan ayrılırlar. Bu yolunu azmışların azğınlıq edənləri kafir [Allaha düşmən] olurlar. Bunların hamısı mətbuat yolu ilə kitablar, məcmuələr, risalələr çıxararaq və radiolarla yanlış inanışlarını yayırlar. Bunu etmək üçün milyonlar sərf edirlər. Bir yandan, **"Əhli sünnət"** və ya **"Sünni"** deyilən həqiqi müsəlmanları aldadaraq İslamiyyəti içəridən yıxırlar. Digər tərəfdən də İslamiyyəti bütün dünyaya yanlış olaraq tanıdırlar. Müsəlman olmaq istəyən əcnəbilər, bu çeşidli propaqandalar qarşısında nə edəcəklərini bilmirlər. Ya müsəlman olmaqdan vaz keçirlər, yaxud yanlış bir yola girərək müsəlman olduqlarını sanırlar.

İslamın daxili və xarici düşmənlərinin yıxıcı, aldadıcı propaqandalarına qarşı Əhli sünnət alimlərinin, həqiqi müsəlmanlığı, yəni Muhamməd aleyhissəlamın və Əshabi-kiramın (radıyallahu təala anhüm əcmain) yolunu nəşr vasitələri ilə bütün dünyaya yaymaları günümüzün ən qiymətli cihadıdır.

Cihadın üçüncü qismi dua ilə edilən cihaddır. Bütün müsəlmanların bu cihadı etmələri fərzi ayndır[1]. Bu cihadı etməmək böyük günahdır. Bu cihadı etmək cihadın birinci və ikinci qismlərini edənlərə dua etməklə olur. Ləşkəri qəza (savaş ordusu), ləşkəri duanın (dua ordusunun) yardımına möhtacdır. İxlas ilə edilən dua mütləq qəbul olur.

Cihadın yuxarıda yazılmış üç qismini də Allahu təalanın yardımına güvənərək və dininə uyaraq edənlərə Allahu təala mütləq yardım edər. Cihada hazırlaşmayıb, lazım olan ən yeni silahları, gücü öncədən təmin etməyib, çalışmadan, bir-birimizlə sevişmədən, oturduğumuz yerdə edilən duaları Allahu təala qəbul etməz. Duanın qəbul olması üçün öncə səbəblərinə yapışmaq lazımdır. Təvəkkül də belədir. Cihadda müvəffəqiyyət qazanmaq üçün İslamiyyətə tabe olmaq lazım olduğunu bildirdik. İslamiyyət, cihada öncədən hazırlaşmağı əmr edir. Cihadın birinci qismini edə bilmək üçün ən müasir hərbi vasitələrin hər növünü öncədən hazırlamaq və bunların istifadəsini öyrənmək, komandana, hökumətə tabe olmaq, bölücülük etməmək lazımdır. Hərbi fondlara hər müsəlmanın əlindən gəldiyi qədər çox maliyyə vəsaiti hədiyyə etmələri lazımdır. Cihadın ikinci qismini edən Əhli sünnət alimlərinə və bunları bəsləyən fondlara, təşkilatlara da yardım etmək, mal ilə cihad etmək olur. Bədən ilə, mal ilə, pul ilə cihad edənlərə Allahu təala qiyamətdə Cənnəti vəd edir. Əli Muhamməd Bəlhi, h.1411-ci ildə nəşr edilmiş farsca **“Müftiy-yi mücahid”** kitabında cihadı ətraflı anlatmaqdadır.]

Hədisi-şərifdə, **“Nemətə qovuşmuş olanlardan təvazö göstərənlərə, özlərini qüsurlu bilənlərə, halaldan qazanıb, xeyirli yerdə sərf edənlərə, fiqh bilgiləri ilə hikməti, yəni təsəvvüfü birləşdirənlərə, halala, harama diqqət edənlərə, kasıblara mərhəmət edənlərə, işlərini Allah rızası üçün edənlərə, əxlaqı gözəl olanlara, kimsəyə pislik etməyənlərə, elmi ilə əməl edənlərə və malının çoxunu paylayıb, sözünün çoxunu saxlayanlara müjdələr olsun”** buyuruldu.

Ələ salmaq üçün və münafiqlik edərək, riya edərək, mala, vəzifəyə qovuşmaq üçün, yaxud qorxduğu üçün edilən təvazö də

---

[1] Fərzi ayn-hər müsəlmanın yerinə yetirməsi vacib olan fərz.

pis əxlaqdır. Bu pis əxlaqdan qurtulmaq üçün buna səbəb olan pisliklərdən qurtulmaq lazımdır. Belə pis səbəblərdən qurtulan kimsənin təvazökarlığı gözəl əxlaq olur.

## ELMİN VƏ ALİMLƏRİN QİYMƏTİ

Farsca **"Riyad-un-Nasihin"**[1] kitabının 356-cı səhifəsindən başlayaraq deyilir ki:

**"Mirsad-ül-ibad minəl-məbdəyi iləl-məad"**da[2] yazılmış hədisi-şərifdə, **"Alimlər arasında qiymətli olmaq üçün, cahillər ilə mücadilə üçün və hər yerdə məşhur olmaq üçün din bilgisi öyrənən elm adamı Cənnətin ətrini belə duymayacaqdır"** buyuruldu. Bu hədisi-şərifdən aydın olur ki, mal toplamaq, bir vəzifə əldə etmək və heyvani arzularına qovuşmaq üçün elm öyrənən və elmi ilə əməl etməyən kimsə İslam alimi deyildir. Digər bir hədisi-şərifdə, **"Dünyalıq ələ keçirmək üçün elm öyrənən dünyada mal və vəzifə əldə edər. Axirətdəki qazancı ancaq Cəhənnəm atəşi olar"**. Belə elmin faydası yoxdur. Belə elmdən qaçmaq lazımdır. Belə ki, hədisi-şərifdə **"Ya Rəbb! Məni faydasız elmdən qoru!"** buyuruldu. Bir müsəlmanın öyrənməli olduğu bilgilərə **"İslam elmləri"** deyilir. İslam elmləri iki növdür. **"Din bilgiləri"** və **"Fənn bilgiləri"**. Dində reformçular din bilgilərinə **"Skolastik bilgilər"**, fənn bilgilərinə **"Rasional bilgilər"** deyirlər. Faydasız elm iki cürdür: Birincisi, yuxarıda bildirilən Cəhənnəmlik olanların öyrəndikləri din bilgiləridir. İkincisi, din bilgiləri ilə birlikdə olmayan fənn bilgiləridir. [**"Künuz-üd-dəqaıq"**dəki hədisi-şərifdə **"Ən yaxşınız Quranı öyrənən və öyrədəndir"** buyuruldu.] **"Misqat"** kitabında deyilir ki, **"Hər müsəlman kişinin və qadının İslam bilgilərini öyrənmələri fərzdir"** hədisi-şərifi Allahu təalanın rızasına uyğun elmləri öyrənməyi əmr etməkdədir. Uy-

[1] "Riyad-un-nasihin" kitabını Muhammməd Rəbhami hicri 835-ci ildə yazmışdır. 1313-cü ildə Bombeydə çap edilmiş, 1994-cü ildə Həqiqət kitabevi tərəfindən ikinci nəşri edilmişdir.

[2] "Mirsad-ül-ibad" müəllifi Nəcmüddin Əbu Bəkr Razi 654-cü ildə vəfat etmişdir.

ğun olmayan kimsələrə elm öyrətmək, donuzlara qızıl və mirvari boyunbağı taxmaq kimidir. [Türkiyə qəzetinin 12 İyun 1995-ci il tarixli təqvim səhifəsində yazılmış olan hədisi-şərifdə, **"Qiyamətə yaxın həqiqi din bilgiləri azalacaq. Cahil din adamları öz düşüncələri ilə fətva verərək, insanları doğru yoldan azdıracaqlar"** buyuruldu.] Bir hədisi-şərifdə buyuruldu ki, **"Bir zaman gələcək ki, insanlar din adamından küçədə rastlaşdıqları eşşək ölüsündən qaçar kimi qaçarlar"**. Bu hal insanların hallarının pis olacaqlarını xəbər verir. Çünki elmə Allahu təala qiymət verir. Lakin dünyaya tapınan axmaqlar uşaq ikən ana-ata tərbiyəsi almamış, məktəbə getməmiş, böyük yaşında ikən də həqiqi din aliminin söhbətində iştirak etməklə və ya onların kitablarını oxumaqla şərəflənə bilməmişdirlər. Bunlar dinlərinin nöqsan olması təhlükəsindən qorxmazlar və həqiqi din alimlərinin kitablarından oxuyub öyrənməzlər. Bunların tək düşüncələri pul, mal toplamaq və vəzifə əldə etməkdir. Halaldanmı, haramdanmı gəldiyini heç ayırd etməzlər. Haqqı batildən ayıra bilməzlər. Elmin və həqiqi din alimlərinin qiymətini bilməzlər. Həqiqi din adamlarının söhbətləri, kitabları bunların nəzərində, heyvan bazarında gözəl ətirlər satan əttar və korlara ayna satan kimidir. Əbu Ləhəb kimi kimsəyə **"Taha"** surəsini oxumaq, küçə avarasının cibinə mirvari, mərcan doldurmaq, bir kora sürmə hədiyyə etmək, ağıllı kimsənin edəcəyi şey deyildir. Allahu təala belə başı boş insana **"Bunlar heyvan kimidir, hətta daha aşağıdırlar"** buyurdu. Ənəs ibn Malikin xəbər verdiyi hədisi-şərifdə, **"Alimi haqsız olaraq təhqir edəni, Allahu təala bütün insanlar arasında dəyərsiz, rəzil edər. Alimə hörmət edəni Allahu təala Peyğəmbərlər kimi əziz edər, şərəfləndirər"** buyuruldu. Bir hədisi-şərifdə, **"Bir kimsə, alimin səsindən yüksək səslə danışarsa, Allahu təala onu dünyada və axirətdə dəyərsiz, mənfur edər. Əgər peşman olub, tövbə edərsə əfv olunar."** Göründüyü kimi həqiqi alimlərə hörmət etmək lazımdır. Şer:

***Bir damla sudan yaradıldın unutma!***
***Əsla özünü alimlərlə bir tutma!***
***Bax, nə buyurdu Mustafa:***
***"Alimə edilən hörmət, hörmət etmək olur bana!"***

Yaxşı bil ki, insanı dəlalətdən, pis yoldan elm və alimlər qurtarar. Rəhbər olmadan doğru yola qovuşmaq olmaz. Bunun üçün Əhli sünnət alimlərini və onların yazdığı doğru din kitablarını axtarıb tapmaq lazımdır. Uca Peyğəmbər Musa aleyhissəlam elmin ən yüksək dərəcəsində olduğu, Allahu təala ilə danışmaq şərəfinə qovuşduğu və Allahu təalanın məhəbbət şərbətindən içdiyi halda elmə yiyələnmək üçün Hızır aleyhissəlamın tələbəsi olan Yuşa aleyhissəlamın yanına gəldiyi **"Kəhf"** surəsində bildirilir. Musa aleyhissəlam məntiq elminin ustadı ikən, Hızır aleyhissəlamdan elm öyrənməyə gəldi. Buxari təfsiri bunu geniş anlatır. O halda, ey qardaşım! Qiymətli ömrünü elmdən və alimdən daha qiymətli olan bir şey tapdınmı ki, ona sərf edirsən? Bilmirsənmi ki, dinimiz elmə qiymət verməyi, alimlərə hörmət etməyi və Allah yolunda olanlarla bərabər olmağı əmr etməkdədir. Bunun üçün qiymətli ömrünü faydasız şeylərlə keçirmə! Hədisi-şərifdə, **"Doğru elm sahibi olan və elmi ilə əməl edən bir alimlə Peyğəmbərlər arasında bir dərəcə fərq vardır. Bu bir dərəcə peyğəmbərlik məqamıdır"** buyuruldu. Bu səadətə qovuşmaq üçün elm öyrənməyə çalışmaq lazımdır. Şer:

***Ey elm öyrənməkdə olan məsud kimsə!***
***Ömrünün bir dəqiqəsini boş keçirmə!***
***Bu nəsihətimin qiymətini bil!***
***Peşman olur qiymət bilməyən kimsə!***

**Hekayə:** İmamı Əbu Yusüf Kadinin on beş yaşında oğlu vardı. Oğlunu çox sevirdi. Anidən vəfat etdi. Tələbəsinə "Dəfn işini sizin öhdənizə buraxdım. Mən ustadımın dərsinə gedirəm. Bu günkü dərsi qaçırmayım" dedi. İmamı vəfatından sonra röyada gördülər. Cənnətdə, böyük bir imarətin qarşısında dururdu. İmarətin yüksəkliyi Ərşə çatırdı. "Bu imarət kimindir?" deyildikdə, "mənimdir" buyurdu. "Buna necə qovuşdun?" deyildikdə, "Elmə, elm öyrənməyə və öyrətməyə olan məhəbbətim ilə" buyurdu. Ey qardaşım! Dünyada və axirətdə əziz olmaq üçün elm öyrən! Şer:

*Həmişə nəşəli olmaq üçün,*
*hər yerdə hörmət tapmaq üçün,*
*elm sahibi olmağa çalış,*
*elm tacını daşımağa alış!*

**Hekayə:** Bu fəqirin hocasının uşaqlarının ən böyüyü təqva sahibi idi və çox alim idi.[1] Vəfat edərkən atası yatağının başında idi. Vəfat etdikdə üstünü örtdü. Mədrəsəyə gəlib bir cüz hədis dərsi verdi. Sonra mədrəsədən çıxıb dəfn işinə başladı. Dağlardan, hər yerdən gələn bir səs, "Oğlumun əcəli gəldi. Vəfat etdi. Bu iş Allahu təalanın rızası ilə olduğu üçün mən də razı oldum. Başqa bir çarə bilmirəm. Allahu təalanın qəzası və əmri belə oldu" deyirdi. Hassan ibn Atıyyənin (radıyallahu anh) rəvayət etdiyi hədisi-şərifdə, **"Alimin ölümünə üzülməyən münafiqdir. İnsanlar üçün bir alimin ölümündən daha böyük musibət yoxdur. Bir alim öldükdə göylər və göylərdə olanlar yetmiş gün ağlar"** buyuruldu. Həqiqi alim vəfat etdikdə dində bir yara açılar ki, qiyamətə qədər bağlanmaz. Digər bir hədisi-şərifdə, **"Bir insan ya alimdir, yaxud elm öyrənməkdə olan tələbədir. Yaxud bunları sevməkdədir. Bu üçündən başqaları axırlarda uçan milçəklər kimidir"** buyuruldu. Bu dördüncü dərəcədən olmamağa çalışın! Şer:

*İnsanı Cəhənnəmdən qurtaran elmdir.*
*Kimsənin səndən ala bilməyəcəyi mal elmdir.*
*Elmdən başqa bir şey istəmə ki,*
*dünyada və axirətdə məqsədə qovuşduran elmdir!*

Bəldəci fətvalarında deyilir ki, İmamı Sadr-üş-şəhid[2] deyir ki, **"Həqiqi alim ilə istehza edənin zövcəsi boş olur"**. Bir alimə axmaq, cahil, donuz, eşşək deyən tazir (cəza) edilir. Təhqir edərək söylərsə, kafir olur, zövcəsi boş olur. İmamı Muhamməd buyurur ki, küfrə səbəb olan hər kəliməni söyləmək də belədir. Elmi və alimləri təhqir edən kafir olur. Allahu təala hamımıza faydalı elm nəsib etsin. Fayda-

---

[1] **"Riyad-ün-nasıhin"** kitabının müəllifi, Mevlana Muhamməd Rəbhamidir. Onun ustadı Allamə Muhamməd Cəlal Qayini Sümmə Hirəvidir.

[2] Sadr-üş-şəhid Hüsaməddin Ömər, 536-cı ildə Səmərqənddə şəhid oldu.

sı olmayandan mühafizə etsin. Faydası olan elm Rəsulullahdan gələn elmdir. Bu elmlər Əhli sünnət alimlərinin kitablarında yazılmışdır.

## TƏZƏLLÜL

13 - Təvazönün həddən artıq miqdarına **"Təzəllül",** bayağılıq, özünü aşağı tutmaq deyilir. Təzəllül haramdır. Başqa haramlarda olduğu kimi bu da zərurət ilə caiz olur. Dinini, canını, malını, şərəfini qorumaq, zalımdan qurtulmaq **"Zərurət"**dir. Məşəqqət, çətinlik olduqda, asanlıq axtarmaq caiz olur.

Təzəllül, pis əxlaqlardan biridir. Bir alimin yanına bir çəkməçi gəldiyi zaman alimin ayağa qalxıb, yerinə onu oturtması, gedəcəyi zaman qapıya qədər yanında getməsi və çəkmələrini önünə qoyması təzəllülə bir misaldır. Yalnız ayağa qalxıb otursaydı, ona yer göstərsəydi və işini, halını, nə üçün gəldiyini soruşsaydı, suallarına gülər üzlə cavab versəydi, dəvətini qəbul etsəydi, sıxıntısını aparacaq bir şey etsəydi, təvazö göstərmiş olardı. Hədisi-şərifdə, **"Din qardaşını sıxıntıdan qurtarana** [nafilə] **həcc və umrə savabı verilir"** buyuruldu. Həzrəti Həsən (radıyallahu təala anh) Sabit Bənaniyə (rahimə-hullahü təala) bir ehtiyacını həll etməsini rica etdi. "Camidə itiqaf edirəm, başqa vaxt edərəm" dedikdə, "din qardaşının ehtiyacını həll etmək üçün getməyin [nafilə] həcc savabından daha xeyirli olduğunu bilmirsənmi?" dedi. Vəzifə sahiblərinin möhtac olanlara və hocaların tələbələrinə vəzifələri ilə və malları ilə yardım etmələrinin çox savab olması bu hədisi-şərifə söykənir. Nəfəqəsi, yəni bir günlük yeyəcəyi, içəcəyi olan kimsənin dilənməsi təzəllüldür, haramdır. Bunun bir günlük nəfəqəsi olmayan başqa bir kimsə üçün və ya borclu üçün yardım toplaması təzəllül olmaz. Daha çox hədiyyə almaq üçün az bir şeyi hədiyyə vermək də təzəllül olur. Ayəti-kərimə belə hədiyyə verməyi qadağan edir. Alınan hədiyyənin qarşılığını bundan artıq vermək yaxşıdır. Lakin daha çox qarşılıq üçün hədiyyə vermək caiz deyildir. Dəvət olunmadan ziyafətə getmək də təzəllüldür. Hədisi-şərifdə, **"Dəvət edilən yerə getməmək günahdır. Dəvət olunmadığı yerə getmək oğurluq etmək olur"** buyuruldu. Nikah sahibinin

dəvət etdiyi yerdə haram şeylər yoxdursa, bu dəvətə getmək vacib olur. Başqa dəvətlərə getmək sünnətdir. Riya və iftixar üçün, yəni göstəriş və öyünmək üçün edilən dəvətlərə getmək caiz deyildir. Bir mənfəətə qovuşmaq düşüncəsiylə, dövlət adamları ilə, hakimlərlə, zənginlərlə dostluq etmək təzəllül olur. Zərurətin müstəsna olduğu yuxarıda bildirilmişdi. Belə kimsələrlə qarşılaşdıqda, onlara salam verərkən əyilmək və səcdə etmək də təzəllüldür. Böyük günahdır. İbadət məqsədilə əyilmək küfrdür. Yəhudilərin salam vermələrinə bənzəyir. [Fəqir möhtac deməkdir. İslamiyyətdə zəruri ehtiyaclardan əlavə qurban nisabı miqdarı malı olmayana **“Fəqir”** deyilir. Rəsulullahın (sallallahu təala aleyhi və səlləm) Allahu təaladan istədiyi və öyündüyü fəqirlik, hər zaman, hər işdə Allahu təalaya möhtac olduğunu bilməkdir. Abdüllah Dəhləvi (rahimə-hullahü təala), **“Dürr-ül-məarif”** kitabında buyurur ki, “Təsəvvüfdə **“fəqir”**, muradı olmayan, yəni Allahu təalanın rızasından başqa diləyi olmayan deməkdir”. Belə olan şəxs nəfəqə olmadıqda səbr və qənaət edər. Allahu təalanın felindən və iradəsindən razı olur. Allahu təala əmr etdiyi üçün ruzi qazanmağa çalışar. Çalışarkən, ibadətlərini tərk etməz və haram işləməz. Qazanarkən də, qazandığını sərf edərkən də İslamiyyətə tabe olar. Belə kimsəyə zənginlik də, yoxsulluq da faydalı olur. Dünya və axirət səadətinə qovuşmasına səbəb olur. Lakin nəfsinə tabe olaraq səbr və qənaət etməyən Allahu təalanın qəza və qədərinə razı olmaz. Kasıb olduqda az verdin deyə etiraz edər. Zəngin olarsa, doymaz, daha çox istər. Qazandığını haramlara sərf edər. Onun zənginliyi də, onun yoxsulluğu da, dünyada və axirətdə fəlakətinə səbəb olur.]

Hər sənətə yiyələnmək və ticarət etmək, maaş, məvacib qarşılığında mübah olan işləri görmək, məsələn, çobanlıq, bağbanlıq etmək, inşaatda, qazıntıda çalışmaq və belində yük daşımaq təzəllül deyildir. Peyğəmbərlər (aleyhimüssaləvatü vəttəslimat) və Vəlilər (rahimə-hümullahü təala) bunları etmişdirlər. Özünün və ailəsinin nəfəqəsini (ehtiyaclarını) təmin etmək üçün çalışmaq fərzdir. Başqalarına yardım üçün hər cür qazanc yolunda çalışaraq daha artıq qazanmaq mübahdır. İdris aleyhissəlam dərzilik edərdi. Davud aleyhissəlam dəmirçilik edərdi. İbrahim aleyhissəlam əkinçilik və parça ticarəti edərdi. İlk olaraq parça toxuyan Adəm aleyhis-

səlamdır. [Din düşmənləri ilk insanların ot ilə örtündüklərini, mağarada yaşadıqlarını yazırlar. Bu yazılarının heç bir əsası yoxdur.] İsa aleyhissəlam pinəçilik edərdi. Nuh aleyhissəlam xarratlıq, Saleh aleyhissəlam çantaçılıq edərdi. Peyğəmbərlərin çoxu (aleyhimüssaləvatü vəttəslimat) çobanlıq etmişdir. Hədisi-şərifdə, **"Evinin ehtiyaclarını alıb gətirmək kibrsizlik əlamətidir"** buyuruldu. Rəsulullah (sallallahu təala aleyhi və səlləm) mal satmış və satın almışdır. Satın alması daha çox olmuşdur. Əmək haqqı ilə çalışmış və çalışdırmışdır. Mudarəbə şirkəti[1]və ortaqlıq qurmuşdur. Başqasına vəkil olmuş və vəkil etmişdir. Hədiyyə vermiş və almışdır. Borc və ariyyət[2] mal almışdır. Vəqf (fond) qurmuşdur. Dünya işi üçün kiməsə hirslənməmiş, incidəcək şey söyləməmişdir. And içmiş və içdirmişdir. And içdiyi şeyləri etmiş, etməyib kəffarət verdiyi də olmuşdur. Lətifə etmiş və söyləmiş, lətifələri həmişə haqq üzrə və faydalı olmuşdur. Yuxarıda sayılanları etməkdən çəkinmək, utanmaq kibr olur. Çox kimsələr burada yanılırlar. Təvazökarlığı ilə təzəllülü bir-biri ilə qarışdırırlar. Nəfs, burada çox kimsələri aldadır.

***Gəl ey qürbət diyarında əsir olub qalan insan.***
***Gəl ey dünya xarabında yatıb qafil olan insan!***
***Gözün aç, ətrafa bir bax, necə bəylər gəlib keçdi.***
***Nə məcnundur bu faniyə könül verib duran insan!***
***Qəfəsdə bülbülə şəkər verərlər, lakin heç durmaz.***
***Əcəb neyçün qərar edər, bu zindana girən insan!***
***Ağlını başına topla, əlində var ikən fürsət.***
***Sonsuz əzab çəkəcəkdir, "Adam sən də" deyən insan!***

## UCB

14 – Pis əxlaqın on dördüncüsü ucbdur. Ucb, etdiyi ibadətləri, yaxşılıqları bəyənərək bunlarla öyünməkdir. Etdiyi ibadətlərin,

---

[1] Ortaqlardan bir qisminin sərmayə qoyması və bir qisminin iş görməsi ilə qurulan ortaqlıq.
[2] Əvəzi ödənilməyən, istifadəyə verilən mal.

yaxşılıqların qiymətini bilərək, bunların əldən getməsini düşünərək qorxmaq, üzülmək ucb olmaz. Yaxud, bunların Allahu təaladan gələn nemətlər olduğunu düşünərək sevinmək də ucb olmaz. Bunların Allahu təaladan gələn nemətlər olduğunu düşünməyərək özü etdiyini, qazandığını sanaraq sevinmək, özünü bəyənmək, ucb olur. Ucbun ziddinə **"Minnət"** deyilir. Minnət, nemətə öz əliylə, öz çalışmasıyla qovuşmadığını, Allahu təalanın lütfü və ehsanı olduğunu düşünməkdir. Belə düşünmək ucb təhlükəsi olduğu zaman fərz olur. Digər zamanlarda isə müstəhəbdir. İnsanı ucba sürükləyən səbəblərin başında cəhalət və qəflət gəlir. Bu ucbdan qurtulmaq üçün hər şeyin Allahu təalanın diləməsi ilə və yaratması ilə meydana gəldiyini, ağıl, elm, ibadət etmək, mal və vəzifə kimi qiymətli nemətlərin Allahu təalanın lütfü və ehsanı olduqlarını düşünmək lazımdır. **"Nemət",** insana faydalı olan, xoş gələn şey deməkdir. Bütün nemətləri göndərən Allahu təaladır. Ondan başqa yaradan və göndərən yoxdur. Əshabi-kiramdan bəziləri (radıyallahu təala anhüm əcmain) Huneyn savaşında əsgərin çoxluğunu görərək, artıq biz heç məğlub olmarıq, dedi. Bu sözlər Rəsulullahın (sallallahu aleyhi və səlləm) mübarək qulağına çatanda üzüldü. Bunun üçün hərbin başlanğıcında nüsrəti ilahi (ilahi yardım) yetişməyib, məğlubiyyət başladı. Sonra, Cənabı Haqq mərhəmət edərək zəfər nəsib eylədi. Davud aleyhissəlam dua edərkən, "Ya Rəbb! Övladlarımdan bir neçəsinin namaz qılmadığı heç bir gecə yoxdur və oruc tutmadığı heç bir gün keçməmişdir" demişdi. Bunun qarşılığında Allahu təala, **"Mən diləməsəydim, qüvvət və imkan verməsəydim bunların heç biri edilə bilməzdi"** buyurdu. Davud aleyhissəlamın bu sözü qeyrəti-ilahiyyəyə toxundu, tarix kitablarında yazılan sıxıntıların başına gəlməsinə səbəb oldu. Kibrə səbəb olan şeyləri yuxarıda bildirmişdik. Bunlar ucba da səbəb olurlar. Allahu təalanın nemətlərinə şükr etmək də böyük bir nemətdir.

Ucbun zərərləri, afətləri çoxdur: Kibrə səbəb olur, günahları unutmağa səbəb olur. Günah qəlbi qaraldır. Günahlarını düşünən insan ibadətlərini böyük görməz. İbadət etməyin də Allahu təalanın lütfü, ehsanı olduğunu düşünər. Ucb sahibi Allahu təalanın məkrini (cəza) və əzabını da unudar. Başqalarından istifadə etməkdən məhrum qalar. Heç kimlə məşvərət etməz, məsləhətləşməz.

Hədisi-şərifdə, **“Üç şey insanı fəlakətə sürükləyər: Buhl, həva və ucb”.** Buhl sahibi, yəni xəsis kimsə, Allaha qarşı və qullara qarşı olan haqları və vəzifələri ödəməkdən məhrum olur. Həvasına, yəni nəfsinin arzularına tabe olan və ucb sahibi olan, yəni nəfsini bəyənən kimsə, mütləq həlaka, fəlakətə düçar olar. İmamı Muhamməd Qəzali (rahimə-hullahü təala) buyurdu ki, “Bütün pisliklərin başı, mənbəyi üçdür: Həsəd, riya, ucb. Qəlbini bunlardan təmizləməyə çalış!” Ucb sahibi həmişə mən, mən deyər. Toplantılarda baş tərəfdə olmaq istər. Hər sözünün qəbul olunmasını istəyər.

Hədisi-şərifdə, **“Günah işləməzsəniz, daha böyük günaha yaxalanmanızdan qorxaram. O da ucbdur”** buyuruldu. Günah işləyənin boynu bükük olur. Tövbə edə bilər. Ucb sahibi elmi ilə, əməli ilə məğrur olur. Eqoist olur. Tövbə etməsi çətin olur. Günah işləyənlərin iniltiləri Allahu təalaya təsbeh çəkənlərin öyünməsindən xoş gəlir. Ucbun ən pisi xətalarını, nəfsinin həvasını bəyənməkdir. Belə insanlar həmişə nəfsinə tabe olar, nəsihət qəbul etməz və başqalarını cahil sanar. Halbuki, özü çox cahildir. Bidət sahibləri, məzhəbsizlər belədirlər. Zay, yalnış etiqadlarını və əməllərini doğru və yaxşı bilib, bunlara sarılmışdırlar. Belə ucbun əlacı çox çətindir. Maidə surəsinin, **“Özünüzə baxın. Özünüz doğru yolda olduqca, başqalarının azması sizə zərər verməz!”** məalindəki 108-ci ayəti-kəriməsinin mənasını Rəsulullahdan soruşdular. Cavabında, **“İslamiyyətin əmrlərini bildirin və qadağan etdiklərini bildirin! Bir kimsə ucb edər sizi dinləməzsə, öz halınızı islah edin”** buyurdu. Ucb xəstələrinin dərmanını hazırlıyan alimlər Əhli sünnət alimləridir. Lakin bu xəstələr xəstəliklərini bilmədikləri, özlərini səhhətli sandıqları üçün, bu təbiblərin nəsihətlərini, elmlərini qəbul etməzlər, fəlakətdə qalarlar. Halbuki bu alimlər Rəsulullahdan (sallallahu aleyhi və səlləm) aldıqları əlacları heç dəyişdirmədən, korlamadan təqdim edirlər. Cahillər, axmaqlar bu əlacları, onların etdiklərini sanır. Haqq yolda olduqlarını zənn edərək özlərini bəyənirlər.

## HƏSƏD

15 – Pis əxlaqın on beşincisi həsəddir. Həsəd, qısqanmaq, gözü götürməməkdir. Allahu təalanın ehsan etdiyi nemətin ondan çıxmasını istəməkdir. Faydalı olmayan, zərərli olan bir şeyin ondan ayrılmasını istəmək həsəd olmaz, **"Qeyrət"** olur. Elmini mal, vəzifə ələ keçirmək, günah işləmək üçün sərf edən din adamından elmin getməsini istəmək qeyrət olur. Malını haramda, zülmdə, İslamiyyəti yıxmaqda, bidətləri və günahları yaymaqda işlədənin malının yox olmasını istəmək də həsəd olmaz, din qeyrəti olur. Bir kimsənin qəlbində həsəd olar, özü buna üzülər, bunu istəməzsə, bu günah olmaz. Qəlbdə olan xatirə, düşüncə günah sayılmaz. Xatirənin qəlbə gəlməsi insanın əlində deyildir. Qəlbində həsəd olmasından üzülməzsə və ya öz istəyi ilə həsəd edərsə, günah olar, haram olar. Bu həsədini sözləri ilə, hərəkətləri ilə bəlli edərsə, günahı daha çox olur. Hədisi-şərifdə, **"İnsan üç şeydən qurtula bilməz: Sui-zənn, tayərə, həsəd. Sui-zənn etdikdə, buna uyğun hərəkət etməyin. Uğursuz zənn etdiyiniz şeyi Allaha təvəkkül edərək həyata keçirin. Həsəd etdiyiniz kimsəni heç incitməyin!"** buyuruldu. Tayərə, uğursuzluğa inanmaqdır. Sui-zənn, bir kimsəni pis zənn etməkdir. Bu hədisi-şərifdən aydın olur ki, qəlbdə həsəd hasil olması haram deyildir. Bundan razı olmaq, davamını istəmək haram olur. **"Hadiqa"**da deyilir ki, "Qəlbə gələn düşüncə beş dərəcədir: Birincisi, qəlbdə durmaz, dəf edilir. Buna "Hacis" deyilir. İkincisi qəlbdə bir müddət qalır. Buna "Xatir" deyilir. Üçüncüsü, etmək ilə etməmək arasında tərəddüd olunur. Buna "Hədis-ün-nəfs" deyilir. Dördüncü dərəcə həyata keçirilməsi tərceh edilir. Buna "Həmm" deyilir. Beşinci dərəcədə bu tərcehə əsaslanıb, qərar verilir. Buna "əzm" və "cəzm" deyilir. İlk üç dərəcəni mələklər yazmaz. Həmm, hasənə (yaxşı) isə yazılır. Seyyiə (pis) isə, tərk edilərsə, savab yazılır. Əzm olarsa, bir günah yazılır". İşlənməzsə bu da əfv olur. Hədisi-şərifdə, **"Qəlbə gələn pis şey söylənmədikcə və buna uyğun hərəkət edilmədikcə əfv olur"** buyuruldu. İnsanın qəlbinə küfr və ya bidət etiqadı olan bir düşüncə gəldikdə bundan üzülər və dərhal rədd edərsə, bu qısa düşüncə küfr olmaz. Lakin illər sonra

kafir olmağa qərar verərsə, hətta bunu bir şərtə bağlasa da qərar verdiyi anda kafir olur. İllər sonra bir kafir ilə evlənməyə niyyət edən qadın da belədir.

[Haramı işləməyin günahı, işləməyə qərar verməkdən daha böyükdür. **“Haram”,** Allahu təalanın qadağan etdiyi şey deməkdir. Günah, **“ism”** deməkdir. Yəni, haram işləyənə qarşı veriləcək cəza deməkdir. Günah işləmək demək, cəza və əzab edilməsinə səbəb olacaq bir şey etmək, yəni haram işləmək deməkdir. **“Savab”,** yaxşılıq və ibadət edənə axirətdə veriləcək yaxşı qarşılıq, mükafat deməkdir. Allahu təala dünyada yaxşılıq və ibadət edənlərə axirətdə savab verəcəyini vəd etmişdir. Yaxşılıq və ibadət edənə axirətdə savab verilməsi vacib və lazım deyildir. Allahu təala lütf edərək, mərhəmət edərək bunlara axirətdə savab verəcəyini vəd etmişdir. Allahu təala vədindən dönməz, mütləq edər.]

Hədisi-şərifdə, **“İnsan haram işləməyi qəlbindən keçirər, Allahdan qorxaraq etməzsə, heç günah yazılmaz. Haramı işlədikdə bir günah yazılır”** buyuruldu.

Kafir [Allaha düşmən] olmağa və bidət sahibi olmağa niyyət etmək haramdır. O anda elə olur. Çünki bu iki niyyətin özləri pisdir, özləri haramdır. Haram işləmək düşüncəsi isə harama səbəb olduğu üçün pisdir. Düşüncənin özü pis deyildir, bunu işləmək, etmək pisdir. Pisliyi işləmədikcə haramlığın və günahın qalxması Allahu təalanın mərhəmətindəndir və Muhamməd aleyhissəlam hörmətinə bu rahməti-ilahiyyə onun ümmətinə məxsusdur.

İnsan bir başqasında olan nemətin ondan getməsini istəməyib, özündə də olmasını istərsə, həsəd olmaz. Buna **“Qibtə”** deyilir. Qibtə gözəl bir xüsusiyyətdir. İslamiyyətin əhkamına, yəni fərzləri etməyə və haramlardan çəkinməyə riayət edən saleh kimsəyə qibtə edilməsi vacibdir. Dünya nemətləri üçün qibtə etmək tənzihən məkruh olar.

Hədisi-şərifdə, **“Allahu təala mömin quluna qeyrət edər. Mömin də döminə qeyrət edər”** buyuruldu. Allahu təala qeyrətindən dolayı fuhşu haram etmişdir. Allahu təala, **“Ey Adəm oğulları! Sizi özüm üçün yaratdım. Hər şeyi də sizin üçün yaratdım. Sənin üçün yaratdıqlarım səni özüm üçün yaradılmış olduğundan qafil, məşğul etməsin və uzaqlaşdırmasın”** buyur-

muşdur. Başqa bir hədisi-qüdsidə, **“Səni özüm üçün yaratdım. Başqa şeylərlə məşğul olma! Ruzinə zaminəm, özünü üzmə!”** buyurmuşdur. Yusif aleyhissəlamın, “Sultanın yanında mənim adımı söylə!” deməsi qeyrəti-ilahiyyəyə toxunaraq illərlə zindanda qalmasına səbəb oldu. İbrahim aleyhissəlamın oğlu İsmayılın dünyaya gəlməsinə sevinməsi qeyrəti-ilahiyyəyə toxunaraq onu qurban etməsi əmr olundu. Allahu təalanın çox sevdiklərinə, bəzi Övliyaya belə qeyrət etməsi çox vaqe olmuşdur. **“Qeyrət”,** bir kimsədə olan haqqına onun başqasını ortaq etməsini istəməməkdir. Allahu təalanın qeyrət etməsi, qulunun pis, çirkin şeylər etməsinə razı olmamasıdır. Qulun vəzifəsi dilədiyini etmək deyildir. Ona qulluq etməkdir. Onun əmrlərinə və qadağalarına tabe olmaqdır. Hər dilədiyini etmək Allahu təalaya məxsusdur. Yalnız Onun haqqıdır. Qulun öz dilədiyini etməsi, günah işləməsi Allahu təalanın haqqına ortaq olmaqdır. Mömin günah işləməkdə özünə qeyrət etməlidir. Bu da günah işləyərkən həyəcanlanması, qəlbinin çırpıntısı, sıxılması ilə olur. Möminin qəlbi Allahu təalanın evidir və gözəl əxlaqların yeridir. Qəlbində pis, çirkin düşüncələrə yer vermək çirkinləri gözəllərə ortaq etməkdir. Qəlbin buna razı olmaması, çırpınaraq mane olması qeyrət olur. Ənsarın rəisi olan Sad ibn Ubadə (radıyallahu təala anh), “Ya Rəsulallah (sallallahu təala aleyhi və səlləm)! Zövcəmi yad kişiylə bir yataqda görsəm, dörd şahid görmədən öldürə bilmərəm?” dedikdə, **“Bəli, öldürə bilməzsən”** buyurdu. Sad buna cavab olaraq, “dörd şahid lazımdırsa da, tab gətirə bilmərəm. Dərhal öldürərəm” dedikdə, Rəsulullah (sallallahu aleyhi və səlləm), **“Rəisinizin sözünü eşidin! O çox qeyrətlidir. Mən ondan daha çox qeyrətliyəm. Allahu təala məndən daha çox qeyrətlidir”** buyurdu. Yəni, belə qeyrət olmaz. Mən ondan daha qeyrətli olduğum halda İslamiyyətdən kənara çıxmaram. Allahu təala ən çox qeyrətli olduğu halda, bu fuhşun cəzasını dərhal verməz, demək istədi. Sadın haqlı olan cəzanı verməkdə tələsməsinin doğru olmadığına işarə buyurdu. Haram işlənərkən görən hər müsəlmanın tazir cəzası etməsi lazımdır. Görənlərin işləndikdən sonra etmələri caiz deyildir. Bu zaman ancaq hökumətin və hakimin tazir etməsi lazımdır. Zina edərkən görüb öldürənin məhkəmədə dörd şahid göstərməsi lazımdır. Yalnız

and içməsi qəbul olunmaz. Dörd şahid gətirə bilməzsə, qatil hakim tərəfindən məhkum edilir.

Qadının ortağına qeyrət göstərməsi caiz deyildir. Rəsulullah (sallallahu aleyhi və səlləm) bir gecə həzrəti Aişənin otağından çıxdı. Həzrəti Aişə (radıyallahu təala anhə), zövcələrindən birinin yanına getdiyini zənn edərək qeyrət etdi. Rəsulullah (sallallahu aleyhi və səlləm) gəldikdə üzüldüyünü anlayıb, **"Qeyrət etdin?"** buyurdu. "Mənim kimi bir zavallı, sənin kimi varlıqların ən şərəflisi, məxluqların ən mərhəmətlisi bir şəxs üçün qeyrət etməzmi?", dedi. Buna cavab olaraq, **"Şeytanının vəsvəsəsinə uymusan"** buyurdu. "Mənim yanımda şeytan var? Ya Rəsulallah!" dedikdə, **"Bəli var"** buyurdu. "Ey Allahın Rəsulu! Sənin yanında da var?" dedikdə, **"Bəli, mənim yanımda da var. Lakin Allahu təala məni onun vəsvəsələrindən mühafizə edir"** buyurdu. Yəni, mənim şeytanım müsəlman olmuşdur. Mənə xeyirli şeyləri xatırladır. Bir hədisi-şərifdə, **"Allahu təala heç kimə ehsan etmədiyi iki nemətini mənə ehsan etdi: Şeytanım kafir idi, onu müsəlman etdi. İslamiyyəti yaymaqda bütün zövcələrimi mənə yardımçı etdi"** buyuruldu. Adəm aleyhissəlamın şeytanı kafir idi. Zövcəsi həzrəti Həvva Cənnətdə şeytanın and içməsinə aldanaraq Adəm aleyhissəlamın xəta etməsinə səbəb oldu.

İnsanların Allahu təalaya qeyrət etmələri haram işlənməsini istəməməklə olur.

Həsədin ziddi **"Nəsihət"** etməkdir. Allahu təalanın bir kimsəyə verdiyi nemətin onda qalaraq dininə və dünyasına faydalı olmasını istəmək deməkdir. Nəsihət etmək bütün müsəlmanlara vacibdir. Hədisi-şərifdə, **"Xeyrə səbəb olana bunu edənin əcri qədər savab verilir"**, və **"Özü üçün istədiyini din qardaşı üçün də istəməyən iman etmiş olmaz"** və **"Dinin təməli nəsihətdir"** buyuruldu. Nəsihət vermək Allahu təalanın var olduğunu, bir olduğunu, bütün kəmal və cəmal sifətlərinin Onda olduğunu, Ona layiq olmayan sifətlərin, eyblərin, qüsurların Onda olmadığını, xalis niyyət ilə Ona ibadət etmək lazım olduğunu, gücü yetdiyi qədər Onun rızasını almağa çalışılmasını, Ona üsyan edilməməsini, Onun dostlarına məhəbbət, düşmənlərinə müxalifət edilməsini, Ona itaət edənləri sevməyi və üsyan edənləri sevməməyi, nemətlərini saymağı və

bunlara şükr etməyi, bütün məxluqlarına səfqət və mərhəmət etməyi, Onda olmayan sifətləri Ona söyləməməyi bildirmək Allahu təala üçün nəsihət etməkdir. Şükr etmək Allahu təalanın göndərdiyi nemətləri İslamiyyətə uyğun şəkildə işlətmək deməkdir. Qurani-Kərimdə bildirilənlərə inanmağı, əmr edilənləri etməyi, öz ağlı ilə, düşüncəsi ilə uydurma tərcümələr etməməyi, Onu çox və doğru olaraq oxumağı, Ona dəstəmazsız əl vurmağın caiz olmadığını insanlara bildirmək Qurani-Kərim üçün nəsihət etməkdir. Muhamməd aleyhissəlamın bildirdiklərinin hamısına inanmaq lazım olduğunu, Ona və adına hörmət etməyi, Onun sünnətlərinə riayət etməyi və yaymağı, Onun gözəl əxlaqı ilə əxlaqlanmağı, Alini, Əshabını və ümmətini sevməyi bildirmək Rəsulullah (sallallahu təala aleyhi və səlləm) üçün nəsihət etməkdir. Ona hörmət edən, Onun dinini mühafizə edən, Onun dininə tabe olmaqda, ibadət etməkdə insanlara hürriyyət verən hökumətlərə yardım etmək, onlara doğrunu bildirmək, müsəlmanların haqqına riayət etməyi bildirmək, onlara üsyan etməmək, qanunlarına qarşı çıxmamaq, onların İslamiyyətə və insanlara xidmət etmələri üçün dua etmək, arxalarında namaz qılmaq, kafirlərlə cihadlarında mal ilə, can ilə və dua ilə yardım etmək, zəkat və vergiləri ödəmək, silah ilə kimsəyə hücum etməmək, zülm və haqsızlıq etdiklərində də üsyan etməyib, xoşluqla onları doğru yola, ədalətə gətirmək, onlara yaltaqlıq etməmək, doğru yoldan ayrılmalarına səbəb olmamaq, hökumət adamlarına qarşı çıxmamaq lazım olduğunu hər kəsə bildirmək və Əhli sünnət alimlərinin (rahmətullahi təala aleyhim əcmain) fiqh kitablarına, elmihal kitablarına və əxlaq kitablarına tabe olmaq lazım olduğunu bildirmək dövlət üçün nəsihət etməkdir. İnsanlara dünyada və axirətdə faydalı olan şeyləri etmək və zərərli olan şeyləri etməmək lazım olduğunu və kimsəyə əziyyət etməməyi, qəlb qırmamağı, bilmədiklərini öyrətməyi, qüsurlarını örtməyi, fərzləri əmr etməyi, haramlardan nəhy etməyi, bunların hamısını xoşluqla, ürəyi yanaraq bildirməyi, kiçiklərə mərhəmət, böyüklərə hörmət edilməsini, özlərinə edilməsini istədiklərini başqalarına da etmələrini, özlərinə edilməsini istəmədiklərini başqalarına da etməmələrini, onlara bədənləri ilə, malları ilə yardım edilməsini bildirmək də bütün insanlar üçün nəsihət etməkdir.

Hədisi-şərifdə, **“Müsəlmanlara yardım etməyən, onların yaxşılıqları və rahatlıqları üçün çalışmayan onlardan deyildir. Gecə və gündüz Allah üçün, Qurani-Kərim üçün, Rəsulullah üçün, dövlət rəhbəri üçün və bütün müsəlmanlar üçün nəsihət etməyən kimsə də bunlardan deyildir”** buyuruldu.

Həsəd ibadətlərin savabını aparır. Hədisi-şərifdə, **“Həsəd etməkdən çəkinin. Bilin ki, atəş odunu yox etdiyi kimi, həsəd də həsənəti** (yaxşılıq, yaxşı əməl) **yox edər!”** buyuruldu. Həsəd edən, həsəd etdiyi adamı qeybət edər, dedi-qodu edər. Onun malına, canına hücum edər. Qiyamət günü bu zülmlərinin qarşılığı olaraq yaxşılıqları alınaraq ona verilər. Həsəd ediləndəki nemətləri gördükdə dünyası əzab içində keçər. Yuxusu qaçar. Xeyir, həsənət işləyənlərə on qat savab verilir. Həsəd bunların doqquzunu yox edər, biri qalar. Küfrdən [Allaha düşmən olmaqdan] başqa heç bir günah həsənətin savablarının hamısını yox etməz. Günah olduğuna inanmayaraq və ya İslamiyyətə əhəmiyyət verməyərək haram işləmək və küfrə, irtidada (mürtəd olmağa) səbəb olan işləri etmək savabların hamısını yox edər. Çünki belə edənlər mürtəd olurlar. Hədisi-şərifdə, **“Keçmiş ümmətlərdən iki pislik sizlərə yoluxdu: Həsəd və qazımaq. Bu sözümlə onların saçlarını qazıdıqlarını demək istəmirəm. Dinlərinin kökünü qazıb yox etdiklərini söyləyirəm. And içərəm ki, imanı olmayan Cənnətə girməyəcəkdir. Bir-biriniz ilə sevişmədikcə imana qovuşa bilməzsiniz. Sevişmək üçün çox salamlaşın!”** buyuruldu.

[Salamlaşmağın çox mühüm olduğunu bu hədisi-şərif açıq göstərir. Salamlaşmanı əmr edir. İki müsəlman qarşılaşdıqda birisinin **“Salamün aleyküm”** deməsi sünnətdir. Digərinin cavab olaraq **“və aleyküm salam”** deməsi fərzdir. Kafirlərə məxsus kəlmələrlə salamlaşmaq və əl, bədən hərəkətləri ilə salamlaşmaq caiz deyildir. Qarşılaşan iki müsəlman bir-birindən uzaqda gedirlərsə, səsini eşidə bilməyəcəyini anladığı zaman söyləməklə birlikdə sağ əli qaşının kənarına qaldırmağın da caiz olduğu bildirilmişdir. Kafirlərlə başqa kəlimələrlə salamlaşaraq fitnə çıxmasına mane olmaq lazımdır. Fitnəni oyandırmaq haramdır. Bu harama mane olmaq çox savabdır.]

**“Müsəlmanlar xeyirli olur. Həsəd etdikdə xeyir qalmaz”** buyuruldu. Digər bir hədisi-şərifdə, **“Həsəd, nəmimə və kəhanət**

**sahibləri məndən deyildir"** buyuruldu. Nəmimə, fitnə çıxarmaq üçün, ara açmaq üçün, insanlar arasında söz gəzdirməkdir. Kəhanət, bilmədiyini söyləyərək bundan hökm, məna çıxarmaqdır. [Bilinməyən şeyləri xəbər verən falçılara **"Kahin"** deyilir. Kahinə inanmaq olmaz.] Bu hədisi-şərifdən həsəd edənin şəfaətdən məhrum qalacağı aydın olur. Yəni, şəfaət istəməyə haqqı olmayacaqdır.

Hədisi-şərifdə, **"Altı şəxs altı şeydən hesaba çəkilib, məhşər yerində əzab gördükdən sonra Cəhənnəmə girəcəkdir: Dövlət rəhbərləri zülmdən, ərəblər qövüm qeyrətindən, kənd rəisləri təkəbbürdən, tacir xəyanətdən, kəndlilər cəhalətdən, alimlər həsəddən"** buyuruldu. Ticarət ilə məşğul olanın yalan söyləmək, faiz, hiylə və fasid bey (alış-veriş) ilə başqasının malını ələ keçirməyin nə demək olduğunu və bu haramlardan qurtulmağın çarələrini öyrənməsi lazımdır. Kəndlilərin, yəni hər müsəlmanın Əhli sünnət etiqadını və elmihalını bilməsi lazımdır. Bu hədisi-şərif həsədin din adamlarında daha çox olduğunu xəbər verməkdədir. **"Təfsiri-kəbir"**də deyilir ki, "Həsəd on qisimdir. Bunların doqquzu din adamlarında olur. Dünya sıxıntıları on növdür. Bunların doqquzu salehlərdə olur. Təvazökarlıq on qisimdir. Doqquzu nasaradadır. Şəhvət on qisimdir. Doqquzu qadınlarda, biri kişilərdədir. Elm on qisimdir. Biri İraqdadır. İman on qisimdir. Doqquzu Yəməndədir. Ağıl on qisimdir, doqquzu kişilərdədir. Yer üzünün bərəkəti on qisimdir, doqquzu Şamdadır". Fəxrəddini Razi həzrətləri bu təfsirində öz zamanında olanları bildirmişdir. Rəsulullah (sallallahu təala aleyhi və səlləm) dünyaya təşrif etməzdən əvvəl yəhudilər hərb edəcəkləri zaman, "Ya Rəbb! Göndərəcəyini vəd etdiyin və ən çox sevdiyini bildirdiyin o şərəfli Peyğəmbər hörmətinə" deyərək dua edərdilər. Duaları qəbul olub Allahu təala onlara yardım edərdi. Rəsulullah (sallallahu aleyhi və səlləm) insanları müsəlman olmağa dəvət etdikdə, Onun vəd edilən Peyğəmbər olduğunu anladılar. Lakin həsəd edərək, qısqanaraq inkar etdilər. Həsədləri özlərinin və gələcək olan nəsillərinin əbədi olaraq fəlakətə, əzablara sürüklənmələrinə səbəb oldu.

Allahu təala şeytanın şərindən qorunmağımızı əmr etdiyi kimi həsəd edənin şərindən də çəkinməyimizi əmr etdi.

Hədisi-şərifdə, **"Nemət sahiblərindən ehtiyaclarınızı gizli olaraq istəyin. Çünki nemət sahiblərinə həsəd edilir"** buyuruldu. Ehtiyaclarınızın ödəndiyi meydana çıxdıqda həsəd olunarsınız. Sirrini gizləyən istərsə aşkara çıxarar, istərsə çıxarmaz. Sirrini açıqlayan kimsə çox kərə söylədiyinə peşman olar, üzülər. İnsan söyləmədiyi sözünə hakimdir. İstərsə söylər, istəməzsə söyləməz. Söylədiyinin isə məhkumudur. Kaş ki, söyləməsəydim deyər. Mala, əşyaya əmin olan kimsələrin çoxu əsrara əmin olmazlar. "Zəhəbini, zihabını və məzhəbini gizli tut!" sözü məşhurdur. [Zəhəb-qızıl, zihab-etiqad, məzhəb də işlərdə tutulan yol deməkdir.]

Həsəd etmək Allahu təalanın təqdirini dəyişdirməz. İnsan boş yerə üzülmüş, yorulmuş olar. Qazandığı günahlar da çalışması olar. Müaviyə (radıyallahu anh) oğluna nəsihət olaraq, "Həsəddən çox çəkin! Həsədin zərərləri səndə düşməninninkindən daha öncə və daha çox hasil olar" dedi. Süfyanı Səvri (rahmətullahi təala aleyh) həsəd etməyənin zehni açıq olur, demişdir. Heç bir həsədçi muradına qovuşmamışdır. Kimsədən hörmət görməmişdir. Həsəd əsəbləri pozar. Ömrün azalmasına səbəb olar. Əsmayi deyir ki, bir kəndliyə rast gəldim. Yüz iyirmi yaşında idi. Çox yaşamasının sirrini soruşdum. "Çünki heç həsəd etmədim" dedi. Əbülleysi Səmərqəndi (rahmətullahi təala aleyh) deyir ki, "Üç kimsənin duası qəbul olmaz: Haram yeyənin, qeybət edənin, həsəd edənin".

Həsəd olunana dünyada və axirətdə bundan heç zərəri olmaz. Hətta faydası olur. Həsəd edənin ömrü üzüntü ilə keçər. Həsəd etdiyi insanda nemətlərin azalmadığını, hətta artdığını görərək əsəb böhranı keçirər. Həsəddən qurtulmaq üçün ona hədiyyə göndərməli, nəsihət verməli, onu mədh etməlidir. Ona qarşı təvazökar olmalıdır. Onun nemətinin artmasına dua etməlidir.

## HIQD

16 – Hıqd, qəlb xəstəliklərinin on altıncısıdır. Hıqd, başqasına nifrət etmək, qəlbində ona qarşı kin, düşmənlik bəsləməkdir. Özünə nəsihət verənlərə belə kin bəsləmək haramdır. Ona hıqd deyil, itaət etmək lazımdır. O, Allahın əmrini yerinə yetirmişdir.

Onu sevmək, hörmət etmək lazımdır. Zülm edənə qarşı hıqd haram deyildir. Bir alacaqlı (borc sahibi) ölsə, bunun haqqı varislərinə ödənməzsə, qiyamətdə ödətdirilir. Zalımı əfv etmək əfdaldır, yaxşıdır. Uhud qəzasında Rəsulullahın (sallallahu aleyhi və səlləm) mübarək üzü yaralanıb, mübarək dişi qırıldıqda, Əshabi-kiram (radıyallahu təala anhüm əcmain) çox üzüldülər. "Dua et, Allahu təala cəzalarını versin" dedilər. **"Lənət etmək üçün göndərilmədim. Xeyir-dua etmək üçün, hər məxluqa mərhəmət etmək üçün göndərildim"** və **"Ya Rəbb! Bunlara hidayət et. Tanımırlar, bilmirlər"** buyurdu. Düşmənlərini əfv etdi. Lənət etmədi.

Hədisi-şərifdə, **"Sədəqə verməklə mal azalmaz. Allahu təala əfv edənləri əziz edər. Allah rızası üçün əfv edəni Allahu təala yüksəldər"** buyuruldu. Gülabadi deyir ki, bu hədisi-şərifdə bildirilən sədəqə fərz olan sədəqə deməkdir. Yəni, zəkat deməkdir. Təvazökarın itaətlərinə, ibadətlərinə daha çox savab verilir. Günahları daha tez əfv olunur. İnsanın yaradılışında heyvani ruhun və nəfsin arzuları mövcuddur. Malı, pulu sevər. Qəzəb, intiqam, kibr sifətləri görünməyə başlar. Bu hədisi-şərif bu pis xüsusiyyətlərin əlacını bildirir. Sədəqəni, zəkatı əmr edir. Əfv edərək qəzəbi, intiqamı təmizləyir. Hədisi-şərifdə əfv etmək mütləq olaraq, şərtsiz olaraq bildirilir. Mütləq olan əmr müqayyədi göstərməz. Yəni, bir şərtə bağlamaz. Mütləq olan əmr ümumidir. Bir neçə şeyə məxsus deyildir. Haqqını almaq mümkün deyilsə də, əfv etmək yaxşıdır. Mümkündürsə, daha yaxşıdır. Çünki haqqını geri almağa qüdrəti var ikən əfv etmək nəfsə daha çətin gəlir. Zülm edəni əfv etmək, hilmin, mərhəmətin və şücaətin ən üstün dərəcəsidir. Özünə yaxşılıq etməyənə hədiyyə vermək də ehsanın ən üstün dərəcəsidir. Pislik edənə ehsan etmək insanlığın ən yüksək dərəcəsidir. Bu sifətlər düşməni dost edər. İsa aleyhissəlam buyurdu ki, "Diş qıranın dişi qırılır. Burun, qulaq kəsənin burnu, qulağı kəsilir demişdim. İndi isə pislik edənə qarşı pislik etməyin. Sağ yanağınıza vurana sol yanağınızı çevirin, deyirəm". Şeyx İbn-ül Arabi (qaddəsallahu təala sirrəhül əziz)[1]deyir ki, "Pislik edənə yaxşılıq edən nemətlərin şükrünü etmiş olar. Yaxşılıq edənə pislik edən kimsə küfranı nemət

[1] Muhyiddin ibni Arabi 638-ci [m. 1240] ildə Şamda vəfat etdi.

(nankorluq) etmiş olar”. Haqqını alandan yalnız haqqını geri almaq, artığını almamaq **“İntisar”** olur. Əfv etmək ədalətin yüksək dərəcəsi, intisar isə aşağı dərəcəsidir. Ədalət salehlərin ən yüksək dərəcəsidir. Əfv etmək bəzən zalımlara qarşı acizliyi göstərə bilər. Zülmün artmasına səbəb ola bilər. İntisar hər zaman zülmün azalmasına, hətta yox olmasına səbəb olur. Belə zamanlarda intisar etmək əfv etməkdən daha əfdal, daha savabdır. Haqqından artığını geri almaq **“Cevr”,** zülm olur. Cevr edənlərə əzab ediləcəyi bildirilmişdir. Zalımı əfv edən Allahu təalanın sevgisinə qovuşar. Zalımdan haqqı qədər geri almaq ədalətdir. Kafirlərə qarşı ədalət edilir. Lakin gücü çatdığı halda əfv etmək gözəl əxlaqdır. Rəsulullah (sallallahu aleyhi və səlləm) bir kimsənin zalıma bəddua etdiyini gördükdə, **“İntisar eylədin!”** buyurdu. Əfv etsəydi daha yaxşı olardı. **“Bəriqa”** birinci cildin sonundakı hədisi-şərifdə, **“Üç şeyə sahib olan Cənnətə istədiyi qapıdan girəcəkdir: Qul haqqını ödəyən, hər namazdan sonra on bir dəfə ixlas surəsini oxuyan, qatilini əfv edərək ölən”** buyurulmuşdur. Zülqərneynin Peyğəmbər olmadığını deyən alimlər demişdir ki, lakin ona Peyğəmbərlərdə olan sifətlərdən dördü verilmişdi. Bunlar: gücü var ikən əfv edərdi, vəd etdiyini yerinə yetirərdi, həmişə doğru söyləyərdi, ruzisini bir gün əvvəldən hazırlamazdı. Zülmün çoxluğu qədər əfvin savabı çox olur.

Hıqddan hasil olan pisliklər on birdir: Həsəd, şəmatət, hicr, istisqar [aşağı görmək], yalan, qeybət, sirri ifşa etmək, ələ salmaq, əziyyət vermək, haqqı ödəməmək və məğfirətə mane olmaq.

Hıqd edən iftira, yalan, yalançı şahidlik, qeybət, sirri ifşa etmək, ələ salmaq, haqsız olaraq incitmək, haqqını yemək və ziyarəti kəsmək günahlarına düçar olur. **“Əməlində üç şey olmayanın bütün günahlarının əfv və məğfirət olunması umulur: Şirkə, küfrə düşmədən ölmək, sehr etməmək və din qardaşına hıqd etməmək”** hədisi-şərifi sehr etməyin İslamiyyətdə yeri olmadığını göstərir.

Sehr, cadu [ofsun] etmək olub haramdır. Sehr edənə farsca **“Cadu”** deyilir. Sehr vasitəsilə hər istədiyini edəcəyinə inanan kafir olar. Sehrin təsirinə inanmayan da kafir olar. Sehrin digər dərmanlar kimi Allahu təala istərsə təsir edə biləcəyinə inan-

maq lazımdır. Hər dilədiyini Allahu təalanın yaradacağına inanmaq küfr olmasa da böyük günahdır. Sehrin müalicəsi **"Səadəti Əbədiyyə"**də ətraflı yazılmışdır.

Hədisi-şərifdə, **"Allahu təala, Şabanın on beşinci gecəsi bütün qullarına mərhəmət edər. Yalnız müşriki və müşahini əfv etməz"** buyuruldu. Müşahin bidət sahibi, məzhəbsiz deməkdir.

Qeyri-müsəlmanların çeşidləri çoxdur. Bunların ən pisi müşrikdir. Müşrik, Allahu təalaya və axirət gününə inanmayan kimsə deməkdir. Ateist, mason, kommunist də müşrik deməkdir. Bidət sahibləri kafir deyildir. Lakin yanlış etiqadlarında həddi aşanların Quranı-kərimdə və hədisi-şəriflərdə açıq bildirilmiş olan bir şeyi inkar etdikləri zaman kafir olduqlarını İslam alimləri bildirmişdirlər. Qurani-Kərimdə və hədisi-şəriflərdə müşrik kəlməsi, kafir kəlməsi yerinə işlədilmişdir. Məsələn, "müşriki əfv etmərəm" buyurulmuşdur ki, kafirlərin heç bir növünü əfv etmərəm deməkdir. Bidət sahiblərindən həddi aşmayıb, kafir olmayanları müsəlmandır. **"Əhli qiblə"**dirlər. Lakin bunların İslam dininə zərərləri kafirlərin zərərlərindən daha çoxdur. Məzhəbsiz din adamları, Mevdudiçilər, sələfi deyilən İbni Teymiyyəçilər, Seyyid Kutbçular belədirlər. Hindistan alimlərindən müfti Mahmud ibn Abdülqayyur Pişavüri (rahiməhullahü təala) 1264-cü [m. 1848] ildə nəşr etdirdiyi **"Huccət-ül-İslam"** adlı kitabında, **"Tuhfət-ül-arabi vəl-acəm"** risaləsindən götürərək fars dilində deyir ki, müsəlmanların müctəhidləri təqlid etmələri vacibdir. Çünki Nəhl surəsinin qırx üçüncü və Ənbiya surəsinin yeddinci ayələrində məalən, **"Alimlərdən soruşub öyrənin!"** və Tövbə surəsinin yüzüncü ayəsində məalən, **"İlk Muhacirlərdən, Ənsardan və bunlara tabe olanlardan Allah razıdır"** buyurulmuşdur. Bu ayələr təqlid etməyi əmr buyurmaqdadır. Muaz bin Cəbəl (radıyallahu təala anh) Yəmənə hakim olduqda, "Kitabda və hədisi-şəriflərdə tapa bilmədiyim zaman ictihad edər, anladığıma görə əmr edərəm" dedi. Rəsulullah (sallallahu təala aleyhi və səlləm) də bu cavabı bəyənərək Allahu təalaya həmd eylədi. Misirdəki maliki alimlərindən Əhməd Şihabüddin Qarafi (rahimə-hullahü təala) 684-cü [m. 1285] ildə vəfat etmişdir. Bu böyük alimin "Yeni müsəlman olanın dilədiyi bir alimi təqlid etməsi lazım olduğunda

icma hasil olmuşdur” dediyini, Cəlalüddini Süyuti (rahimə-hullahü təala) **“Cəzil-ül-məvahib”** kitabında bildirməkdədir. Hədis İmamının səhih dediyi bir hədisə müsəlmanların səhih dəmələri caiz olduğu kimi, fiqh İmamının səhih dediyi bir hökmə səhih demələri də caiz olur. Nisa surəsinin əlli səkkizinci ayəsində məalən, **“İxtilaf etdiyiniz din işlərində kitaba və sünnətə müraciət edin!”** buyurulmuşdur. Bu əmr müctəhid olan alimə əmrdir. İbni Hazmın və dində reformçuların “Diri və ya ölü, heç kimsəni təqlid halal deyildir. Hər kəsin ictihad etməsi lazımdır” sözlərinin qiyməti yoxdur. Çünki bunlar Əhli sünnət deyildir. [İbni Hazmın məzhəbsiz olduğu, doğru olmadığı **“Əşədd-ül-cihad”** kitabımızın sonunda yazılmışdır.] Müftinin müctəhid olması vacibdir. Mütləq müctəhid olmayan müftinin fətva verməsi haramdır. Bunun müctəhidlərin fətvalarını nəql etməsi caizdir. Müctəhid olmayan müftidən yeni bir fətva istəmək caiz deyildir. **“Kifayə”**də oruc bəhsində deyilir ki, “Müctəhid olmayanın eşitdiyi bir hədisə uyması caiz deyildir. Bu hədis mənsuh (qüvvədən düşmüş) və ya təvilli ola bilər. Fətva belə deyildir. **“Taqrir”**də də belə yazılmışdır.” **“Tuhfə”**dən tərcümə tamamlandı.]

Hıqdın səbəblərindən biri qəzəbdir. Qəzəblənən, hirslənən kimsə intiqam ala bilmədikdə qəzəbi Hıqd halını alar. Qəzəb qanın hərəkətinin artmasından [təzyiqin artmasından] meydana gəlir. Allah üçün qəzəbə gəlmək yaxşıdır. Dinə olan qeyrətindəndir.

***Rəsulullah gündüz olurdu saim,***
***Gecə də namaza olurdu qaim.***
***Ümmət isən ol Müctəbaya,***
***Sünnətə, məkruha diqqət et daim.***

## ŞƏMATƏT

17 – Şəmatət, başqasına gələn bəlaya, zərərə sevinməkdir. Hədisi-şərifdə, “**Din qardaşınıza şəmatət etməyin! Şəmatət etsəniz, Allahu təala bəlanı ondan alıb sizə verər”** buyuruldu. Zalımın zülmündən, şərindən qurtulmaq üçün onun ölümünə

sevinmək şəmatət olmaz. Düşmənin başına gələn ölümdən başqa bəlalara sevinmək şəmatət olur. Hələ bəlaların gəlməsinə özünün səbəb olduğunu düşünərək sevinmək, məsələn, duasının qəbul olduğuna sevinmək daha pisdir. Ucba (özünü bəyənmək) düşməsinə səbəb olur. Ona gələn bəlanın özü üçün məkr (hiylə) və istidrac ola biləcəyini düşünmək lazımdır. Ondan bəlanın getməsi üçün dua etmək lazımdır. Hədisi-şərifdə, **"Mömінin din qardaşı üçün arxasından etdiyi xeyir-dua qəbul olur. Bir mələk, Allah bu yaxşılığı sənə də versin, amin, deyər. Mələyin duası rədd edilməz"** buyuruldu. Düşmən zalım olub, ona gələn bəla başqalarına zülm etməsinə mane olursa, bəlanın gəlməsinə sevinmək şəmatət olmaz, günah olmaz. Din qeyrəti olur. Din qeyrəti imanın qüvvətli olduğunu göstərir. Allah üçün qeyrət etmək yaxşıdır. Heyvani arzular üçün qeyrət etmək yaxşı deyildir. Zalıma da bəla gəlməsinə sevinmək yenə yaxşı deyildir. Lakin başqalarına zülm etməsinə mane olduğu üçün və digər zalımların da ibrət almaları üçün caiz olur.

## HİCR

18 – Hicr, dostluğu tərk etmək, küsülü olmaq deməkdir. Hədisi-şərifdə, **"Mömінin mömінə üç gündən çox hicr etməsi halal olmaz. Üç gecədən sonra onun yanına gedib salam verməsi vacib olur. Salamına cavab verərsə, savabda ortaq olurlar. Verməzsə günah ona olur"** buyuruldu. İstər kişi, istər qadın olsun dünya işləri üçün mömінin mömіndən inciməsi, yəni onu tərk etməsi, aradakı bağlılığı kəsməsi caiz deyildir. Zimmi, yəni qeyri-müsəlman müamələtda müsəlman kimidir. İbadətlərdən və nikahdan başqa olan işlərə **"Müamələt"** deyilir.

[Qeyri-müsəlman vətəndaşlardan da dünya işləri üçün incik olmaq caiz deyildir. Onların da gülər üzlə, şirin dillə könüllərini almaq, incitməmək, haqlarını ödəmək lazımdır. İstər müsəlman, istər kafir olsun, istər İslam məmləkətində, istər darül hərbdə olsun, harada olursa olsun, heç bir insanın malına, canına və şərəfinə, namusuna toxunmaq caiz deyildir. İslam məmləkətində yaşayan qeyri-

müsəlmanlar və başqa məmləkətlərdən gələn qeyri-müsəlman turistlər, qeyri-müsəlman tacirlər, müaməlatda müsəlmanların haqq və hürriyyətlərinə malikdirlər. Öz dinlərinin vəzifələrini etməkdə, ibadətlərini yerinə yetirməkdə sərbəstdirlər. İslamiyyət qeyri-müsəlmanlara də bu hürriyyəti vermişdir. Müsəlman, Allahın əmrlərinə tabe olmalı, günah işləməməlidir. Hökumətin qanunlarına qarşı gəlməməli, cinayət işləməməlidir. Fitnə çıxmasına səbəb olmamalıdır. Müsəlmanlara və qeyri-müsəlmanlara hər yerdə yaxşılıq etməli, hər kəsin haqqına riayət etməlidir. Heç kimə zülm, işkəncə etməməlidir. Müsəlmanlığın gözəl əxlaqını, şərəfini, hər yerdə hər kəsə göstərməli, hər millətin İslam dinini sayıb və hörmət etməsinə səbəb olmalıdır].

Küsülü olana üç gündən öncə gedib barışmaq daha yaxşıdır. Çətinlik olmaması üçün üç gün icazə verilmişdir. Daha sonra günah başlar və gün keçdikcə artar. Günahın artması barışana qədər davam edər. Hədisi-şərifdə, **“Səndən küsənə get, barış! Zülm edəni əfv et. Pislik edənə yaxşılıq et!”** buyuruldu. **“Əssələmü aleyküm”** deyənə on savab verilir. Əssələmü aleyküm və rahmətullah deyənə iyirmi savab verilir. Əssələmü aleyküm və rahmətullah və bərəkətüh deyənə otuz savab verilir. Cavab verməkdə də belədir. Üç gündən artıq küsülü qalan şəfaət olunmazsa, əfv olunmazsa, Cəhənnəmdə əzab görəcəkdir. Günah işləyənə ona nəsihət olmaq niyyəti ilə hicr etmək caizdir, hətta müstəhəbdir. Allahu təala üçün incimək olar. Hədisi-şərifdə, **“Əməllərin, ibadətlərin ən qiymətlisi hubbi fillah və buğdı fillahdır”** buyuruldu. Hubbi fillah, Allahu təala üçün sevmək deməkdir. Buğdı fillah, Allahu təala üçün sevməmək, incik olmaq deməkdir. Allahu təala Musa aleyhissəlamdan soruşdu: “Mənim üçün nə etdin?” “Sənin üçün namaz qıldım, oruc tutdum, zəkat verdim, ismini çox zikr eylədim”, dedikdə, Allahu təala, “Namaz, sənə burhandır (işıq). Pis iş etməkdən qoruyar. Oruc, qalxandır. Cəhənnəm atəşindən qoruyar. Zəkat da məhşər yerində kölgə verər, sənə rahatlıq verər. Zikr, məhşərdə qaranlıqdan qurtarar, işıq verər. Mənim üçün nə etdin?” buyurdu. “Ya Rəbb! Sənin üçün olan işin nə olduğunu mənə bildir”, deyə yalvardıqda, “Ya Musa! Dostlarımı sevdinmi? Düşmənlərimdən əlaqəni kəsdinmi?” buyurdu. Musa aleyhissəlam

Allahu təalanın ən çox sevdiyi ibadətin hubbi fillah və buğdı fillah olduğunu anladı. Günah işləyəni, qəbahət edəni uzun zaman hicr eyləmək caizdir. Əhməd bin Hanbəlin "rahimə hullahü təala" haramdan gəldiyi bilinən hədiyyəni qəbul etdikləri üçün əmisini və oğullarını hicr eylədiyi məşhurdur. Rəsulullah (sallallahu aleyhi və səlləm) Təbük qəzasına gələ bilməyən üç nəfəri və zövcələrini hicr eyləmişdir.

***Allaha təvəkkül edənin yavəri Haqdır.***
***Naşad könül bir gün olar şad olacaqdır.***

## CÜBN

19 – Cübn, qorxaqlıq deməkdir. Qəzəbin, sərt davranmağın lazımlı miqdarına **"Şücaət"** deyilir. Lazımından az olmasına, zəif olmasına **"Cübn"** deyilir. Cübn, pis əxlaqdır. İmamı Muhamməd ibn İdris Şafii (rahimə-hullahü təala) buyurur ki, "Şücaət göstərmək lazım olan yerdə qorxaqlıq edən eşşəyə bənzər. Üzr istənilən kimsə qəbul etməzsə şeytana bənzər". Qorxaq olan zövcəsinə və əqrəbasına qarşı qeyrətsizlik və namusuzluq göstərər. Onları qoruya bilməz. Zillətə və zülmə boyun əyər. Haram işləyəni gördükdə susar. Başqalarının malına tama edər. İşində müvəffəq olmaz. Verilən vəzifənin əhəmiyyətini anlamaz. Allahu təala Tövbə surəsində şücaəti, qəhrəmanlığı mədh edir. Nur surəsində zina edənlərə had cəzası verilməsində mərhəmət olunmamasını əmr edir.

Hədisi-şərifdə, **"Sevgili qızım Fatimə oğurluq edərsə əlini kəsərəm!"** buyuruldu. Allahu təala Fəth surəsində Əshabi-kirama (radıyallahu təala anhüm əcmain), **"Kafirlərə qəzəb edərlər",** hərbdə sərt davranarlar deyərək mədh edir. Tövbə surəsi, yetmiş dördüncü ayəti-kəriməsinin məali-alisi, **"Kafirlərə qarşı sərt ol!".** Yəni "hücum etdikləri zaman qorxma"dır. Bir hədisi-şərifdə, **"Ümmətimin xeyirlisi dəmir kimi dözümlü olanıdır"** buyuruldu. İslama və müsəlmanlara düşmənlik edənlərə, hücum edənlərə qarşı sərt olmaq lazımdır. Bunlara qarşı qorxaq olmaq caiz deyildir. Qorxaraq qaçmaq Allahu təalanın təqdirini dəyişdirməz. Əcəl

gəldikdə Əzrail aleyhissəlam insanı harada olursa olsun tapar. Özünü təhlükəyə atmaq da caiz deyildir. Təhlükəli yerdə yalnız qalmaq, yalnız gəzmək günahdır.

## TƏHƏVVÜR

20 – Qəzəbin, sərtliyin həddən çox və zərərli olmasına **"Təhəvvür"** deyilir. Təhəvvür sahibi hiddətli, sərt olur. Bunun əksinə hilm, mülayimlik deyilir. Həlim insan qəzəbə səbəb olan şeylər qarşısında hirslənməz, həyəcanlanmaz. Qorxaq özünə zərər verər. Qəzəbli kimsə isə həm özünə, həm də başqalarına zərər verər. Təhəvvür, insanın ağlını aparır, küfrə qədər gətirib çıxarır. Hədisi-şərifdə, **"Qəzəb imanı pozar"** buyuruldu. Rəsulullahın (sallallahu aleyhi və səlləm) dünya üçün qəzəbləndiyi görülmədi. Allah üçün qəzəblənərdi. Qəzəb sahibi qarşısındakının da ona qarşılıq verəcəyini öncədən düşünməlidir. Qəzəblənən kimsənin sinirləri pozulur, qəlb xəstəsi olur. Bu pozğunluq zahirinə də sirayət edərək çirkin və qorxunc bir hal alır.

Qəzəbi yenməyə **"Kazm"** deyilir. Kazm etmək çox savabdır. Kazm sahibinə, yəni qəzəbinə üstün gələnə Cənnət müjdələndi. Allah rızası üçün kazım olan şəxs qarşısındakını əfv edib, ona qarşılıq verməzsə, Allahu təala onu çox sevər. Cənnətin bunlar üçün hazırlanmış olduğunu bildirmişdir. Hədisi-şərifdə, **"Bir kimsə Allahu təalanın rızası üçün qəzəbini dəf edərsə, Allah da ondan əzabını dəf edər",** buyuruldu**.** Hədisi-şərifdə **"Bir müsəlmanda üç şey olarsa, Allahu təala onu mühafizə və himayə edər, onu sevər, mərhəmət edər. Nemətə şükr etmək, zalımı əfv etmək, qəzəbləndikdə, qəzəbinə qalib gəlmək"** buyuruldu. Nemətə şükr etmək onu İslamiyyətə uyğun olaraq istifadə etmək deməkdir. Hədisi-şərifdə, **"Qəzəblənən bir insan istədiyini etməyə qadir olduğu halda mülayim davranarsa, Allahu təala onun qəlbini əminlik və iman ilə doldurar"** və **"Bir kimsə qəzəbini örtərsə, Allahu təala onun eyblərini, qəbahətlərini örtər"** buyuruldu. İmam Qazali (rahimə-hullahü təala), "Hilm sahibi olmaq, qəzəbinə üstün gəlməkdən daha qiymətlidir" buyurdu. Hədisi-şərifdə, **"Ya**

**Rəbb! Mənə elm ver, hilm ilə zinətləndir, təqva ehsan eylə! Afiyət ilə məni gözəlləşdir”** buyuruldu. Abdüllah ibni Abbasa (radıyallahu təala anhüma) birisi söydü. Bunun qarşılığında, “bir ehtiyacın varsa, sənə yardım edim”, buyurdu. Adamcığaz başını önə əyərək və utanaraq üzr istədi. Həzrət Hüseynin oğlu Zeynəl Abidin Əlini (radıyallahu təala anhüma) bir kimsə söydü. Paltarını çıxarıb ona hədiyyə eylədi. İsa aleyhissəlam yəhudilərin yanından keçərkən ona çox pis şeylər söylədilər. Onlara gözəl və xoş cavablar verdi. “Onlar sənə pislik edir, sən onlara yaxşı şeylər söyləyirsən” dediklərində, “hər kəs başqasına yanında olandan verir” buyurdu. Həlim, səlim kimsə daim nəşəli, rahat olur. Onu hər kəs mədh edər.

Hədisi-şərifdə, **“Qəzəb, şeytanın vəsvəsəsindən hasil olar. Şeytan atəşdən yaradılmışdır. Atəş su ilə söndürülür. Qəzəbləndikdə dəstəmaz alın!”** buyuruldu. Bunun üçün qəzəbləndikdə əuzü bəsmələ və iki qul əuzünü oxumaq lazımdır. İnsan, qəzəbləndikdə ağlı örtülür. İslamiyyətdən kənara çıxır. Qəzəblənən şəxs ayaqdadırsa oturmalıdır. Hədisi-şərifdə, **“Qəzəblənən kimsə ayaq üstədirsə otursun. Qəzəbi davam edərsə, yan tərəfi üstə uzansın!”** buyuruldu. Ayaq üstə olanın intiqam alması asandır. Oturduqda azalır. Uzandıqda daha da azalır. Qəzəb kibrdən doğar. Uzanmaq kibrin azalmasına səbəb olar. Qəzəbləndikdə, **“Allahumməğfir li-zənbi və əzhib qayza qalbi və əcirni minəşşeytan”** oxumaq hədisi-şərifdə əmr olundu. Mənası, “Ya Rəbb! Günahımı əfv eylə. Məni qəlbimdəki qəzəbdən və şeytanın vəsvəsəsindən qurtar” deməkdir. Qəzəbə səbəb olan insana yumşaq davrana bilməyən kimsə onun yanından uzaqlaşmalı, onunla görüşməməlidir.

Nə dünya üçün, nə də axirət üçün heç kimsəyə hirslənməməlidir. **“Lə tağdab”** hədisi-şərifi hirslənməyi, qəzəblənməyi qadağan etməkdədir. Bir kimsə qəzəblənərsə, yəni hirslənərsə, bütün sinirləri pozular. Bəzi üzvləri xəstə olar. Həkimlər ona əlac tapa bilməzlər. Bunun yeganə əlacı, **“Lə tağdab”** hədisi-şərifidir. Hirslənən kimsə sözləri ilə, hərəkətləri ilə yanındakıları incidər. Onlar da əsəb xəstəliyinə tutular. Evdə rahatlıq, hüzur qalmaz. Ailənin dağılmasına, cana qəsd edilməsinə belə səbəb olar. Bir evdə qəzəblənən kimsə yoxdursa, orada səadət, rahatlıq və hüzur,

nəşə vardır. Hirslənən kimsə varsa, orada rahatlıq, hüzur və nəşə olmaz. Kişi ilə zövcəsi arasında və ana ilə övladı arasında yola getməməzlik, hətta düşmənlik əskik olmaz. Əhkamı-İslamiyyəyə tabe olmağın səadət, rahatlıq və nəşə gətirəcəyi buradan da aydın olur. Əhkamı-İslamiyyəyə tabe olan kafirlər də dünyada səadətə qovuşurlar.

Cahillər, axmaqlar qəzəbə və təhəvvürə şücaət, kişilik, izzəti nəfs, qeyrət və namus deyirlər. Bu gözəl adlarla pis xüsusiyyət olan qəzəbi bəzəyir, gözəlləşdirirlər. Qəzəblənmənin yaxşı olduğunu deyirlər. Bunu mədh etmək üçün böyüklərin qəzəbləndiklərini göstərən hekayələr də danışırlar. Belə etmək cahillikdir. Ağlın nöqsan olduğunu göstərir. Bunun üçündür ki, xəstə sağlam olandan, qadın kişidən, yaşlı da gəncdən daha tez hirslənir. Otuz yaşından kiçik olana gənc, otuz ilə əlli arasında olana yetkin adam, əlli yaşından yuxarı olana şeyx, yəni yaşlı [yetmişdən sonra piri fani] deyilir.

İslamiyyətdən, kitabdan götürməyib, öz başından çıxarıb sərt, hiddətli nəsihət verəni dinləməmək də onun qəzəbinə səbəb olur. Bunun əlacı doğrunu mülayim və şirin söyləməkdir. Həzrəti Həsən və Hüseyn (radıyallahu təala anhüma) çöldə gedirdilər. Bir yaşlının dəstəmaz aldığını gördülər. Dəstəmazı doğru almır, şərtlərinə uymurdu. Yaşlı olduğu üçün belə dəstəmazın səhih olmadığını deməyə sıxıldılar. Yanına gedərək, “Mübarək əmi! Bir-birimizdən daha yaxşı dəstəmaz aldığımızı söyləyirik. Bir dəstəmaz alaq. Hansımızın haqlı olduğunu bizə bildir”, dedilər. Öncə Həsən, sonra Hüseyn gözəl bir dəstəmaz aldılar. Yaşlı adam diqqətlə baxdı. “Övladlarım! Dəstəmaz almağı indi sizdən öyrəndim”, dedi. İbrahim aleyhissəlam iki yüz məcusiyə ziyafət verdi. “Bizə nə əmr edirsən, yerinə yetirək” dedilər. “Sizdən bir istəyim var”, buyurdu. “O nədir?” dediklərində, “Mənim Rəbbimə bir dəfə səcdə etməyinizi istəyirəm” dedi. Aralarında danışdılar. “Bu yaşlının ehsanları, ziyafətləri məşhurdur. Bunu üzməyib, bir səcdə edər, sonra gedib yenə tanrılarımıza tapınarıq. Bir zərəri olmaz” dedilər. Bunlar səcdədə ikən İbrahim aleyhissəlam, “Ya Rəbb! Gücümün çatdığı bu qədərdir! Daha artığını etmək əlimdən gəlmir. Bunları hidayətə, səadətə qovuşdurmaq ancaq sənin qüdrətindədir. Bunlara müsəlmanlıq nəsib eylə!” dedi. Duası qəbul olub, hamısı

müsəlman oldu. Haram işləyəcək kimsəyə gizlicə nəsihət edilir. Haram işləməkdə olana xoşluqla elə yerində söylənilir. Hər kəsə öncə gizli, tənhalıqda nəsihət vermək daha təsirli olur.

Birinin sözünü yanlış anlamaq da qəzəbinə səbəb olur. Belə zamanlarda az və açıq söyləmək, şübhəli kəlmələr işlətməmək lazımdır. Bir şeyi gizli, üstü örtülü anlatmaq dinləyənə sıxıntı verər, onu incidər. Əmri maruf etməyin üç şərti vardır: Birincisi, Allahu təalanın əmrini və qadağasını bildirməyə niyyət etməkdir. İkincisi, söylədiyinin sənədini, qaynağını bilməkdir. Üçüncüsü, hasil olacaq sıxıntılara səbr etməkdir. Mülayim söyləmək, sərtlik etməmək lazımdır. Sərt söyləyən və münaqişə edən fitnə çıxmasına səbəb olur. Həzrəti Ömər xəlifə ikən Abdullah ibni Məsud ilə (radıyallahu anhum) bir gecə Mədinə içində dolaşırdılar. Bir qapıdan musiqi, mahnı oxuyan qadın səsi eşitdi. Qapının dəliyindən içəri baxdı. Önündə şərab şüşəsi, qarşısında müğənni qız olan yaşlı adam gördü. Dərhal pəncərədən içəri girdi. “Ya Əmirəlmöminin! Allahu təalanın rızası üçün mənə qulaq asarsan?” dedikdə, “Söylə görək”, buyurdu. “Mən Allahu təalaya bir üsyan etdim. Lakin sən onun üç əmrinə üsyan etdin”, dedi. “Nədir onlar”? dedikdə, “Allahu təala, başqasının evini güdməyin, buyurur. Sən qapıdan içəri baxdın. Allahu təala, başqasının evinə izn almadan girməyin, buyurdu. Sən iznsiz girdin. Allahu təala, evlərə qapılarından girin və salam verin buyurdu, sən isə pəncərədən girdin və salam vermədin”, dedi. Həzrəti Ömər (radıyallahu təala anh) buna ədalət ilə və insaf ilə cavab verərək, “Doğru söylədin” dedi və ondan üzr istədi. Ağlayaraq bayıra çıxdı.

Nəsihət verənə və bütün müsəlmanlara hüsni-zənn etmək, yaxşı qarşılamaq lazımdır. Sözlərini mümkün olduğu qədər yaxşı yerə yozmaq lazımdır. Müsəlmanın xeyirli və saleh olduğuna inanmaq ibadət olur. Bir müsəlmana sui-zənn edərək ona inanmamaq pis əxlaqlı olmağı göstərir. Eşidilən sözü anlamağa çalışmalı, anlaya bilmədiyini soruşmalıdır. Söz sahibinə dərhal sui-zənn etməməlidir. Şeytanın qəlbə gətirdiyi vəsvəsələrdən ən çox nail olduğu, bacardığı sui-zənn vəsvəsəsidir. Sui-zənn etmək haramdır. Bir sözdən yaxşı məna çıxarmağa imkan olmazsa, bunun xəta ilə, yanlışlıqla və ya unudaraq söylənə biləcəyi düşünülməlidir.

Bir yoxsul bir zəngindən bir şey istəyib, zəngin vermədikdə, hər ikisi də qəzəblənə bilər.

Bir işlə məşğul olana, düşüncəli olana, üzüntülü olana, sıxıntıda olana bir şey söyləmək, bir şey soruşmaq onu qəzəbləndirməyə səbəb ola bilər. Uşağın ağlaması, çığırması, heyvanın bağırması da belədir. Belə qəzəblənmək çox çirkindir. Cansızların hərəkətindən qəzəblənənlər görülmüşdür. Bu daha pisdir. Qoyduğu yerdən sürüşərsə, balta vurduqda qırılmazsa, hirslənərək söyən, vuran, dağıdan, yandıran kimsələr görülmüşdür. Özü etdiyinə hirslənən, bunun üçün özünü söyən, özünü vuran da yox deyildir. İbadətdə qüsur etdiyi üçün özünə hirslənmək yaxşıdır. Dinində qeyrət olar, savab olar. Əmrləri və qadağaları səbəbi ilə hökumətə, hökumət rəhbərinə, Rəsulullaha (sallallahu təala aleyhi və səlləm) və hətta Allahu təalaya qarşı qəzəblənmək hamısından pisdir. Küfrə səbəb olar. "**Qəzəb imanı pozar"** hədisi-şərifi Allahu təalaya, Rəsulullaha qarşı qəzəbin küfr olduğunu göstərməkdədir.

Haram işləyəni gördükdə qəzəblənmək yaxşıdır. Din qeyrətindən irəli gəlir. Lakin hirsləndikdə ağıldan və İslamiyyətdən kənara çıxmamaq lazımdır. Ona kafir, münafiq, dəyyus və digər əxlaqsız, çirkin şeylər söyləmək haram olar. Söyləyənin təzir edilməsi, cəzalandırılması lazım olar. Haram işləyəni görənin buna cahil və ya axmaq deməsinə izn verilmişdirsə də, mülayim, xoş söyləyərək nəsihət vermək yaxşı olar. Hədisi-şərifdə, **"Allahu təala hər zaman mülayim söyləməyi sevər"** buyuruldu. Haram işləyəni, qanunlara qarşı gələni hökumət məmurunun, polisin güc sərf edərək qarşısını alması lazımdır. Lakin lazımından artıq döyməsi, işkəncə etməsi zülm olar, günah olar. Dövlət məmuru yoxdursa, gücü yetənin də qarşısını alması, təzir etməsi lazım olar. Ölüm cəzası, evini sökmək kimi cəzalar ancaq hökumət və hakim tərəfindən verilir. Lazımından çox cəzalandırmaq zülm olar. Muhtəsiblərin, yəni əmri məruf və nehyi münkər edən hökumət məmurlarının işkəncə etmələri haramdır.

Qəzəbin müqabili, qarşılığı hilmdir. Hilm qəzəbini yenməkdən daha yaxşıdır. Hilm qəzəblənməmək deməkdir. Ağlın çox olmasının əlamətidir. Hədisi-şərifdə, **"Qəzəbə səbəb olan şey qarşısında hilm göstərəni Allahu təala sevər"** və **"Allahu təala həya,**

**hilm və iffət sahiblərini sevər. Əxlaqsız sözlər söyləyənləri və sırtıqlıq edərək dilənənləri sevməz”** buyuruldu. İffət, başqasının malına göz dikməməkdir. Fuhş, çirkin, ayıb şeylərdir. Rəsulullah (sallallahu aleyhi və səlləm), **“Ya Rəbb! Mənə elm, hilm, təqva və afiyət ehsan eylə!”** duasını çox söylərdi. Elmi nafi - kəlam, fiqh və əxlaq elmləridir. Afiyət - dinin və etiqadın bidətlərdən, əməlin və ibadətin afətlərdən, nəfsin şəhvətlərdən, qəlbin həva və vəsvəsədən, bədənin xəstəliklərdən salamat olması, qurtulması deməkdir. Rəsulullahdan (sallallahu təala aleyhi və səlləm) duaların ən gözəli hansıdır, deyə soruşulduqda, **“Allahu təaladan afiyət istəyin. İmandan sonra afiyətdən daha böyük nemət yoxdur”** buyurdu. [Afiyətə qovuşmaq üçün çox istiğfar etmək lazımdır.] Hədisi-şərifdə, **“Elm və səkinə sahibi olun! Öyrənərkən və öyrədərkən mülayim söyləyin! Elm ilə təkəbbür etməyin!”** buyuruldu. Səkinə ağır başlı, vüqar sahibi olmaqdır. Hədisi-şərifdə, **“İslamiyyətə tabe olan və mülayim olanı Cəhənnəm atəşi yandırmaz”,** və **“Mülayim olmaq bərəkət gətirir. İşində həddi aşmaq və tənbəllik etmək qəflətə səbəb olur”** buyuruldu. Hədisi-şərifdə, **“Rıfq sahibi olmayan insandan xeyir gəlməz!”** və **“Rıfk insana zinət verər, qüsurlarını aparar”** buyuruldu.

Düşmənə hirslənməmək, alçaq səslə “Allah cəzanı versin” demək lazımdır. Allahu təala haqsız olana çox acı cəza verər.

Hədisi-şərifdə, **“Elm, öyrənməklə, hilm də qeyrət ilə hasil olar. Allahu təala xeyirli şey üçün çalışanı məqsədinə qovuşdurar. Pislikdən çəkinəni ondan qoruyar”** buyuruldu.

## QADR

21 – Qəzəbə səbəb olanlardan biri də **“Qadr”**, yəni əhdində və misaqında durmamaqdır. Bir tərəfin söz verməsinə **“Vəd”** deyilir. İki nəfərin sözləşməsinə **“Əhd”** deyilir. And içməklə qüvvətləndirilən vədə **“Misaq”** deyilir. Qarşılıqlı sözləşənə əvvəlcədən xəbər vermədən sözünü pozmağa qadr deyilir. Dövlət rəisi kafirlərlə etdiyi muahədəni (sözləşməni) pozmaq lazım olduğunu anlasa, onlara xəbər verməsi vacibdir. Xəbər vermədən əvvəl

pozması caiz deyildir. Hədisi-şərifdə **“Qadr edən qiyamət günü pis şəkildə cəzasını görəcək”** buyuruldu. Qadr etmək haramdır. Kafirlərə verilən əhdi qorumaq vacibdir.

Hədisi-şərifdə, **“Əmin olmayan insanda xeyir yoxdur. Əhdini pozan insanda din yoxdur”** buyuruldu. Bu hədisi-şərif əmanətə xəyanət edənin imanı kamil olmaz, buna əhəmiyyət verməzsə imanı qalmaz, deməkdir.

---

**Allahummə innəkə Afüvvün, Kərimün tühıbbül afvə fafü anni!**

## XƏYANƏT

22 – Qəlb xəstəliklərinin iyirmi ikincisi xəyanətdir. Xəyanət etmək də qəzəbə səbəb olar. Xəyanət də haramdır. Münafiqlik əlamətidir. Xəyanətin ziddi əmanətdir, əmin olmaqdır. Xəyanət, birisinə özünü əmin tanıtdıqdan sonra o əminliyi pozan bir iş görmək deməkdir. Mömin, hər kəsin malını, canını etibar etdiyi insandır. Əmanət və xəyanət malda olduğu kimi sözdə də olur. Hədisi-şərifdə, “Məşvərət edilən kimsə əmindir” buyuruldu. Yəni, onun doğru danışacağına və soruşulanı başqalarından gizləyəcəyinə əmin olunur, güvənilir. Onun doğru söyləməsi vacibdir. İnsan malını əmin olduğu insanlara həvalə etdiyi kimi doğru danışacağına əmin olduğu birisi ilə məsləhətləşir. Ali-İmran surəsi 159-cu ayətində məalən, **“Görəcəyin bir işi əvvəlcədən məsləhətləş”** buyuruldu. Məsləhətləşmək, məşvərət etmək insanı peşman olmaqdan qoruyan bir qala kimidir. Məsləhət alınan kimsənin insanların halını, zamanın və o yerin şərtlərini bilməsi lazımdır. Buna siyasət elmi deyilir. Bundan başqa ağlı, fikri qüvvətli, uzaq görən, hətta, səhhəti yerində olması lazımdır. Məsləhət edilən kimsənin bilmədiyini və ya bildiyinin əksini söyləməsi günahdır. Xəta ilə söyləməsi günah olmaz. Yuxarıdakı şərtlərə sahib olmayan birisi ilə məsləhətləşilərsə, hər iki tərəfə günah olar. Din və dünya işlərində bilməyərək fətva verənə mələklər lənət edər. Bir nəfər zərərli olduğunu bilərək bir əmr versə xəyanət etmiş olar.

**“Hadiqa”**da deyilir ki, Abdullah ibn Məsud (radıyallahu təala anh) buyurdu ki, “Dinimizdən ilk olaraq ayrılacağınız, əlinizdən qaçıracağınız şey əmanət olacaq. Son olaraq əlinizdən çıxacaq olan şey namazdır. Dini olmadığı halda namaz qılan insanlar olacaqdır”. Hədisi-şərifdə, **“Yoldaşlıq etdiyi insanı öldürən mənim ümmətimdən deyil. Öldürülən kafir də olsa yenə belədir”** buyuruldu.

## VƏDİNİ POZMAQ

23 – Vədində durmamaq da qəzəbə səbəb olur. Bir tərəfli verilən sözə **“Vəd”**, iki tərəfli sözləşməyə **“Əhd”** deyildiyini yuxarıda bildirmişdik. Zərər, əzab verəcəyini söz verməyə **“Vaid”** deyilir. Vaidində durmamağa **“kərəm”** deyilir, yəni ehsan olur. Yalan olaraq vəd etmək haramdır. Belə vədi pozmaq da ayrıca günahdır. Yerinə yetirmək isə yalançılıq günahını yox edər. Fasid “bey” (satış) də belədir. Bu beyi xitam etmələri, satışdan vaz keçmələri vacib olur. Xitam edib tövbə edincə günahları qalmaz. Bu satışı xitam etməzlərsə günah iki qat olur. Vədi incaz etmək yəni, vədinə vəfa göstərmək, yerinə yetirmək lazımdır.

Hədisi-şərifdə, **“Münafiqliyin əlaməti üçdür: Yalan danışmaq, vədinə sadiq qalmamaq, əmanətə xəyanət etmək”** buyuruldu. Vədində durmağa gücü yetməzsə, münafiqlik əlaməti olmaz. Ona mal və ya söz, yaxud sirr əmanət olunan kimsənin bunlara xəyanət etməsi münafiqlik olar.

Buxaridə yazılan Amr ibn Asın (radıyallahu təala anh) oğlunun bildirdiyi hədisi-şəriflərdə, **“Dörd şey münafiqlik əlamətidir: Əmanətə xəyanət etmək, yalan danışmaq, vədini pozmaq və əhdinə qadr etmək** (sadiq qalmamaq) **və məhkəmədə doğrunu söyləməmək”** buyuruldu. İbni Hacər buyurdu ki, nifaq yəni münafiqlik, zahirin batinə (xaricin daxilə) uyğun gəlməməsi deməkdir. Sözü özünə uyğun gəlməz. Etiqad edilməsi lazım gələn şeylərdə münafiqlik etmək küfrdür. İşlərində və sözlərində münafiqlik etmək haram olar. Etiqadda, imanda münafiqlik digər küfrlərdən daha pisdir. İfa etmək, yerinə yetirmək niyyəti ilə vəd etmək caiz-

dir, hətta savabdır. Belə vədi ifa etmək vacib deyildir, müstəhəbdir. İfa etməmək tənzihən məkruh olar. Hədisi-şərifdə **“Bir kimsə yerinə yetirmək niyyəti ilə verdiyi sözü tuta bilməzsə günah olmaz”** buyuruldu. Hənəfi və Şafii məzhəblərində əhdi pozmaq da üzrsüz məkruh, üzrlü caizdir. Lakin pozacağını əvvəlcədən xəbər verməsi vacibdir. Hanbəli məzhəbində vədə vəfa vacibdir. Yerinə yetirməmək haram olar. Edilməsi dörd məzhəbdə də səhih olan bir şeyi etmək təqva olar.

Hər müsəlmanın dörd məzhəbdə olanların hamısını sevməsi, hamısına xeyr-dua etməsi, məzhəbdə təassub (haqq məzhəbləri pisləmək) etməməsi vacibdir. Dörd məzhəbi **“Təlfiq”** etmək söz birliyi ilə caiz deyildir. Təlfiq bir işi, bir ibadəti edərkən dörd məzhəbin asanlıqlarını seçib toplamaq deməkdir. Edilən bu iş dörd məzhəbin heç birində səhih deyildir. Bir məzhəbin asanlıqlarını toplayaraq əməl etmək caizdir.

[Bir ibadəti, bir işi etmək üçün dörd məzhəbdən birini təqlid etməyə niyyət etmək, o məzhəbə tabe olaraq etmək lazımdır. Dörd məzhəbin hər birində bir işin edilməsi üçün bir asan yol, bir də çətin yol vardır. Birinci yola **“Ruhsat”**, ikincisinə **“Azimət”** yolu deyilir. Qüvvətli, halı əlverişli olanın azimət ilə əməl etməsi daha xeyirlidir. Çətin olan işi etmək nəfsə daha ağır gələr, nəfsi daha çox əzər, zəiflədər. İbadətlər nəfsi zəiflətmək üçün, qırmaq üçün əmr olundu. Çünki nəfs insanın da, Allahın da düşmənidir. Onu zəiflədərək azmasının qarşısını almaq lazımdır. Lakin tam olaraq öldürmək olmaz. Çünki bədənin xidmətçisidir. Axmaq və cahil xidmətçidir. Zəif, xəstə, çətin vəziyyətdə olan insanın ibadətlərində, işlərində azimət yolunu tərk etməsi, ruhsat yolu ilə əməl etməsi lazımdır. Öz məzhəbinin ruhsat yolu ilə də çətin olarsa, digər üç məzhəbdən birini təqlid edərək əməl etməsi caiz olur.]

## SUİ-ZƏNN

24 – Günahının bağışlanmayacağını zənn etmək Allaha (cəllə cəlalühü) sui-zənn olar. Möminləri haram işləyən yəni, fasiq zənn etmək sui-zənn olar. Sui-zənn haramdır. Haram işlədiyini

öyrənərək, bilərək onu sevməmək sui-zənn olmaz, buğdi-fillah (Allah üçün sevməmək) olar, savab olar. Din qardaşının ayıbını gördükdə ona hüsni-zənn etməli, təvilinə çalışmalıdır. Onu islah etməlidir. Qəlbə gələn xatirə, düşüncə sui-zənn olmaz. Zənn etmək yəni, qəlbin o tərəfə meyl etməsi sui-zənn olar. Hucurat surəsinin 12-ci ayətində məalən, **"Ey iman edənlər! Sui-zənn etməkdən özünüzü qoruyun! Zənn etməyin bəzisi günahdır"** buyuruldu. Hədisi-şərifdə **"Sui-zənn etməyin. Sui-zənn səhv qərar verməyə səbəb olar. İnsanların gizli işlərini araşdırmayın, qüsurlarını görməyin, münaqişə etməyin, həsəd etməyin, bir-birinizə düşmənlik etməyin, bir-birinizi dedi-qodu etməyin, qardaş kimi sevişin. Müsəlman müsəlmanın qardaşıdır. Ona zülm etməz, yardım edər. Onu özündən aşağı görməz"** buyuruldu. Müsəlmanın müsəlmanı öldürməsi haramdır. Bir hədisi-şərifdə, **"Müsəlman müsəlmanın canına, malına və namusuna təcavüz etməz. Allahu təala bədənlərinizin qüvvətinə, gözəlliyinə baxmaz. Əməllərinizə də baxmaz. Qəlblərinizə baxar"**, buyuruldu. Allah (cəllə cəlalühü) qəlblərdə olan ixlasa və Allah qorxusuna baxar. Əməllərin, ibadətlərin qəbul olunması üçün yəni, savab verilməsi üçün həm şərtlərinə uyğun olması, həm də ixlas ilə niyyət etməsi lazımdır. Allah rızası üçün edilməyən xeyrat, yaxşılıq və ibadətlər qəbul olunmaz. "Allahu təala qəlbə baxar. Yaxşı niyyətlə edilən hər şeyi qəbul edər" demək də cahil şeyxlərin, təriqətçilərin sözləridir.

[Qəlbimiz təmizdir, deyərək haram, çirkin və pis işlər görürlər. Yaxşı niyyət ilə edilən hər şey yaxşılıq və ibadət olar, deyirlər. Belə açıq-aşkar günah işləyənləri və müsəlmanları aldadaraq özlərinə mürid toplayanları sevməmək, bunlara tabe olmamaq lazımdır. Bunların fasiq olduqlarını söyləmək sui-zənn olmaz.]

Hədisi-şərifdə, **"Allaha hüsni-zənn edin!"** buyuruldu. Zümər surəsi 53-cü ayətində məalən, **"Ey günahı çox olan qullarım! Allahın rəhmətindən ümidinizi kəsməyin. Allah günahların hamısını bağışlayar. O, sonsuz məğfirət və sonsuz mərhəmət sahibidir"** buyuruldu. Şərtlərinə uyğun tövbə etdikdə hər cür küfrü və hər cür günahı şübhəsiz bağışlayar. İstəsə küfrdən başqa günahları tövbəsiz də bağışlayar. Hədisi-qüdsidə, **"Qulum məni**

**necə zənn edərsə, onu zənn etdiyi kimi qarşılaram”** buyuruldu. Qəbul edəcəyəni zənn edərək tövbə edəni əhv edər.

[Allahın (cəllə cəlƏlühü) Peyğəmbərlərinə (salavatullahi təala və təslimatühü aleyhim əcmain) xəbər verməsinə, bildirməsinə **“Vəhy”** deyilir. Vəhy iki cürdür: Cəbrayıl adındakı bir mələk Allahdan (cəllə cələlühü) aldığı xəbərləri gətirərək Peyğəmbərə oxuyur. Buna **“Vəhyi mətlu”** deyilir. Bu vəhyin kəlimələri də mənaları da Allahdan gəlmişdir. Quranı-kərim vəhyi-mətludur. Vəhyin ikinci qismi “Vəhyi qeyri mətlu”dur. Bu vəhy Allahu təala tərəfindən Peyğəmbərlərin (aleyhissalətü vəssəlam) qəlbinə bildirilir. Peyğəmbər bu vəhyi öz bildiyi kəlimələrlə yanındakılara deyər. Bu sözlərə **“Hədisi-qüdsi”** deyilir. Hədisi-qüdsinin kəlimələri Peyğəmbərdəndir. Peyğəmbərin (aleyhissalətü vəssəlam) kəlimələri də mənaları da özündən olan sözlərinə **“Hədisi-şərif”** deyilir.]

Hədisi-şərifdə, **“Allahu təalaya hüsni-zənn etmək ibadətdir”**, və “**Özündən başqa ilah olmayan Allahu təalaya and olsun ki, Allahu təala ona hüsni-zənn edərək edilən duanı əlbəttə qəbul edər”** və “**Qiyamət günü Allahu təala bir qulunun Cəhənnəmə atılmasını əmr edər. Cəhənnəmə aparıldıqları zaman arxasına dönərək, ya Rəbb! Dünyada sənə həmişə hüsni-zənn etdim, dediyi zaman, “Onu Cəhənnəmə aparmayın! Qulumu mənə olan zənni kimi qarşılayaram, buyurur”** buyuruldu.

Saleh və ya fasiq olduğu bilinməyən möminə hüsni-zənn etmək lazımdır. Fasiq və saleh olmasının ehtimalı bərabərdirsə **“Şəkk”**, şübhə deyilir. Bərabər deyilsə çox olana **“Zənn”**, az olana **“Vəhm”** deyilir.

**Bu yaşa gəldin nə əməl qıldın?**
**Ömrün gəlib keçdi, peşmanmı oldun?**
**İndi hüzuruma nə üzlə gəldin,**
**Desə Allah, sən nə cavab verərsən?**

**İki yol göstərdim, həm ağıl verdim,**
**Bir yolu seçməkdə sərbəst buraxdım.**
**İbadəti tərk edib nəfsinə uydun,**
**Desə Allah, sən nə cavab verərsən?**

**İsti, soyuq dedin dəstəmaz almadın,**
**Dünyaya daldın, namaz qılmadın.**
**Cənabət gəzib, qüsl etmədin,**
**Desə Allah, sən nə cavab verərsən?**

## MALA MƏHƏBBƏT

25 – Haram yoldan qazanılan mal, mülk olmaz, istifadə edilməsi haram olar.

Halal malı ehtiyacdan artıq toplamaq məkruhdur. Zəkatını verməsə əzaba səbəb olar. Hədisi-şərifdə, **"Qızıla və gümüşə kölə olana lənət olsun!"** buyuruldu. Kölə daima sahibinin qəlbini qazanmağı düşünür. Dünya malının arxasınca getmək nəfsinin şəhvətləri (arzuları) arxasınca getməkdən daha pisdir. Mal, pul arxasınca getmək Allahu təalanın əmrlərini unutdurarsa, "dünya məhəbbəti" olar. Allah zikri (düşüncəsi) olmayan qəlbə şeytan yerləşir. Şeytanın ən böyük hiyləsi insana xeyirli işlər etdirərək onu saleh, yaxşı zənn etdirməsidir. Belə bir adam özünün qulu olur. Hədisi-şərifdə, **"Keçən ümmətlərin hər birinə fitnələr verildi. Mənim ümmətimin fitnəsi mal, pul yığmaq olacaq"** buyuruldu. Dünyalıq arxasına düşərək axirəti unudacaqlar.

Hədisi-şərifdə, **"Allahu təala insanları yaradarkən əcəllərini, ömürlərini və rüzilərini təqdir etmişdir"** buyuruldu. İnsanın ruzisi dəyişməz, azalmaz və çoxalmaz, vaxtından geri qalmaz. İnsan ruzisini axtardığı kimi ruzisi də sahibini axtarar. Çox kasıblar vardır ki, zənginlərdən daha yaxşı, daha məsud yaşayar. Allahu təala Ondan qorxanlara, dininə sarılanlara ummadıqları yerdən ruzi göndərər. Hədisi-qüdsidə, **"Ey dünya! Mənə xidmət edənə xidmətçi ol! Sənə xidmət edənə çətinlik göstər!"** buyuruldu. Bir hədisi-şərifdə, **"Ya Rəbb! Məni sevənlərə xeyirli mal ver. Mənə düşmənlik edənlərə çox mal və çox övlad ver!"** buyuruldu. Bir yəhudi öldü. Bir evi və iki oğlu qaldı. Evi bölməkdə razılığa gələ bilmədilər. Divardan bir səs gəldi: "Mənim üçün bir-birinizə düşmən olmayın. Mən bir padşah idim. Çox yaşadım. Qəbirdə yüz otuz il qaldım. Sonra torpağımla gil qab-qacaq düzəltdilər. Qırx il

evlərdə istifadə etdilər. Qırıldım, küçəyə atdılar. Sonra mənimlə kərpiç düzəltdilər. Bu divarın inşasında istifadə etdilər. Bir-birinizlə dalaşmayın. Siz də mənim kimi olacaqsınız" dedi.

Həsən Çələbi (rahimə-hullahü təala) **"Məvakif"** kitabının haşiyəsində deyir ki, həzrəti Həsən və həzrəti Hüseyin bir gün xəstələnmişdilər. Həzrəti Əli və həzrəti Fatimə (radıyallahu təala anhüm əcmain) və xidmətçiləri olan qız, övladları sağalsalar üç gün oruc tutacaqlarını nəzir etdilər. Övladları sağaldı. İftara yeməyə heç bir şeyləri yox idi. Bir yəhudidən üç sa (4,5 kq) ağırlığında arpa borc aldılar. Həzrəti Fatimə bir sa arpanı un etdi. Bununla beş çörək bişirdi. Bir kasıb gəlib, "Mənə yeməyə bir şey verin" dedi. Çörəkləri kasıba verib o gecə ac yatdılar. Ertəsi gün bir yetim gəldi. Bunları da ona verib ac yatdılar. Üçüncü gün bir əsir gəlib yemək istədi. Bunları da ona verdilər. Allahu təala Rəsulullaha (sallallahu təala aleyhi və səlləm) ayəti-kərimə göndərərək bunların nəzirlərini və isarlarını mədh etdi və tərif etdi. Ruzisini (pulu, malı) ehtiyacı qədər saxlayıb qalanını paylamağa **"Zühd"** deyilir.

[Bir insanın haqqını özünə qaytarmaq, ona olan borcu ödəmək, **"Ədalət"**lə hərəkət etmək sayılır. Haqqından artıq vermək **"Ehsan"** etmək sayılır. Ruzisinin, yəni möhtac olduğu malın hamısını başqasına verməyə **"İsar"** deyilir.]

Zahid olan alimin iki rəkat namazı zahid olamayanın ömrü boyu qıldığı namazdan xeyirlidir. Əshabi-kiramdan bəziləri (radıyallahu təala anhüm əcmain) tabiindən bəzilərinə "siz, Rəsulullahın (sallallahu təala aleyhi və səlləm) Əshabından daha çox əməl (ibadət) edirsiniz. Lakin onların zühdləri sizdən çox olduğu üçün Sizdən daha xeyirli idilər", demişdilər. Dünya məhəbbəti, yəni dünyaya düşkün olmaq demək, nəfsin arzularını, şirin gələn şeyləri və bunlara qovuşmağın səbəbi olan pulu haram yollardan axtarmaq deməkdir. Dünyaya düşkün olmaq, xəyal arxasınca getməkdir. Çünki dünya ləzzətlərinin zərərləri faydalarından daha çoxdur, əldə qalmaz, tez gedərlər. Bunlara qovuşmaq isə çox çətindir. Faydası heç olmayanlara **"Lab"**, yəni oyun və **"Ləhv"**, yəni əyləncə deyilir.

[İnsanı ölməkdən, bir üzvünü məhv etməkdən və şiddətli ağrıdan qurtaran şeyə **"Zərurət"** deyilir. Ruh və bədənin rahatlığı

üçün və sədəqə vermək, xeyrat və yaxşılıq etmək, zəkat, həcc, qurban, borc vermək üçün lazım olan şeylərə **“Ehtiyac”** deyilir. Ehtiyacdan artıq olan və insana xoş və şirin gələn şeylərə **“Zinət”** deyilir. Ehtiyacdan artıq olan malı təkəbbür üçün, göstəriş üçün istifadə etmək zinət olmaz, haram olar. Zərurət miqdarı qədər qazanmaq üçün çalışmaq fərzdir. Ehtiyac miqdarı qədər qazanmaq sünnətdir. Buna **“Qənaət”** deyilir. Zinət olan şeyləri qazanmaq mubahdır. Ehtiyac və zinət əşyasını islamiyyətə uyğun olaraq qazanmaq ibadət olar. Bunları qazanmaq üçün islamiyyətin xaricinə çıxmaq haram olar. Belə ələ keçirilənlər dünyalıq olar. **“Əhkamı-islamiyyə”** Allahu təalanın əmrləri və qadağaları deməkdir.]

Hədisi-şərifdə **“Dünyalıq olan şeylər məlundur** (lənətlənmişdir). **Allah üçün olan şeylər, Allahu təalanın razı olduğu şeylər məlun deyildir”** buyuruldu. Dünyalıq olan şeylərin Allahu təala qatında heç bir qiyməti yoxdur. Əhkamı-islamiyyəyə tabe olaraq qazanılan ruzi dünyalıq olmaz. Dünya neməti olar. Dünya nemətlərinin ən qiymətlisi saleh olan xanımdır. İmanı olan və islamiyyətə tabe olan insana “Saleh” (gözəl insan) deyilir. Saleh qadın həyat yoldaşını haram işləməkdən qoruyar. Xeyirli əməl və ibadət etməsinə kömək edər. Saleh olmayan qadın zərərli olar, dünyalıq olar. Hədisi-şərifdə **“Dünya nemətlərindən mənə, qadınlarım və gözəl ətir sevdirildi”** buyuruldu. Hədisi-şərifdə **“Dünyalıq olan şeylərin Allah qatında milçəyin qanadı qədər qiyməti olsaydı, kafirə bir qurtum su verməzdi”** buyuruldu. Kafirlərə dünyalığı çox verərək onları fəlakətə sürükləməkdədir. Hədisi-şərifdə **“Möminin Allah qatındakı qiyməti, topladığı dünyalıq qədər azalır”** və **“Dünya sevgisi artdıqca axirətə olan zərəri də artar. Axirət sevgisi artdıqca dünyanın ona zərəri azalar”** buyuruldu. Həzrəti Əli (radıyallahu təala anh) deyir ki, dünya ilə axirət şərq ilə qərb kimidir. Birinə yaxınlaşan digərindən uzaqlaşar. Hədisi-şərifdə **“Dünyalıq arxasınca getmək su üzərində yeriməyə bənzəyir. Bunun ayaqlarının islanmaması mümkündürmü? İslamiyyətə tabe olmağa mane olan şeylərə dünya deyilir”**, və **“Allahu təala bir qulunu sevərsə, onu dünyada zahid və axirətə raqıb edər. Ayıblarını ona bildirər”**, və **“Dünyada zahid olanı Allah sevər. İnsanlarda olan şeylərdə zahid**

**olanı insanlar sevər”**, və **“Dünyalıq axtaranın buna qovuşması çətindir. Axirəti axtaranın buna qovuşması asandır”** və **“Dünyalığa düşkün olmaq xətaların başıdır”** buyuruldu. Yəni, hər cür xətaya, günaha səbəb olar. Dünya arxasınca gedən şübhəli şeylərə, sonra məkruhlara, sonra haramlara, hətta küfrə dalar. Keçmiş ümmətlərin Peyğəmbərlərinə (aleyhimüssaləvətü vəttəslimat) inanmamalarına səbəb dünyaya düşkün olmaları idi. Dünya məhəbbəti şəraba bənzəyər. Bundan içən ancaq ölüm vaxtı ayılır. Musa aleyhissəlam Tur dağına gedərkən birinin çox ağladığını gördü. “Ya Rəbb! Qulun sənin qorxundan ağlayır”, dedi. **“Qan ağlasa da onu bağışlamaram. Çünki o, dünyaya düşkündür”**, buyurdu. Hədisi-şərifdə, **“Dünyanı halaldan qazanana axirətdə hesab vardır. Haramdan qazanana əzab vardır”** və **“Allahu təala bir qulunu sevməzsə malını haramlara sərf etdirər”** buyuruldu. Təkəbbür üçün bina inşa etmək belədir. Bir hədisi-şərifdə, “**Bir insan halal pul ilə bina tikərsə, insanlar bundan faydalandığı müddət ərzində o insana savab yazılar”** buyuruldu. Rütubətdən xilas olmaq, təmiz hava almaq niyyətilə yüksək bina tikdirmək caizdir. Təkəbbür üçün, öyünmək üçün yüksək bina tikmək haramdır. İmamı-Azam Əbu Hənifə buyurur ki, “Cahillərin təhqir etməməsi və düşmənlərə əzəmətli, qüvvətli görünməsi üçün alimlərin, əmirlərin libas və evlərinin zinətli olması lazımdır”.

**İnsanın şərəfi elm və ədəblədir.**
**Sanma ki, şərəf mal və nəsəblədir!**

## TƏSVİF

26 – Təsvif, xeyirli iş görməyi sonraya saxlamaqdır. İbadətlərdə və xeyirli işləri görməkdə tələsmək, **“Musarəat”** olur. Hədis-i şərifdə, **“Ölmədən əvvəl tövbə edin. Xeyirli işləri görməyə maneə cıxmadan öncə tələsin. Allahu təalanı çox xatırlayın. Zəkat və sədəqə verməkdə tələsin. Beləcə Rəbbinizin ruzilərinə və yardımına qovuşun!”** və **“Beş şey gəlmədən əvvəl beş şeyin qiymətini bilin: Ölmədən əvvəl həyatın qiymətini, xəstəlikdən**

**əvvəl səhhətin qiymətini, dunyada axirəti qazanmağın qiymətini, qocalmadan əvvəl gəncliyin qiymətini, yoxsulluq gəlmədən zənginliyin qiymətini"** buyuruldu. Zəkatını verməyən və malını axirət yolunda sərf etməyən yoxsul olarkən çox peşman olar. Hədisi-şərifdə, **"Təsvif edən həlak olar"** buyuruldu.

[İmamı-Rabbani (rahmətullahi aleyh) ayaqyoluna girdikdən bir müddət sonra qapını döyərək xidmətçisini çağırır. Xidmətçi, təharət suyunu və ya parçasını hazırlamadığını düşünüb qaçaraq gəlir. Qapı arasından köynəyini uzadaraq, "Al, bunu filan yoxsula hədiyyə olaraq ver" dedikdə, əfəndim, bunu ayaqyolundan çıxdıqdan sonra əmr etsəydiniz olmazdımı? Özünüzə niyə belə əziyyət verdiniz, deyir. Köynəyimi o kasıba hədiyyə etmək, ayaqyolunda xatirimə gəldi. Bayıra çıxana qədər təsvif etsəydim, şeytanın vəsvəsə edərək, bu xeyirli işi görməkdən məni vaz keçirməsindən qorxdum, dedi.]

## FASİQLƏRİ SEVMƏK

27 – Haram işləyən insana **"fasiq"** (pis insan) deyilir. Fisqin (günahın) ən pisi zülüm etməkdir. Çünki açıq-aşkar edilir və qul haqqı da olur. Ali-İmran surəsi 57-ci və 140-cı ayətlərində məalən, **"Allah zalımları sevməz"** buyuruldu. Hədisi-şərifdə, **"Zalımın çox yaşamasına dua etmək Allaha üsyan olunmasını istəməkdir"** buyuruldu. Süfyanı Səvriyə (rahimə-hüllahü təala), "Çöldə bir zalım susuzluqdan həlak olur. Ona su verimmi?" soruşulduqda, "Xeyr, verməyin," buyurdu. Zalım oturduğu evi qəsb yolu ilə almışsa, o evə girmək haramdır. Fasiq bir insana təvazö edənin dininin üçdə ikisi gedər. Zalıma təvazö edənin halının necə olacağını buradan başa düşmək olar. Zalımın əlini öpmək, qarşısında əyilmək günahdır. Adilin isə caizdir. Əbu Ubeydə bin Cərrah Həzrəti Ömərin əlini öpmüşdü (radıyallahu anhümə). Qazancının çoxu haramdan olanın evinə gedib oturmaq caiz deyil. Onu söz ilə və ya bir hərəkət ilə mədh etmək haramdır. Ancaq özünü və ya başqasını onun zülmündən qurtarmaq üçün yanına getmək caiz olar. Yanında olan zaman yalan danışmamaq, onu tərifləməmək

və mədh etməmək lazımdır. Qəbul edəcəyi zənn edilərsə nəsihət vermək olar. Zalım sənə gəlsə qalxmaq, ayaq üstə qarşılamaq caiz olar. Dinin izzətini və zülmün pis olduğunu bildirmək üçün qalxmamaq yaxşı olar. Mümkün olsa nəsihət etmək lazımdır. Zalımdan hər zaman uzaq qalmaq daha yaxşıdır. Hədisi-şərifdə, **"Münafiq ilə danışarkən, əfəndim deməyin!"** buyuruldu.

Allahu təalaya üsyan edənə **"Fasiq"** (Pis insan) deyilir. Başqalarının üsyan etməsinə, fisqin (günahın) yayılmasına səbəb olana **"Facir"** deyilir. Haram işlədiyi bilinən fasiqi sevmək olmaz. Bidəti, yəni, səhv etiqadı yayanları və dini öyrənməyə mane olanları sevmək günahdır. Hədisi-şərifdə, **"Fasiqin fisqinə mane olmağa imkanı var ikən, heç kimsə mane olmazsa, Allahu təala bunların hamısına dünyada və axirətdə əzab edər"** buyuruldu. Ömər ibn Əbdüləziz (rahimə-hullahü təala) deyir ki, "Allahu təala bir kimsə günah işlədiyi üçün başqalarına da əzab etməz isə də açıqca günah işləyənləri görüb mane olmadığı zaman hamısına əzab edər". Allahu təala Yuşa Peyğəmbərə (aleyhissalətü vəssəlam) vəhy etdi ki, "Qövmündən qırx min saleh şəxsə və altmış min fasiq insana əzab edəcəm!" Ya Rəbb! Fasiqlər əzaba layiq olmuşdur. Salehlərə əzab etməyinin səbəbi nədir, dedikdə, "Mənim qəzəb etdiklərimə onlar qəzəb etmədi. Birlikdə yedilər, içdilər", buyurdu. Malına, canına, övladına və müsəlmanlara zərər gələcəyi, yəni fitnəyə səbəb olacağı zaman bidət sahiblərinə və zalımlara əmrimaruf etmək lazım olmaz. Açıq-aşkar günah işləyən fasiqləri yalnız qəlb ilə sevməmək kafidir. Şirin və mülayim sözlərlə nəsihət vermək lazımdır.

Bir insan həm ibadət edər, həm də fisq işləyərsə, daha çox etdiyinin adı verilir. İkisi də bərabərdirsə ibadəti baxımından sevilir. Fisqi baxımından sevilməz. Başqalarının da fisqinə səbəb olan insana hökumət məmurları tərəfindən mane olunur.

[Allahu təalanın sevgisini qazanmaq üçün islamiyyətə tabe olana və bir mürşidi sevənə **"Saleh"** (yaxşı insan) deyilir. Bu sevgini qazanmış olana **"Vəli"** deyilir. Başqalarının da qazanmaları üçün çalışan Vəliyə **"Mürşid"** deyilir. **"İslamiyyətin əsli, təməli üçdür: Elm, əməl, ixlas"**. İslam elmləri iki yerə bölünür. Din bilgiləri, fənn bilgiləri. Dində reformçular, din bilgilərinə **"Sko-**

**lastik bilgilər"**, fənn bilgilərinə **"Rasional bilgilər"** deyirlər. Din bilgiləri ağacdan armud düşmüş kimi insanın ağlına bir yerdən gəlməz, bir həqiqi mürşidin sözlərindən və hallarından, hərəkətlərindən və Əhli-sünnət alimlərinin **"Elmi-hal"** kitablarından öyrənilir. Qiyamət yaxınlaşdıqca heç bir yerdə həqiqi mürşid görülməyəcək, savadsız, yalançı, fasiq din adamları çoxalacaqdır. Bunlar Allahu təalanın sevgisini qazanmaq üçün deyil, pul, vəzifə və şöhrət qazanmaq üçün çalışacaqlar. Varlılara, vəzifə sahiblərinə yanaşacaqdırlar. Bir din oğrusuna aldanmamaq üçün məşhur Əhli-sünnət alimlərinin kitablarını oxumaq lazımdır. Zamanımızda və hər zaman günahların ən zərərlisi din bilgilərini öyrənməyə mane olmaqdır. Zərərli oyunları seyr etmək din kitabı oxumağa mane olar. Gənclər din kitabı oxumadıqda din savadsızı olurlar. Dinsiz və imansız yetişirlər. Müsəlman ana-ataların övladlarını bu fəlakətdən qurtarması lazımdır.]

## ALİMLƏRƏ DÜŞMƏNLİK ETMƏK

28 – İslam elmləri ilə və islam alimləri ilə (rahimə-hümullahü təala) istehza etmək küfrdür. İslam alimini söyən, pisləyən kafir olar, mürtəd olar. Fisq və bidət səbəbi ilə sevməmək lazım olar. Dünya işləri səbəbi ilə sevməmək günah olar. Salehləri sevməmək də belədir. Hədisi-şərifdə, **"Üç şey imanın ləzzətini artırır: Allahu təalanı və Rəsulunu hər şeydən çox sevmək, özünü sevməyən müsəlmanı Allah rizası üçün sevmək, Allahu təalanın düşmənlərini sevməmək"** və **"İbadətlərin ən qiymətlisi hubbi-fillah və buğdi-fillahdır"** buyuruldu. İbadəti çox olan mömini az olandan daha çox sevmək lazımdır. Üsyanı daha çox olan, küfrü və fuhşu yayan kafirləri daha çox sevməmək lazımdır. Allah üçün düşmənlik edilməsi lazım olanların başında insanın öz nəfsi gəlir. Sevmək demək onların yolunda olmaq deməkdir. İmanın əlaməti də "hubbi-fillah və buğdi-fillah"dır. Bir hədisi-şərifdə, **"Allahu təalanın bəzi qulları vardır. Bunlar Peyğəmbər deyildir. Peyğəmbərlər və şəhidlər qiyamət günü bunlara qibtə edəcəklər. Bunlar bir-birini tanımayan, uzaq yerlərdə ya-**

**şayan, Allah üçün bir-birini sevən möminlərdir”** buyuruldu. Bir hədisi-şərifdə, **“İnsan dünyada kimi sevirsə axirətdə onun yanında olacaqdır”** buyuruldu. Onun yolunda olmazsa sevgisi səhih olmaz. İnsan dininə və əmanətinə güvəndiyi saleh insanlarla yoldaşlıq etməlidir. Yəhudi və nasranilər Peyğəmbərlərini (aleyhimüssaləvatü vəttəslimat) sevdiklərini deyirlər. Lakin onların yolunda olmadıqları üçün xaxamların, keşişlərin uydurduqları yalnış yolda olduqları üçün axirətdə Peyğəmbərlərinin yanında olmayacaqlar. Hətta Cəhənnəmə gedəcəklər. “Cavab verə bilmədi” kitabımızda yəhudilər və xristianlar haqqında geniş bilgi vardır. Yüksək ruhlar sevdikləri ruhları yuxarı çəkərlər. Alçaq ruhlar da aşağı çəkər. İnsan öldükdən sonra ruhunun hara gedəcəyini dünyada sevdiklərinin halından başa düşməlidir. İnsan başqasını təbiət baxımından və ya ağlına görə, yaxud ona edilən yaxşılıqlar baxımından və yaxud da Allahu təalanın rızası üçün sevər. Dünyada bir-birini sevən şəxslərin ruhları bir-birini cəzb etdiyi kimi qiyamətdə də bir-birlərini cəzb edərlər. Ənəs ibn Malik (radıyallahu anh) deyir ki, müsəlmanları yuxarıdakı hədisi-şərif sevindirdiyi qədər heç bir şey sevindirməmişdir. Kafirləri sevən onlarla birlikdə Cəhənnəmə gedəcəkdir. Sevgilisinə tabe olmamaq insanın əlində deyil. Sevməyin ən qüvvətli əlaməti sevgilinin sevdiklərini sevmək, sevmədiklərini sevməməkdir.

## FİTNƏ

29 – İnsanları sıxıntıya, bəlaya salmağa, qiyama səbəb olmağa fitnə deyilir. Hədisi-şərifdə, **“Fitnə yuxudadır. Bunu oyandırana Allah lənət etsin!”** buyuruldu. İnsanları hökumətə qarşı, qanunlara qarşı üsyana təşviq etmək fitnə olar. Fitnə çıxarmaq haramdır. Haqsız yerə adam öldürməkdən daha böyük günahdır. Zalım olan hökumətə qarşı üsyan etmək də haramdır. Məzlumlar üsyan etsə, onlara kömək etmək də haramdır. Üsyan etməyin zərəri, günahı, zülmün zərərindən və günahından daha çoxdur.

İmamın sünnət olan miqdardan çox oxuyaraq namazı uzatması da fitnə çıxarmaqdır. Camaatın hamısı razı olarsa fitnə olmaz, caiz

olar. Vaizlərin, din adamlarının camaatın başa düşə bilməyəcəkləri şeyləri söyləməsi və yazması da fitnə olar. Hər kəsə anlaya biləcəyi şəkildə söyləmək lazımdır. Müsəlmanlara yerinə yetirə bilməyəcəyi ibadətləri əmr etməmək lazımdır. Zəif qövl olsa da, edə biləcəklərini söyləmək lazımdır. Əmri-maruf edərkən də fitnə çıxarmamağa diqqət etmək lazımdır. Əmri-maruf edərkən özünü təhlükəyə atmaq əmr olunmadı. Dinə və başqalarına zərər verərək dünya fitnəsinə də səbəb olmamaq lazımdır. Özünə dünyəvi zərər toxunacaq əmri-marufu etmək caiz olar, cihad olar. Səbr edə bilməyəcəksə bunu da etməməlidir. Fitnə zamanında evindən çıxmamaq, heç kəslə görüşməmək lazımdır. Fitnəyə düşdükdə səbr etmək lazımdır.

İmamı-Rabbani (rahimə-hullahü təala) ikinci cildin altmış səkkizinci məktubunda buyurur ki: Sevimli övladım! Təkrar-təkrar yazıram ki, indi günahlarımıza tövbə edəcək, Allahımızdan əfv diləyəcək zamandayıq. Fitnələrin çoxaldığı bu zamanda evə bağlanıb kimsə ilə görüşməmək lazımdır. Fitnələr hardasa yağış kimi yağaraq hər yeri örtəcək. Hədisi-şərifdə buyuruldu ki, **“Qiyamət qopmadan əvvəl hər yeri fitnələr bürüyəcək. Fitnələrin zülməti ortalığı qaranlıq gecə kimi edəcək. O zaman evindən mömin olaraq çıxan kimsə axşam kafir olaraq evinə qayıdacaq. Axşam mömin olaraq evinə gələn, səhər kafir olaraq qalxacaq. O zaman oturmaq ayaq üstə durmaqdan xeyirlidir. Yeriyən qaçandan daha xeyirlidir. O zaman oxlarınızı qırın! Yaylarınızı kəsin. Qılınclarınızı daşa vurun! O zaman evinizə birisi gəldikdə, Adəm nəbinin iki oğlundan yaxşısı kimi olsun!”** Əshabi-kiram (radıyallahu təala anhüm əcmain) bunu eşidən kimi o zamanda olacaq müsəlmanlara nə etməyi əmr edərsiniz, dedilər. Cavabında, **“Evinizin əşyası olun!”** Bir rəvayətdə, **“Elə fitnə zamanında evinizdən bayıra çıxmayın!”** buyurdu. [Bu hədisi-şərif Əbu Davudda və Tirmüzidə mövcuddur.] Bu günlərdə Dar-ül-hərb kafirlərinin Nəqrəküt şəhərində müsəlmanlara, islam məmləkətlərində etdikləri zülmləri, işkəncələri eşitmişsiniz. Müsəlmanlara görülməyən təhqirlər etdilər. Belə alçaqcasına işlər axır zamanda çox olacaqdır. Altmış səkkizinci məktubdan tərcümə tamam oldu.

**“Təzkirəyi-Qurtubi”** müxtəsərində deyir ki: Hədisi-şərifdə **“Fitnə çıxarmayın! Söz ilə çıxarılan fitnə, qılınc ilə olan fitnə kimidir. Zalımlara, facirlərə milləti dedi-qodu etməkdən, yalan və iftira söyləməkdən hasil olan fitnə, qılınc ilə edilən fitnədən daha zərərlidir”** buyuruldu. Alimlərin az qala hamısı sözbirliyi ilə bildirirlər ki, malını, canını qurtarmaq məcburiyyətində qalanın da üsyan etməməsi, hökumətə, qanunlara qarşı gəlməməsi lazımdır. Çünki zalım olan hökumətə qarşı səbr etməyi hədisi-şəriflər əmr etməkdədir. Rəsulullahın (sallallahu aleyhi və səlləm) **“Allahummə inni əsəlükə-filəl xayrat və tərkəlmünkərat və hubbəl-məsakin və iza ərədtə fitnətən fi qavmi fə-təvəffəni qayrə məftun”** duasını oxuduğu imam Muhamməd (rahimə-hullahü təala) bildirir. Bu dua “Ya Rəbb! Mənə xeyirli işlər etməyi, çirkin şeyləri tərk etməyi və kasıbları sevməyi nəsib et! Qövmüm arasında fitnə çıxarmaq istədiyin zaman, fitnəyə qarışmadan canımı al!” deməkdir. İmam-Qurtubi (rahimə-hullahü təala) deyir ki, bu hədisi-şərif fitnədən çəkinmək, ona qarışmamaq lazım olduğunu, fitnəyə qarışmaqdansa, ölməyin xeyirli olacağını açıq göstərməkdədir.

**“Mişqat”**dakı hədisi-şəriflərdə buyurulur ki, **“Fitnə zamanında müsəlmanlara və onların rəislərinə tabe olun. Haqq yolda olan yoxdursa, fitnəçilər, üsyançılar arasına qarışmayın! Ölənə qədər fitnəyə qarışmayın!”**. **“Fitnə zamanında islamiyyətə sarılın. Özünüzü qurtarın. Başqalarına ağıl verməyin! Evinizdən bayıra çıxmayın. Dilinizi tutun!”**. **“Fitnə zamanında çox kimsə öldürülər. Onların arasına qarışmayan xilas olar”**. **“Fitnəçilərə qarışmayan səadətə qovuşar. Fitnəyə tutulub səbr edən də səadətə qovuşar”**. **“Allahu təala Qiyamət günü bir qulundan soruşacaq: Günah işləyəni gördüyün vaxt nə üçün mane olmadın, deyəcək. O qul, onun zərərindən, düşmənlik etməsindən qorxdum və sənin əfv və bağışlamağına güvəndim deyəcək”**. Bu hədisi-şərif düşmənin qüvvətli olduğu zamanlarda, əmri-marufu və nəhyi-münkəri tərk etməyin caiz olacağını göstərməkdədir.

**“Şiratül-islam”** şərhində deyir ki, fərzin edilməsini, haramdan çəkinilməsini əmr etmək fərzi-kifayədir. Sünnətin edilməsini əmr, məkruhdan nəhy, məhrum etmək sünnətdir. Haram işləməkdə olanın əl ilə qarşısı alınmaz. Söz ilə qarşısı alınar. Yəni pisliyi,

zərəri izah edilər. Haram işləməyə hazırlaşanın əl ilə qarşısı alınar. Söz ilə, əl ilə nəhy edərkən fitnə, zərər çıxarmamaq lazımdır. Nəhyin faydalı olacağını əvvəldən bilmək lazımdır. Zənni-qalib, yəni çox zənn etmək də bilmək deməkdir. Hubbu-fillah, buğdu-fillah (Allah üçün sevmək, Allah üçün sevməmək) olmayınca edilən ibadətlərin faydası olmaz. Əmri-maruf üzrsüz tərk edilərsə, dualar qəbul olmaz. Xeyir və bərəkət qalmaz. Cihadda və müşkül işlərdə zəfər nəsib olmaz. Gizli işlənən günah bunu işləyənə zərər verər. Açıq işlənərsə hər kəsə zərəri toxunar. Bir kimsənin pisləməsi ilə bir insanı pis bilmək olmaz. Bir kimsənin pisləməsi qeybət olar. Bunu dinləmək də haram olar. Bir insanın fasiq olduğu iki adil şahidin, onun bir münkər işlədiyini gördüklərini bildirmələri ilə və ya öz təcrübəsi ilə aydın olar. Günah işləyəni görüb, gücü, qüdrəti olduğu halda nəhy etməməyə, **"Müdahənə"** deyilir. Müdahənə edənlərin qəbirdən meymun və donuz şəklində qalxacaqları hədisi-şərifdə bildirilmişdir. Əmri-maruf edəni yoldaşları sevməz. Müdahənə edəni sevərlər. Zalım olan hökumət adamlarına söz ilə əmri-maruf etmək cihadın ən qiymətlisidir. Nəsihət verməyə gücü çatmasa, qəlbi ilə rədd etmək də cihad olar. Dövlət adamları əl ilə, alimlər söz ilə, digər müsəlmanlar qəlb ilə əmri-maruf edər. Əmri-marufu Allah rızası üçün etmək, söylədiyinin kitabdan dəlillərini bilmək və fitnəyə səbəb olmamaq lazımdır. Sözünün faydası olmayacağını və fitnə çıxmasına səbəb olacağını bilən kimsənin əmri-maruf etməsi vacib olmaz. Hətta bəzən haram olar. Belə zamanda fitnəyə səbəb olmamaq üçün evindən çıxmamaq lazımdır. [Yəni fitnəçilərin arasına qarışmamaq lazımdır.] Fitnə çıxarsa və ya hökumət zülm edər, fəsad çıxararsa, o şəhərdən, diyardan hicrət etmək lazım olar. Hicrət mümkün ikən, hökumətin ikrah etməsi, məcbur etməsi günah işləmək üçün üzr olmaz. Hicrət mümkün olmasa, bir kənara çəkilməli, kimsəyə qarışmamalıdır. Sözünün faydası olmayacağını və fitnə çıxacağını bilirsə, əmri-maruf etmək vacib olmaz, müstəhəb olar. Sözünün faydalı olacağını, lakin fitnəyə səbəb olacağını da bilirsə yenə vacib olmaz. Fitnə döyülmək kimi kiçik isə müstəhəb olar. Fitnə böyük və təhlükəli isə əmri-maruf etməsi haram olar. Əmri-marufu mülayim etmək vacibdir. Sərtlik fitnəyə səbəb olar. Müsəlmana və zimmi kafirə qarşı silah ilə işarə

etməmək, bunlara da zülm, işgəncə etməmək lazımdır. **“Şira”**dan tərcümə tamam oldu.

## MÜDAHƏNƏ VƏ MÜDARA

30 – Qüdrəti olduğu, gücü çatdığı halda haram işləyənə mane olmamağa müdahənə deyilir. Haramı işləyənə və ya yanında olanlara olan hörməti, yaxud dinə olan bağlılığının zəifliyi müdahənəyə səbəb olur. Fitnə olmadığı, yəni dininə, dünyasına və ya başqalarına zərər olmadığı zaman haram və məkruh işləyənə mane olmaq lazımdır. Mane olmamaq, susmaq haram olar. Müdahənə etmək haram işləməyə razı olmağı göstərir. Susmaq çox yerdə yaxşıdır. Lakin haqqı, xeyri söyləyəcək yerdə susmaq olmaz. Ya Rəsulallah! Keçmiş ümmətlərdən bir qisminə zəlzələ ilə əzab edildi. Torpaq altında qaldılar. Bunların arasında salehlər [yaxşı insanlar] da vardı, deyildikdə, **“Bəli, salehlər də birlikdə həlak oldular. Çünki Allaha üsyan olunarkən susmuşdular. Onlardan ayrılmamışdılar”** buyuruldu. Hədisi-şərifdə, **“Ümmətimdən bir qismi qəbirlərindən meymun və donuz şəklində qalxacaqlar. Bunlar Allahu təalaya üsyan edənlərin arasına qarışanlar, onlarla bərabər yeyib içənlərdir”** və **“Allahu təala bir alimə elm lütf etdikdə, Peyğəmbərlərdən aldığı kimi bundan da misaq alar”** buyuruldu. Elmini lazım olduğu zaman söyləməkdən çəkinməyəcəyinə söz verər. **“Bir kimsə, Allahu təalanın lütf etdiyi elmi, lazım olduğu zaman söyləməzsə, qiyamət günü boynuna alovdan boyunduruq taxılacaqdır”** hədisi-şərifi və Nisa surəsinin, **“Özlərinə elm və hidayət verdiyimiz kimsələr, elmlərini insanlardan saxlayarlarsa, Allahın və lənət edənlərin lənətləri bunların üzərinə olsun!”** məalindəki otuz altıncı ayəti-kəriməsi müdahənə etməyin haram olduğunu göstərir. Müdahənənin əksi, qarşılığı, “Qeyrət” və cəsarətdir. Maidə surəsində əlli dördüncü ayəti-kəriməsində məalən, **“Allah yolunda cihad edərlər, pislənilməkdən qorxmazlar”** buyuruldu. Dində qeyrət və cəsarəti olanların malları ilə, canları ilə, sözləri ilə və qələmləri ilə Allah rızası üçün cihad etmələrini lazım olduğu bu ayəti-kərimədə bildi-

rilmişdir. Hədisi-şərifdə **"Çox acı olsa da haqqı söyləyin!"** buyuruldu. Bir zahid Əməvi xəlifələrinin dördüncüsü Mərvanın yanında çalğı çalanları gördükdə, çalğı alətlərini qırdı. Mərvan, bunun aslanların arasına atılmasını əmr etdi. Aslanların yanında dərhal namaza durdu. Aslanlar onu yalamağa başladılar. Onu aslanların yanından alıb xəlifəyə gətirdilər. "Aslanlardan qorxmadınmı?" dedi. "Xeyr, onlardan qorxmaq yadıma düşmədi. Bütün gecəni düşüncəli keçirdim", dedi. "Nə düşündün?" dedi. "Aslanlar məni yalayanda, tüpürcəkləri nəcisdirmi? Allahu təala namazımı qəbul etdimi, etmədimi deyə düşündüm[1]" dedi.

Özünə və başqalarına zərər gəlmə qorxusu səbəbiylə yaxşılığı əmr etmək və haramdan çəkindirmək mümkün olmasa, belə fitnəyə mane olmaq üçün susmağa, "Müdara" etmək deyilir. Qəlbi haramdan çəkindirmək istədiyi halda müdara etmək caizdir. Hətta, sədəqə savabı hasil olar. Müdara edəndə şirin dilli və gülər üzlü olmaq lazımdır. Tələbəyə dərs verərkən müdara edilir. İmam-Qəzali (rahimə-hullahü təala) buyurdu ki, "İnsanlar, üç qisimdir: bir qismi qida kimidir. Hər kəsə hər zaman lazımdır. İkinci qismi dərman kimidirlər, ehtiyac zamanında lazım olar. Üçüncü qismi xəstəlik kimidir. Bunlara ehtiyac olmaz. Lakin özləri insanlara müsəllət olar, bulaşarlar. Bunlardan xilas olmaq üçün müdara etmək lazımdır." Müdara caizdir. Bəzən də müstəhəb olar. Evində xanıma müdara etməyən kimsənin rahatlığı, hüzuru qalmaz. Rəsulullaha (sallallahu təala aleyhi və səlləm) bir qonaq gəldi, **"İçəri alın! O pis bir insandır"** buyurdu. İçəri girəndə onunla şirin və şən danışdı. Gedəndə mülayim danışmasının səbəbi soruşulduqda, **"Qiyamətdə ən pis yerdə olan kimsə, dünyada zərərindən qorunmaq üçün ikram olunandır"** buyurdu. Hədisi-şərifdə **"Sıxılmadan açıq haram işləyən kimsəni qeybət etmək caiz olduğu kimi, şərlərindən qorunmaq üçün bunlara müdara etmək də caizdir. Lakin müdara, müdahənə şəklini almamalıdır"** buyuruldu. Müdara, dini və dünyasını zərərdən qurtarmaq üçün dünya mənfəətindən verməkdir. Müdahənə, dünya ələ keçirmək üçün dindən verməkdir. Zalıma müdara edərkən özü və zülmləri mədh olunmaz.

---

[1] Mərvan ibn Hakəm 65 (m.683) də öldürüldü.

## İNAD VƏ MÜKABƏRƏ

31 – İnad və mükabərə, haqqı, doğrunu eşitdiyi zaman qəbul etməməkdir. Əbu Cəhl və Əbu Talib inad edərək Rəsulullahın (sallallahu aleyhi və səlləm) Peyğəmbər olduğuna inanmadılar, inkar etdilər. İnad riyadan (göstəriş), hıqddan (kin), həsəddən, yaxud tamadan (dünya ləzzətlərini haram yoldan axtarmaq) hasil olar. Hədisi-şərifdə **“Allahu təalanın ən sevmədiyi insan haqqı qəbul etməkdə inad edəndir”** buyuruldu. Hədisi-şərifdə **“Mömin vüqar sahibi olar, yumşaq olar”** buyuruldu. Vüqar sahibi dünya işlərində asanlıq göstərər. Din işlərində sıldırım qaya kimi olar. Bir dağ zamanla aşına bilər. Mömininin dini heç aşınmaz.

## NİFAQ

32 – Nifaq, münafiqlik, daxilinin xaricinə uyğun gəlməməsidir. Qəlbində küfr olan kimsənin mömin olduğunu söyləməsi dində nifaq olar. Qəlbində düşmənlik olub, dostluq göstərmək dünya nifaqı olar. Küfrün ən pisi dində nifaq etməkdir. Mədinə şəhərindəki münafiqlərin rəisi Abdullah ibn Übey ibn Səlul idi. Müsəlmanların Bədr döyüşündəki zəfərlərini gördükdə müsəlman olduqlarını söylədilər. Lakin qəlbləri ilə inanmadılar. Hədisi-şərifdə **“Müsəlmanlara sözləriylə dostluq göstərib, davranışlarıyla düşmənlik edənlərə Allahu təala və mələklər lənət etsin”** və **“Münafiqin üc əlaməti vardır: Yalan danışar, sözündə durmaz və əmanətə xəyanət edər”** buyuruldu. Belə kimsə müsəlman olduğunu söyləsə, namaz qılsa da münafiqdir.

## TƏFƏKKÜR ETMƏMƏK

33 – İnsanın günahlarını düşünməsi və bunlara tövbə etməsi, taətlərini, ibadətlərini düşünüb bunlara da şükür etməsi lazımdır. Məxluqlardakı və bədənindəki incə sənətləri, nizamları, bir-birinə

olan bağlılıqlarını düşünərək də Allahu təalanın varlığını və böyüklüyünü anlaması lazımdır. Məxluqların, varlıqların hamısına **“Aləm”** deyilir.

[Aləm üç qisimdir: **“Aləmi-əcsad”**, **“Aləmi-ərvah”** və **“Aləmi-misal”**. Aləmi-misal varlıq aləmi deyildir, görünüş aləmidir. Hər varlığın bu aləmdə bir görünüşü var. Aləmi-ərvah Ərşin xaricindəki şeylərdir. Bunlar maddi deyildir. Bunlara **“Aləmi-əmr”** də deyilir. Aləmi-əcsad maddə aləmidir. Buna **“Aləmi-xəlq”** də deyilir. Bu da iki yerə ayrılır: İnsana **“Aləmi-saqir”** (kiçik aləm) deyilir. İnsandan başqa varlıqların hamısına **“Aləmi-kəbir”** (böyük aləm) deyilir. Aləmi-kəbirdə olan hər şeyin Aləmi-saqirdə bir nümunəsi, oxşarı vardır. İnsanın qəlbi ruh aləminə açılan bir qapıdır. Kafirlərdə bu qapı bağlanmış, zay olmuşdur. Bunun üçün kafirlərin ruh aləmindən xəbərləri yoxdur və ola bilməz. Qəlbin həyat tapması, ruh aləminə açılması üçün tək çarə, tək dərman iman etməsidir, müsəlman olmasıdır. Mömininin qəlb qapısından Aləmi-əmrə girməsi və bu aləmdə sonsuza, əbədi həyata irəliləməsi üçün çalışması lazımdır. İslamiyyətin səkkiz ana elmindən biri olan **“Təsəvvüf”** elmi bu çalışmaları öyrədən böyük bir elmdir. Bu elmin mütəxəssislərinə **“Vəli”** və **“Mürşid”** deyilir. Mürşidlərin ən məşhuru İmamı-Rabbani Əhməd Faruqidir. 1034 hicri və 1624 miladi ilində Hindistanda vəfat etmişdir.

Tibb və fənn fakültələrində oxuyub məxluqlardakı sənət incəliklərini, aralarındakı hesablı bağlantıları görən və anlaya bilən ağlı başında bir insanın Allahu təalanın varlığına, birliyinə, böyüklüyünə, elminə, qüdrətinə inanmaması mümkün deyil. İnanmayanın anormal, ağılsız, cahil olması, yaxud inadcıl, ehtiraslarına düşkün bir axmaq olması və ya nəfsinə əsir olmuş, işgəncə etməkdən zövq alan zalım bir sadist olması lazım gəlir. Kafirlərin həyat hekayələri incələnərsə bu üç qisimdən biri olduğu dərhal meydana çıxar.]

Hədisi-şərifdə **“Varlıqlardakı nizamı düşünərək Allahu təalaya iman edin!”** buyuruldu. Astronomiyanı oxuyub yer kürəsinin, Ayın, Günəşin və bütün ulduzların boşluqda fırlanmalarında və bir-birlərindən uzaqlıqlarında olan nizamı, hesabları anlayan kimsənin imanı artar. Dağların, mədənlərin, çayların, dənizlərin,

heyvanların, bitkilərin, hətta mikrobların yaradılmasında müxtəlif faydalar vardır. Heç biri boş yerə, lazımsız yaradılmamışdır. Buludlar, yağışlar, şimşəklər və ildırımlar, yer altındakı sular və enerji maddələri, hava, qısacası, hər varlıq müəyyən xidmətlər, müəyyən vəzifələr etməkdədir. İnsanlar bu saysız məxluqların sayıla bilməyəcək xidmətlərindən bu günə qədər çox azını anlaya bilmişdir. Məxluqları qavraya bilməyən insan ağlı bunların xaliqini, yaradanını necə qavraya bilər? Onun böyüklüyünü, sifətlərini bir az anlaya bilən islam alimləri heyrətə gəlmişlər. “Onu anlamaq, anlamağın mümkün olmayacağını anlamaqdır” demişdilər. Musa aleyhissəlamın ümmətindən biri otuz il ibadət etmişdir. Bir bulud ona kölgə edərək günəşdən qorumuşdur. Bir gün bulud gəlməmiş, günəşdə qalmışdı. Anasından səbəbini soruşdu. Hər halda bir günah etmisən, dedi. Xeyr, günah işləmədim, dedikdə, göylərə, çiçəklərə baxmadınmı? Onları gördükdə, yaradanın əzəmətini düşünmədinmi? dedi. Bəli, baxdım. Lakin, təfəkkürdə qüsur etdim, dedikdə, bundan böyük günah olarmı? Dərhal tövbə et, demişdi. Ağlı başında olan kimsənin təfəkkür vəzifəsinə laqeydlik etməməsi lazımdır. Sabah ölməyəcəyindən əmin olan kimsə varmı? Allahu təala heç bir şeyi batil, faydasız yaratmamışdır. İnsanların anlaya bilmədikləri, görə bilmədikləri faydalar anlaya bildiklərindən qat-qat daha çoxdur. Təfəkkür dörd cür olar, demişdilər. Allahu təalanın məxluqlarındakı gözəl sənətləri, faydaları düşünmək Ona inanmağa və sevməyə səbəb olar. Onun vəd etdiyi savabları düşünmək ibadət etməyə səbəb olar. Onun xəbər verdiyi əzabları düşünmək Ondan qorxmağa, kimsəyə pislik etməməyə səbəb olar. Onun nemətlərinin, lütflərinin qarşılığında nəfsinə tabe olaraq günah işlədiyini, qəflət içində yaşadığını düşünmək Allahdan həya etməyə, utanmağa səbəb olar. Allahu təala yerlərdə və göylərdə olan məxluqları düşünərək ibrət alanları sevər. Hədisi-şərıfdə, **“Təfəkkür kimi qiymətli ibadət yoxdur”** və **“Bir anlıq təfəkkür altmış il ibadətdən daha xeyirlidir”** buyuruldu. İmamı-Qəzəlinin farsca **“Kimyayi-səadət”** kitabında təfəkkür haqda ətraflı yazılmışdır.

## MÜSƏLMANA QARĞIŞ

34 – Hədisi-şərifdə **"Özünüzə, övladınıza qarğış etməyin. Allahın təqdirinə razı olun. Nemətlərini artırması üçün dua edin"** və **"Ananın, atanın övladına olan və məzlumun (zülmə məruz qalanın) zalıma olan qarğışı rədd olunmaz"** buyuruldu. Bir müsəlmanın kafir olması üçün dua edənin özü kafir olar. Bir zalımın kafir olaraq ölüb sonsuz əzab çəkməsini istəmək küfr olmaz. Musa aleyhissəlamın belə dua etdiyi Qurani-Kərimdə bildirilmişdir. İmamı-Azam Əbu Hənifə (rahimə-hullahü təala) başqasının kafir olmasını istəmək küfr olar, buyurdu. Zalımdan başqa kiməsə qarğış etmək haramdır. Zalıma zülmü qədər qarğış etmək caiz olar. Caiz olan bir şeyin miqdarı üzrün miqdarı qədər olar. Zalıma da qarğış etməmək, səbr etmək və hətta əfv etmək daha yaxşıdır. Zimmiyə (müsəlman dövlətində yaşayan kafirə) və hər hansı bir kafirə, Allah ömür versin demək caiz deyil. Müsəlman olması üçün və ya cizyə verərək müsəlmanların qüvvətlənməsi üçün belə dua etmək caiz olar.

## MÜSƏLMANA PİS AD QOYMAQ

35 – Müsəlmana pis ad qoymaq və ya başqasının qoyduğu pis adı söyləmək caiz deyil. Soyadı və ad-təxəllüs (ləqəb) qoymaq caizdir. Sıddıq Gümüş, Hüseyn Hilmi İşığın (rahmətullahi aleyh) ad-təxəllüsüdür. Hədisi-şərifdə **"Pis adı olan bunu gözəl ada çevirsin!"** buyuruldu. Məsələn, Asiyə adını Cəmilə etmək lazımdır. Müsəlmana gözəl ad qoymaq caizdir. Övlada tərifləyici ad qoymamaq lazımdır. Məsələn, Rəşid, Əmin adını verməmək lazımdır. Muhyiddin, Nurəddin kimi adlar da yalan və bidət olar. Fasiqləri, cahilləri, mürtədləri belə adlarla çağırmaq məkruhdur. Çünki bunlar mədh edici, tərifləyici adlardır. Məcazi olaraq da deyilə bilməz. Övladlarına bu adları təfəül[1]edərək, uğurlu olmaq üçün qoymaq

[1] Təfəül - bir şeyi uğur saymaq, xeyrə yozmaq, bir hadisəni xeyrə əlamət, işarət olaraq görmək.

caiz olar, deyilmişdir. Saleh olduqları məşhur olan alimləri bu adlar ilə zikr etmək caiz və faydalıdır.

[İbni Abidin (rahimə-hullahü təala) beşinci cilddə buyurur ki, uşağa qoyulacaq adlar arasında ən üstün olanı Abdullah, sonra Abdurrahman, sonra Muhamməd, sonra Əhməd, daha sonra İbrahimdir. Allahu təalanın adlarından olan Ali, Rəşid, Əziz kimi adları da qoymaq caizdir. Lakin bu adları söyləyərkən hörmət etmək lazımdır. Bilərəkdən hörmətsizlik edən kafir olar. Məsələn, adı Abdulqadir olana, Abdulqoydur demək, Həsən yerinə Hasso, İbrahim yerinə İbo demək, bu adlarla lağ etmək sayılır. Bu adlarla lağ etmək niyyət edilməzsə, küfr olmasa da küfrə bənzəyən şeyi söyləməkdən çəkinmək lazımdır. Uşaq dünyaya gəlib dərhal ölsə, ad qoymadan dəfn etmək olmaz. Abdunnəbi adı caiz isə də qoymamaq ehtiyatlı olar. Seyid Abdulhakim Arvasi həzrətləri hicri qəməri 1362-ci (miladi 1943) ildə vəfat edənə qədər İstanbulda, Bəyazid məscidində Çərşənbə axşamı, Cümə axşamı və Şənbə günləri əsr namazından sonra iyirmi beş il nəsihət və irşad etdi. Bir moizəsində, "Uşağın valideyni üzərində üç haqqı vardır: Doğulduqdan sonra müsəlman adı qoymaq, ağıllı olduqda kitabət, elm və sənət öyrətmək. Yetkin olduqda dini və əxlaqı gözəl bir müsəlman tapıb bununla dərhal evləndirməkdir" buyurdu. Qızlarını belə evləndirən ana-ata, hətta hər qohum, dostlar və hətta qonşular çox savab qazanarlar. Avropada, Amerikada din, ədəb düşməni olaraq yetişdirilən soysuzlara, uydurma diplom verərək professor ad və etiketi ilə islam məmləkətlərinə göndərirlər. Bu cahil kafirləri litseylərə, universitetlərə müəllim və professor təyin edirlər. Bunlar tələlərinə düşən müsəlman övladlarını dinsiz, məzhəbsiz edirlər. Bunlar asanca xain, qatil olurlar.]

## ÜZRÜ RƏDD ETMƏK

36 – Müsəlmanın üzrünü rədd etmək məkruhdur. Hədisişərifdə **"Müsəlman qardaşının üzrünü qəbul etməmək günah olar"** buyuruldu. Üzrü qəbul etmək və qüsurları əfv etmək Allahu təalanın sifətlərindəndir. Belə olmayan kimsəyə Allahu təala qəzəb

və əzab edər. Üzr istəmək üç cür olur: Nə üçün etdim? Və ya bunun üçün etdim. Kaş ki, etməsəydim demək və ya etdim, bir daha etmərəm, demək. Yaxud, etmədim deyərək inkar etmək. Etdim, bir daha etmərəm demək tövbə olar. Mömin, əfv etməsi üçün üzr istəməsini gözləyər. Münafiq eyiblərin ortaya çıxmasını istəyər. Hədisi-şərifdə **"İffət sahibi olun. Çirkin şeylər etməyin. Qadınlarınızı da afif** (iffətli) **edin"** və **"İffət sahibi olsanız, qadınlarınız da afif olar. Ananıza, atanıza lütf edərsəniz, uşaqlarınız da sizə lütf edər. Din qardaşının üzrünü qəbul etməyən kövsər hovuzundan içməyəcəkdir"** buyuruldu. Bu hədisi-şərif din qardaşının pislik etdiyini və üzrünün yalan olduğunu bilməyən kimsə üçündür. Çünki bunun üzrünü rədd etmək müsəlmana sui-zənn etmək olar. Yalan söylədiyini bilərək üzrünü qəbul etmək əfv olar. Əfv etmək vacib deyil, müstəhəbdir.

## QURANİ-KƏRİMİ SƏHV TƏFSİR ETMƏK

37 – Təfsir, bəyan etmək və kəşf etmək deməkdir. Bildirmək və açıqlamaqdır. **"Təvil"**, rücu (dönmə, yönəlmə) etməkdir. Təfsir, bir məna verməkdir. Təvil, müxtəlif mənalar arasından birini seçməkdir. Öz rəyi, görüşü ilə təfsir caiz deyildir. Təfsir rəvayət ilə edilir. Təvil dirayət (zəka, ağıl) ilə edilir. Hədisi-şərifdə **"Quranı-kərimi öz düşüncəsi, fikri ilə açıqlayan, doğru olsa da xəta etmişdir"** buyuruldu. Rəsulullahdan (sallallahu aleyhi və səlləm) və Əshabi-kiramdan (radıyallahu anhüm) gələn xəbərlərə, alimlərin təfsirlərinə və təfsir elminin qaydasına baxmadan, Qureyş lüğətini bilmədən, həqiqət ilə məcazı düşünmədən, mücməl[1], müfəssəl (geniş məna), ümumi və xüsusi olanları bir-birindən ayırmadan, ayəti-kərimələrin endirilmə səbəblərini və nasih, mənsuh[2, 3] olduqlarını araşdırmadan verilən mənanı Allahu təalanın kəlamı olaraq söyləmək doğru deyil. **"Təfsir"** kəlamı-ilahidən (Allahın

[1] Mücməl– bir açıqlayan tərəfindən açıqlanmadıqda mənası başa düşülməyən bağlı söz.

[2-20] Nasih – Daha əvvəl bildirilən bir hökmü qüvvədən salan ayəti-kərimə və ya hədisi-şərif. Qüvvədən düşən hökmə Mənsuh deyilir.

kəlamından) muradı-ilahini (Allahın muradını, istəyini) anlamaq deməkdir. Özündən verdiyi məna doğru olsa belə, üsuluna uyğun çıxarmadığı üçün xəta olar. Verdiyi məna səhv isə kafir olar. Hədisi-şərifləri də səhih və ya yalnış olduğunu bilmədən söyləmək səhih olsa belə günah olar. Belə kimsənin hədisi-şərif oxuması caiz olmaz. Hədis kitablarından hədis nəql etmək üçün hədis alimlərindən icazət (diplom) almaq lazımdır. Hədisi-şərifdə **“Uydurduğu bir sözü hədis olaraq söyləyən Cəhənnəmdə əzab görəcəkdir”** buyuruldu. Quranı-kərimi təfsir alimlərindən icazət almadan da təfsir kitablarından alaraq söyləməsi və yazması caizdir. Yuxarıda bildirilən təfsir etmək şərtlərinə sahib olan şəxs yazılı icazəti olmadan təfsir və hədis nəql edə bilər. İcazət vermək üçün pul almaq caiz deyil. Səlahiyyəti olana icazət vermək vacibdir. Səlahiyyəti olmayana icazət vermək haramdır.

Hədisi-şərifdə **“Quranı-kərimə səlahiyyəti olmadan məna verən Cəhənnəmdə əzab görəcəkdir”** və **“Bilmədiyini hədis olaraq söyləyən Cəhənnəmdə əzab görəcəkdir”** və **“Quranı-kərimə öz görüşünə görə məna verən Cəhənnəmdə əzab görəcəkdir”** buyuruldu. Bidət sahiblərinin öz zay, yalnış etiqadlarını isbat etmək üçün ayəti-kərimə və hədisi-şərif oxumaları belədir. [Vəhabilər, sələfilər kimi əhli sünnət olmayan firqələr belədir. Yusif-Nəbhani (rahmətullahi aleyh) belə yalnış təfsirləri **“Şəvahid-ül haqq”** kitabında ətraflı anlatmışdır. Quranı-kərimin zahiri mənası olduğu kimi daxili mənası da vardır deyərək, özlərinə görə məna verən fırıldaqçılar da belədir. Kəlmələrin öz zamanlarında, öz aralarında istifadə etdikləri mənalarına görə təfsir edənlər də belədir.

Osmanlı dövlətindəki alimlərdən Nuh ibn Mustafa Konevi (rahimə-hullahü təala) 1070-ci (miladi 1660) ildə Qahirədə vəfat etmişdir. Muhamməd Şihristanının (rahimə-hullahü təala) **“Miləl və Nihal”** kitabında etdiyi tərcümədə deyilir ki, **“İsmailiyyə”** təriqətində olanlar, imam Cəfər Sadiqin böyük oğlu İsmayılın yolundayıq dedikləri üçün bu adı götürmüşdürlər. Bunlara **“Batıniyyə”** təriqəti də deyilir. Çünki Quranın zahir mənası olduğu kimi batin mənası da vardır, dedilər. Zahir mənası fiqhçilərin qəlibləşdirdiyi müəyyən və məhdud şeylərdir. Batin mənası isə

Quranın iç mənası olub ucsuz dənizdir, dedilər. Zahir mənanı buraxıb, batin dedikləri, öz uydurduqları şeylərə inandılar. Halbuki Peyğəmbərimiz (sallallahu aleyhi və səlləm) Quranı-kərimin zahir, açıq mənasını bildirdi. Zahir mənanı buraxıb iç məna uydurmaq küfr olar. Fırıldaqçılıq olar. Bu hiylə ilə islamiyyəti yox etməyə çalışdılar. Çünki **"məcusilər"**, yəni atəşə tapınanlar islamın yayılmasının qarşısını almaq üçün rəisləri Hamdan Qurmut bu bölücülüyü meydana çıxarıb **"Qaramıta"** dövlətini qurdu. Hacıları qətl və Hacəri-əsvədi Kəbədən çıxarıb Basraya gətirdi. "Cənnət, dünya ləzzətləri, Cəhənnəm də, dinin əhkamına tabe olmaqdır" dedilər. Haramlara gözəl sənət adını verdilər. İslam dininin pis əxlaq, pozğunluq dediyi əxlaqsızlıqlara mənəvi təhsil deyərək gəncləri səfalətə sürüklədilər. Dövlətləri islamiyyətə çox zərər verdi. 372-ci ildə [m. 983] qəzəbi-ilahiyə tutulub məhv oldular.]

Təfsiri nəql surətiylə etmək lazımdır. Təfsir edə bilmək üçün bu on beş elmi bilmək lazımdır. Lüğət, nahv (cümlə elmi), sarf, iştiqaq, məani, bəyan, bədi, qiraət, din üsulu, fiqh, əsbabı-nüzul, nasih və mənsuh, fiqh üsulu, hədis, qəlb elmi. Bu elmləri bilməyənin təfsir etməsi caiz deyildir. İslam əhkamına tabe olan, rasih elmli[1] alimlərə Allahu təalanın vasitəsiz olaraq lütf etdiyi elmə **"Məvhibə"** və ya **"Qəlb elmi"** deyilir. Hədisi-şərifdə **"Elmi ilə əməl edənə, Allahu təala bilmədiklərini bildirər"** buyuruldu. Yuxarıdakı on beş elmə malik olmayan kimsənin təfsir etməsi caiz deyildir. Etsə, öz fikri ilə etmiş olar. Cəhənnəmdə yanmağa layiq olar. Hədisi-şərifdə **"Qırx gün ixlas ilə islamiyyətə tabe olan kimsənin qəlbini Allahu təala hikmət ilə doldurar. Bunları söyləyər"** buyuruldu. Təşbehli ayətlərə məna verən öz fikri ilə təfsir etmiş olar. Bidət sahiblərinin təfsiri belədir.

Quranı-kərimdə olan bilgilər üç qisimdir. Bir qismini heç bir quluna bildirməmişdir. Şəxsinin (zatının) və xüsusiyyətlərinin (sifətlərinin) həqiqəti və qeybdən xəbər verməsi belədir. İkinci qisim yalnız Peyğəmbərinə bildirdiyi sirdir. Bunları Peyğəmbər (aleyhissəlam) yalnız Allahu təalanın icazə verdiyi kimsələrə bil-

---

[1] Qurani-Kərimin və hədisi-şəriflərin dərin və incə mənalarını, işarələrini başa düşən böyük din alimi.

dirər. Üçüncü qisim bilgiləri Peyğəmbərinə (aleyhissalatu vəssəlam) bildirmiş və bütün ümmətinə bildirməsini əmr etmişdir. Bu üçüncü qisim də ikiyə ayrılır: Birincisi, ancaq eşitməklə öyrənilir. Qiyamət halları belədir. İkincisi, görüb araşdırmaqla və oxuyub mənasını anlamaqla öyrənilir. İman və islam bilgiləri belədir. Müctəhid imamlar belə Nasslarda (ayəti-kərimə və hədisi-şəriflər) açıq bildirilməmiş olan islamiyyət bilgilərini qəti olaraq başa düşməmişlər və ixtilafa düşmüşlər. Beləcə əməldə müxtəlif məzhəblər meydana gəlmişdir. Yuxarıda bildirilən on beş elmə sahib olanın çıxaracağı mənalara təfsir deyilməz, təvil deyilir. Çünki bu mənalarda öz rəyi olur. Yəni, anladığı müxtəlif mənalardan birini seçməkdə öz rəyini istifadə edər. Seçdiyi məna ayəti-kərimələrin və hədisi-şəriflərin açıq mənalarına, yaxud icmaya uyğun olmazsa, fasid olar (səhih olmaz). **“Bəriqa”** sonunda rəqsin haram olduğunu izah edərkən deyir ki, “Bizə təfsir kitablarına görə əməl etmək əmr olunmadı. Fiqh kitablarına tabe olmağımız əmr edildi.”

## HARAM İŞLƏMƏKDƏ İSRAR

38 – Günah işləməyi qəsd etmək, az işləsə də israr etmək sayılır. Qəsd etmək niyyət etməklə, iradə etməklə və qərar verməklə olur. Qərar verib bir dəfə də edərsə israr olur. Heç etməzsə, davamlı etməyi qəsd etməsi, qərar verməsi israr olmaz. Davamlı etməyə qərar verib və işləyib, lakin peşman olar, tərk edərsə israr olmaz. Gündə çox dəfə edib hər birindən sonra tövbə etmək, israr olmaz. Tövbə edərkən günah işlədiyinə peşman olub üzülmək, günahdan dərhal vaz keçmək və bir daha etməməyə qərar vermək şərtdir. Bu üç şərti etmədən, yalnız dil ilə tövbə etməsi yalançılıq olar. Kiçik günahlara israr etmək böyük günah olur. Bir böyük günahı bir dəfə etməkdən daha böyük olar. Tövbə etdikdə böyük günah da əfv olar. Kiçik günahı kiçik görmək böyük günahdır. Kiçik günah işlədiyini söyləyərək öyünmək böyük günah olar. Kiçik günah işləyəni alim və saleh sanmaq da böyük günah olar. Kiçik günah işlədikdə də Allahu təaladan və əzabından qorxmaq lazımdır. Allahu təaladan utanmazsa və əzab ediləcəyini düşünməzsə böyük günah olar.

**Qəlbi qara olana qiymət verərmi mal ilə mövqe?**
**Qızıl palan vursan da ulaq yenə ulaqdır.**

## QEYBƏT ETMƏK

39 – Hər hansı bir möminin və ya zimminin [qeyri musəlman vətəndaşın] eybini onu pisləmək məqsədilə arxasınca söyləmək qeybət olur. [Pisləyən sözlər doğrudursa **"qeybət"** olur. Yalandırsa **"iftira"** olur. Qeybət və iftira etmək böyük günah olduğu kimi bunları dinləmək də haramdır. Danışan və dinləyən Cəhənnəm alovunda yanacaqdır. Söyləyəni susdurmaq, susdura bilməsə, oradan qalxıb getmək və bunlar üçün dua etmək lazımdır. Dostların, tanışların adlarını yazıb divara asmaq, bu adlara hər baxanda sahiblərinə dua etmək lazımdır. Məzarların üzərinə daşlar düzülüb üzərilərinə meyitin adı yazılır, keçənlər, görənlər bu meyitə rəhmət və istiğfar (bağışlanma) oxuyurlar. İllərlə bu dualara qovuşan meyitlər qəbr əzabından qurtulur.] Qeybət haramdır. Qulaq asan o kimsəni tanımırsa qeybət olmaz. Qeybət olunan kimsə bunu eşidərsə üzülər. Bədənində, soyunda, əxlaqında, işində, sözündə, dinində, dünyasında, hətta geyimində, evində, heyvanında olan bir qüsur arxasınca söylənən zaman bunu eşitdikdə üzülərsə qeybət olar. Üstüörtülü söyləmək, işarə ilə, hərəkət ilə bildirmək, yazı ilə bildirmək də söyləmək kimi qeybətdir. Bir müsəlmanın günahı və qüsuru söyləndiyi zaman hafizlərin və din adamlarının, əlhamdulillah biz belə deyilik deməl əri, qeybətin ən pisi olur. Birisindən bəhs edilərkən, əlhamdulillah, Allah bizi həyasız etmədi, kimi sözlərlə onu pisləmək çox çirkin qeybət olur. Filan kimsə çox yaxşıdır, ibadətdə bu qüsuru olmasa, daha yaxşı olardı demək qeybət olur. Hucurat surəsinin on ikinci ayətində məalən, **"Bir-birinizi qeybət etməyin"** buyuruldu. Qeybət, dedi-qodu etmək deməkdir. Birisini qeybət etmək, ölmüş insanın ətini yemək kimi olur, buyuruldu. Hədisi-şərifdə, **"Qiyamət günü bir nəfərin savab dəftəri açılır. Ya Rəbb! Dünyada bu ibadətləri etmişdim. Səhifədə bunlar yazılı deyil, deyər. Onlar dəftərindən silindi, qeybət etdiklərinin dəftərlərinə yazıldı, deyilər"** və **"Qiyamət günü bir kimsənin**

**savab dəftəri açılır. Etməmiş olduğu ibadətləri orada görür. Bunlar səni qeybət edənlərin savablarıdır, deyilər”** buyuruldu. Əbu Hüreyrə (radıyallahu anh) deyir ki, Rəsulullah (sallallahu aleyhi və səlləm) ilə otururduq. Aramızdan birisi qalxıb getdi. Ya Rəsulallah! Rahatsız olub getdi, deyildi. **“Dostunuzu qeybət etdiniz, ətini yediniz”** buyurdu. Aişə (radıyallahu anhə) deyir ki, Rəsulullahın (sallallahu aleyhi və səlləm) yanında bir qadının uzun olduğunu söylədim, **“Ağzındakını çıxart!”** buyurdu. Tüpürdüm. Ağzımdan ət parçası çıxdı. Allahu təala sifətləri, özəllikləri cisim şəklində göstərməyə qadirdir. Qeybət din qardaşının, bir zimminin eşidəcəyi zaman üzüləcəyi bir qüsurunu arxasından söyləməkdir. Allahu təala Musa aleyhissəlama vəhy etdi ki, “Qeybət edib tövbə edən Cənnətə ən son gedəcəkdir. Qeybət edib tövbə etməyən Cəhənnəmə ən birinci gedəcəkdir”. İbrahim Ədhəm (rahiməhullahü təala) bir yeməyə dəvət edilmişdi. Süfrədə dəvət olunanlardan birinin olmadığı deyildiyi zaman, o ağır adamdır, deyildi. İbrahim ibn Ədhəm (rahimə-hullahü təala), qeybət edildi, buyurdu və çıxıb getdi. Hədisi-şərifdə, **“Bir kimsə üçün söylənən qüsur onda varsa bu söz qeybət olur. Yoxsa böhtan, yəni iftira olur”** buyuruldu. Dindəki qüsurları söyləmək, məsələn, namaz qılmaz və ya şərab içər və ya oğurluq edər və ya söz daşıyandır, demək və dünyadakı qüsurlarını söyləmək, məsələn kar, çəpgöz demək qeybət olur. Dindəki qüsurlarını onu pisləmək məqsədilə söylənərsə, qeybət olur. Onun xeyrini düşünərək söylənərsə qeybət olmaz. Yazığı gəldiyi üçün də qeybət olmaz, deyildi. Bu kənddə namaz qılmayan var və ya kommunist var, oğru var demək qeybət olmaz. Çünki bəlli bir şəxs söylənməmişdir.

Bir şəxs namaz qılar, oruc tutar, həm də əli ilə insanlara zərər verər. Məsələn, döyər, mallarını qəsb edər, oğurluq edər. Yaxud dili ilə zərər verər. Məsələn, söyər, iftira edər, qeybət edər, söz daşıyar. Açıq-aşkar edilən fisq, haram və bidətləri söyləmək qeybət olmaz. Bunların qarşısını almaq üçün hökumətə xəbər vermək günah olmaz. Bir kimsə atasından gizli haram işləyərsə, atasının mane olacağını bilirsə, atasına söyləməsi və ya yazaraq bildirməsi lazımdır. Mane olacağını bilmirsə xəbər verməsi caiz olmaz. Çünki düşmənçiliyə səbəb olar. Birinin zərərlərini ona yazığı gəldiyi

üçün və ya başqalarının ondan qorunması üçün söyləyərsə qeybət olmaz. Onu pisləmək üçün söyləyərsə qeybət olar. Altı qrup insanın qüsurlarını, eyiblərini arxasından söyləmək qeybət olmaz: Ona yazığı gəldiyi üçün söyləmək, ona mane olunması üçün söyləmək, fətva almaq üçün söyləmək, müsəlmanları onun şərindən qorumaq üçün söyləmək, o qüsur ona ad olmuş isə, onu bu ad ilə tanıtdırmaq məcburiyyətində olmaq, aşkar, hər kəsə bilinən fisqi, bidəti və zülmü söyləmək. Hirslənərək onu pisləmək niyyətilə söyləmək qeybət olur. Satışda olan malın qüsurunu müştəriyə demək satıcını qeybət etmək sayılmır. Evlənəcək kişiyə nikah edəcəyi qızın eybini, qüsurunu xəbər vermək qeybət olmaz, nəsihət olur. Bir şeyi bilməyənə nəsihət vermək vacibdir. Aşkar haram işləyənin və zülm edənin gizli olan başqa eyiblərini bildirmək qeybət olur. Hədisi-şərifdə **"Həya cilbabını çıxaran insandan danışmaq qeybət olmaz"** buyuruldu. Cilbab, qadınların geniş baş örtüyüdür. Burada həya cilbabını çıxartmaq, aşkar haram işləmək deməkdir. Hədisi-şərif belə insanın həyasının olmadığına işarə edir. İmam Qəzali və bəzi alimlər (rahimə-hümullahü təala) aşkar günah işləyənin və başqalarının qüsurunu deməyin qeybət olmasında onu pisləmək şərt deyildir, dedilər. Bunun üçün qeybət etməkdən çox çəkinmək lazımdır.

İnsanı qeybət etməyə sürükləyən səbəblər çoxdur. Burada on biri bildiriləcəkdir: Ona qarşı düşmənlik, yanında olanların fikirlərinə tabe olmaq düşüncəsi, sevilməyən bir kimsəni pisləmək, özünün o günahda olmadığını bildirmək, özünün ondan üstün olduğunu bildirmək, həsəd aparmaq, yanında olanları güldürmək, zarafatlaşmaq, ona lağ etmək, gözləmədiyi insanın haram işləməsinə heyrətini bildirmək, buna üzüldüyünü, ona acıdığını bildirmək, haram işlədiyi üçün onu sevmədiyini bildirmək.

Qeybət, insanın savablarının azalmasına, başqasının günahlarının ona verilməsinə səbəb olur. Bunları hər zaman düşünmək insanın qeybət etməsinə mane olar.

Qeybət üç cürdür: Birinci halda, mən qeybət etmədim, onda olanı dedim, deyər. Belə demək küfr olur. Çünki harama halal demiş olur. İkincisində, qeybət olunana eşitdirməkdir. Böyük haram olur. Tövbə etməklə əfv edilməz. Onunla halallaşmaq da lazımdır.

Üçüncüsündə, qeybət olunanın bundan xəbəri olmaz. Tövbə və istiğfar etməklə, ona xeyir-dua etməklə əfv olur.

Yanında qeybət edildiyini eşidən kimsə buna tez mane olmalıdır. Hədisi-şərifdə, **“Din qardaşına onun xəbəri olmadan kömək edən kimsəyə, Allahu təala dünyada və axirətdə kömək edər”** və **“Yanında din qardaşının qeybəti edildikdə, gücü çatdığı halda ona kömək etməyən kimsənin günahı dünyada və axirətdə özünə bəs edər”** və **“Bir kimsə dünyada din qardaşının ismətini qoruyarsa, Allahu təala bir mələk göndərərək onu Cəhənnəm əzabından qoruyar”** və **“Bir kimsə din qardaşının namusundan bir şeyi qoruyarsa, Allahu təala onu Cəhənnəm əzabından qoruyar”** buyuruldu. Qeybət edilərkən orada olan kimsə qorxmazsa, söz ilə, qorxarsa, qəlbi ilə rədd etməzsə qeybət günahına ortaq olar. Sözünü kəsməsi və yaxud qalxıb getməsi mümkündürsə bunları etməlidir. Əli ilə, başı ilə, gözü ilə rədd etməsi kafi gəlməz. Aşkar sus deməsi lazımdır.

Qeybət etməyin kəffarəsi üzülmək, tövbə etmək və onunla halallaşmaqdır. Peşman olmadan halallaşmaq riya (göstəriş) olur, ayrı bir günahdır. [Ölünü və zimmi olan kafiri qeybət etməyin haram olduğu İbni Abidin beşinci cild 263-cü səhifədə yazılmışdır]

**Haqq iradə edincə yol verir hər kəs sənə,**
**Xəlq edər səbəblərini, bol verir hər şey sənə**

## TÖVBƏ ETMƏMƏK

40 – Tövbə, haram işlədikdən sonra peşman olub Allahu təaladan qorxmaq, bir daha etməməyə əzm etmək, qərar verməkdir. Dünyada zərərə düşməsindən qorxaraq peşman olmaq tövbə olmaz. Müxtəlif günah işləyənin bunlardan bəzisində israr edərkən, bəzisinə tövbə etməsi səhih olur. Tövbədən sonra günahı təkrar işləyənin təkrar tövbə etməsi səhih olur. Beləcə çox kərrə tövbə etməsi səhih olur. Böyük günahın bağışlanması üçün tövbə etmək şərtdir. Beş vaxt namaz və Cümə namazı, Ramazanı-şərif orucu, həcc etmək, istiğfar etmək, böyük günah işləməkdən çəkinmək kimi

ibadətlər, kiçik günahların bağışlanmasına səbəb olur. Şərtlərinə uyğun olaraq tövbə etdikdə, küfr və günahlar şübhəsiz bağışlanır. Şərtlərinə uyğun olaraq və ixlas ilə edilən həccə, **“Həcci-məbrur”** deyilir. Həcci-məbrur, qəzaya qalan fərzlərdən və qul haqlarından başqa günahların əfvinə səbəb olur. Bu ikisinin əfv olması üçün qəzaların və qul haqlarının ödənməsi də lazımdır. Həccə getməklə fərzi yerinə yetirməməyin günahı əfv edilməsə də, vaxtında etməməyin, vaxtından sonraya saxlamağın günahı əfv edilir. Həcdən sonra fərzləri qəza etməyə dərhal başlamazsa, gecikdirmə günahı təkrar başlayar və zamanla qat-qat artar. Gecikdirmək böyük günahdır. Bunu yaxşı başa düşmək lazımdır. **“Həcci-məbrur edənin günahları əfv olar. Dünyaya yeni gəlmiş kimi olar”** hədisi-şərifi qəza və qul haqqından başqa günahların əfv olacağını göstərir. Rəsulullahın (sallallahu aleyhi və səlləm) arəfə gecəsində və Müzdəlifədə hacıların günahlarının əfv edilməsi üçün etdiyi dualarında bu cür olduğu bildirilmişdir. Qəza və qul haqlarının da əfvə daxil olduğunu bildirən alimlər varsa da bunlar tövbə edib qəzadan və ödəməkdən aciz olanlar üçündür. Hud surəsinin 115-ci ayəti-kəriməsində məalən, **“Həsənə** (yaxşı əməl) **günahları yox edər”** buyuruldu. Bu ayəti-kəriməyə qəzası icra edildiyi zaman əfv olurlar mənası verilmişdir. Qeybət olunan bir şəxsin eşitməsindən sonra üzülməsi də, bu qeybəti edən üçün ayrıca böyük günah olur. Bu günahın əfvinə səbəb olacaq həsənə onunla halallaşmaqdır.

Günahdan sonra dərhal tövbə etmək fərzdir. Tövbəni gecikdirmək də, bu günahı etməkdən daha böyük günahdır. Bu günah hər gün bir misli artar. Bunun üçün də ayrıca tövbə etmək lazımdır. Bir günahın tövbəsi edildikdə bunun tövbəsini gecikdirmə günahlarının hamısı əfv olur. Fərzi etməməyin tövbəsi yalnız qəza etməklə olur. Hər günahın əfvi üçün qəlb ilə tövbə etmək, dil ilə istiğfar etmək və bədən ilə qəza etmək lazımdır. Yüz dəfə təsbeh etmək, yəni **“Sübhanəllahi və bi-hamdihi sübhanəllahil azım”** demək, sədəqə vermək və bir gün oruc tutmaq çox yaxşı olar.

Nur surəsinin otuz birinci ayətində məalən: **“Ey möminlər! Allaha tövbə edin!”** buyuruldu. Tahrim sürəsində məalən, **“Allaha tövbəyi-nasuh edin”** buyuruldu. Nasuh kəlməsinə iyirmi üç məna verilmişdir. Bunlardan ən məşhuru peşman olub, dili ilə istiğfar

etmək və bir daha işləməməyə qərar verməkdir. Bəqara surəsində 222-ci ayətində məalən, **“Allahu təala tövbə edənləri sevər”** buyuruldu.

Hədisi-şərifdə, **“Ən yaxşınız günahdan sonra dərhal tövbə edəninizdir”** buyuruldu. Günahların ən böyüyü küfr, münafiqlik və irtidaddır.

[Müsəlman olmamış və olmayan kimsəyə, **“Kafir”** deyilir. Müsəlmanları aldatmaq üçün müsəlman görünən kafirə **“Münafiq”** və **“Zındıq”** deyilir. Müsəlman ikən kafir olan kimsəyə irtidad etdi (döndü) deyilir. İrtidad edənə **“Mürtəd”** deyilir. Bu üçü qəlbindən inanaraq xalis iman edərsə, şübhəsiz müsəlman olar.

**“Bəriqa”** və **“Hadiqa”**da dil fəlakətlərində və **“Məcmaül-ənhür”**də deyilir ki, “Kişi və ya qadın bir müsəlman alimlərin söz birliyi ilə küfrə səbəb olacağını bildirdikləri bir sözün və ya işin küfrə səbəb olduğunu bilərək, qəsdən [yəni təhdid edilmədən, öz istəyilə] və ya başqalarını güldürmək üçün söyləyər və ya edərsə, mənasını fikirləşməsə belə imanı gedər, **“mürtəd”** olar. Buna **“Küfri-inadı”** deyilir. Əgər bunun küfrə səbəb olduğunu bilməyib qəsdən deyər və ya edərsə, yenə mürtəd olar. Buna **“Küfri-cəhli”** deyilir. Çünki hər müsəlmanın bilməsi lazım olan şeyləri öyrənməsi fərzdir. Bilməməsi üzr deyil, böyük günahdır. Küfri-inadı və küfri-cəhli ilə mürtəd olanın nikahı pozular. Xanımından vəkalət alaraq, iki şahid yanında və ya məsciddə camaat ilə **“Təcdidi-nikah”** (nikahı təzələmək) etməsi lazım olur. İkidən çox təcdid üçün **“Hullə”** lazım olmaz. Küfrə səbəb olan sözü xəta edərək [yəni qəsdən olmayıb, çaşaraq] və ya təvilli (məcazi, başqa mənada) və ya ikrah [təhdid] edilərək söyləyərsə mürtəd olmaz və nikahı pozulmaz. Küfrə səbəb olması alimlər arasında ixtilaflı olan bir sözü qəsdən deyən mürtəd olmasa da, bunun tövbə, istiğfar və təcdidi-nikah etməsi ehtiyatlı olar.” Məscidlərə gedən müsəlmanın küfri-inadı və küfri-cəhli ilə mürtəd olmasını düşünmək olmaz. Yalnız bu son şəkildə mürtəd olması mümkün ola biləcəyindən, imam əfəndilər camaata, **“Təcdidi-iman”** duasını, yəni **“Allahummə inni üridü ən ücəddidəl-imənə vənnikəha təcdidən bi-qavli lə iləhə illallah Muhamməddun Rəsulullah”** oxudaraq tövbə və təcdidi-nikah edilir. Beləcə, **“Lə iləhə illallah deyərək, təcdidi-iman edin!”**

hədisi-şərifindəki əmr yerinə yetirilmiş olur. [Hər zaman hər xanım ərinə “aramızdakı nikahı təcdid emək üçün səni vəkil təyin etdim” deməli, kişi də “bu vəkaləti qəbul etdim” deməlidir. İmam əfəndi hər Cümə namazında duadan sonra təcdidi-iman duasını oxumalı, camaat da birlikdə deməlidir. Hamısının imanları və nikahları təzələnmiş olur.]

Əhli sünnət alimlərinin (rəhimə-hümullahü təala) sözbirliyi ilə olmayan bildirdiklərinə uymayan inanca **“Bidət”** və **“Dəlalət”** deyilir. Küfrdən sonra ən böyük günah bidət sahibi olmaqdır. Bunlardan öz bidətini yayanların, müsəlmanlara bulaşdırmaq üçün çalışanların günahı qat-qat daha çoxdur. Hökumətin bunlara ağır cəza verməsi, alimlərin sözlə və yazı ilə nəsihət verməsi, cahillərin də bunlarla görüşməməsi, kitablarını və məcmuələrini oxumaması lazımdır. Bunların yalanlarına, iftiralarına, həyəcanlı və alovlu sözlərinə aldanmamaq üçün ayıq olmaq lazımdır. Hal-hazırda məzhəbsizlər, cahillər və müxtəlif adlar altında ortaya çıxmaqda olan saxta təriqətçilər, yalançı şeyxlər, zay etiqadlarını, pozğun inanclarını yaymaq üçün hər cür vasitələrdən istifadə edirlər. Müsəlmanları aldatmaq və əhli-sünnəti əzmək, yox etmək üçün nəfslərinin, şeytanın və ingilislərin köməyi ilə ağla və xəyala gəlməyən tələlər, oyunlar hazırlayırlar. Mallarını, milyonlarını sərf edərək, əhli-sünnətə qarşı soyuq müharibələrini sürdürürlər. Gənclərin, islam dinini, haqq yolunu Əhli-sünnət alimlərinin kitablarından oxuyub öyrənmələri lazımdır. Öyrənməyən küfr, bidət və dəlalət selinə düşüb boğular. Dünya və axirət fəlakətlərinə düçar olar. [Həqiqət Kitabevi, yalnız Əhli-sünnət kitablarını nəşr etməkdədir. Bu kitabları alıb oxuyanlara müjdələr olsun!] Bidət sahiblərinin liderləri Qurani-Kərimə səhv, yalnış mənalar verirlər. Bu mənaları irəli sürərək pozğun düşüncələrini ayə ilə, hədis ilə isbat etdiklərini irəli sürürlər. Yalnız əhli-sünnət kitablarını oxuyaraq haqqı başa düşənlər bunlara aldanmaqdan qurtulur. Haqqı bilməyənlərin, bunların dəlalət girdablarına, tələlərinə düşməmələri imkansızdır. Bunların pozğun inancları Qurani-Kərimdə və hədisi-şəriflərdə aşkar bildirilmiş olan və müctəhid imamların sözbirliyi ilə bildirdikləri, müsəlmanlar arasına yayılmış iman bilgilərinə uyğun olmasa kafir olarlar. Küfrün bu növünə **“İlhad”** və özlərinə

**“Mülhid”** deyilir. Mülhidlərin müşrik olduqları, yəni kitabsız kafir sayıldıqları aqaid kitablarında yazılıdır.]

Bidət sahiblərinin, mürtədlərin də tövbələri qəbul olur. Bunların tövbə etmələri üçün Əhli-sünnət etiqadını qısaca öyrənib inanmaları, pozğun etiqadlarına peşman olmaları lazımdır.

Fərzlərə əhəmiyyət verib tənbəlliklə yerinə yetirməyən mürtəd olmaz, imanı getməz. Lakin bir fərzi etməyən müsəlman iki böyük günaha girər. Birincisi, o fərzin vaxtını ibadətsiz keçirtmək, yəni fərzi gecikdirmək günahıdır. Bunun əfv olunması üçün “tövbə etmək”, yəni peşman olmaq, üzülmək, bir daha gecikdirməyəcəyinə qərar vermək ilə olur. İkincisi, bu fərzi tərk etmək, yerinə yetirməmək günahıdır. Bu böyük günahın əfv olması üçün bu fərzi dərhal qəza etmək, yəni vaxtından sonra yerinə yetirmək lazımdır. Qəzanı gecikdirmək də ayrıca böyük günahdır.

[Böyük islam alimi, on dördüncü əsrin mücəddidi, zahiri və batini elmlərin mütəxəssisi, mədrəsətül-mütəxəssisin müdərrislərindən, təsəvvüf kürsüsü professoru Seyid Abdulhakim Əfəndi (rahiməhullahü təala) dərslərində, məscidlərdə söhbətlərində və nəsihətlərində tez-tez deyirdi ki, “Bir fərzi üzrsüz olaraq vaxtında yerinə yetirməmək böyük günahdır”. Vaxtından sonra dərhal qəza etməməyin də daha böyük günah olduğu kitablarda yazılmışdır. **“Fərzin vaxtı keçdikdən sonra bu fərzi yerinə yetirəcək qədər zaman içində bu fərz üzrsüz olaraq qəza edilməzsə, gecikdirmə günahı bir misli qədər artar. Beləcə fərzi yerinə yetirəcək qədər zamanların hər biri gecikdikcə günahlar qat-qat artaraq sayıla bilməyəcək və düşünülə bilməyəcək qədər çoxalır.”** Bir fərzin qəzası üzrsüz olaraq edilməyincə günahı beləcə artar. Beş vaxt namazın hər biri hər gün fərz olduğu üçün hər qəzanın günahı yenidən başlayar. Beş vaxt namaz üçün bir gündə yuxarıda bir fərz üçün bildirilənin beş misli qədər çoxalar. Aylarca, illərcə qılınmayan namazların günahlarının nə qədər çox olacağı bundan məlum olar. Bu müdhiş, bu qorxunc günahların altından qurtulmaq üçün hər çarəyə baş vurmaq lazımdır. İmanı olan və ağlı başında olan birinin gecə gündüz qəza namazı qılaraq, Cəhənnəmdəki namaz qılmamaq əzabından qurtulmaq üçün çalışması lazımdır. Çünki üzrsüz olaraq, tənbəlliklə, ərinərək qılınmayan bir namaz üçün

yetmiş min il Cəhənnəmdə əzab çəkiləcəyi bildirildi. Yuxarıda açıqlanan saysız namaz günahları üçün Cəhənnəmdə nə qədər çox əzab çəkiləcəyini düşünən bir müsəlmanın yuxusu qaçar, yemək-içməkdən kəsilər. Dünyası zindan olar. Bəli, namaza əhəmiyyət verməyən, vəzifə qəbul etməyən kafir olar, mürtəd olar. Mürtəd Cəhənnəmdə sonsuz əzab çəkəcəkdir. O, onsuz da Cəhənnəmə də, əzaba da, namazın əhəmiyyətinə də inanmır. Dünyada heyvan kimi yaşayır, zövqündən və zövqünə vasitə olan pulu, malı yığmaqdan başqa bir şey düşünmür. "Hər nə olursa olsun, hər kimə nə zərər, ziyan olursa olsun yalnız mənə gəlsin" onun prinsipidir. Onun zövq və səfası üçün hər şeyin, hər kəsin fəda olması vecinə belə deyildir. İmanı və ağlı yoxdur. Bu cür insanda mərhəmət olmaz. Canavardan və qorxunc heyvandan daha zərərli olar. Onun insanlıqdan, mərhəmətdən, yaxşılıqdan danışması havaya yazı yazmaq kimidir. Öz mənfəəti üçün heyvani, ehtiraslı arzularına qovuşması üçün bir tələdir.

İllərlə qılınmamış namazları qəza etmək imkansız olmuşdur. İnsanlar islamiyyəti tərk etdikləri üçün, yəni Allahu təalanın əmrlərinə və qadağalarına riayət etmədikləri üçün və islam dininin göstərdiyi rahat və dinclik yolundan ayrıldıqları üçün dünyada bərəkət qalmadı. Ruzi-bərəkət azaldı. Taha surəsinin 124-cü ayəti-kərimədə məalən **"Məni unutsanız ruzilərinizi kəsərəm"** buyuruldu. Bunun üçün iman ruzisi, səhhət ruzisi, qida ruzisi, insanlıq və mərhəmət ruzisi və daha necə belə ruzilər azaldı. "Haşa, zülm etməz quluna Xudası, hər kəsin çəkdiyi öz cəzası" sözü Nahl surəsinin otuz üçüncü ayətindən alınmışdır. Bu günkü küfr qaranlıqları və Allahu təalanı, Peyğəmbəri (sallallahu təala aleyhi və səlləm), islamiyyəti unutmağın bərəkətsizlikləri və sıxıntıları içində insan gecə gündüz qadınlı kişili işləyib bir ailənin ehtiyacını, rahat yaşamağını təmin edə bilməyəcək vəziyyətə gəlmişdir. Allahu təalaya inanmadıqca, Onun bildirdiyi islam dininə tabe olmadıqca, Onun Peyğəmbərinin gözəl əxlaqı ilə bəzənmədikcə, beş vaxt namazı vaxtında qılmadıqca dəlalət, fəlakət axıntısını saxlamaq imkansızdır.

Namazların qəzalarını ödəmək üçün hər gün sabah namazından başqa dörd vaxt namazın sünnətlərini qılanda, ilk qəzaya qal-

mış namazı qəza etməyi də niyyət etmək lazımdır. Beləcə hər gün bir günlük namaz qəzası ödənmiş olur. Həm də sünnət qılınmış olur. Qəzaların bu niyyət ilə necə qılınacağı və qılmaq lazım olduğu **“Səadəti-Əbədiyyə”** kitabında geniş bildirilmişdir. Günahlara bir dəfə tövbə etməklə hamısının əfv olacağı bildirilmişdir. Namaz tövbəsinin doğru olması üçün tərk edilmiş hər namazın qəza edilməsi lazımdır. Qəzalarını qılaraq tövbə etməyə başlayan ömrü boyunca, yəni qəzaları qurtarana qədər qəzalarını qılmağa niyyət etmiş sayılır. Allahu təala bu meyitin bu niyyətinə görə bütün qəzalarını əfv edəcəkdir. Bunun kimi istiğfar oxumağa davam edənin bütün günahları və kafirlər imana gəldikdə bütün keçmiş günahları əfv olacaq və iman etməyənlərə Cəhənnəmdə əbədi əzab veriləcəkdir.

Bundan yüz illər əvvəl, fiqh kitablarının yazıldıqları vaxtlarda müsəlmanların imanlarının qüvvəti, Allahu təaladan və Cəhənnəm əzabından qorxuları çox idi. Namazı üzrsüz tərk etmək yada düşməzdi. Namazı tərk edənə rast gəlmək ağıla gəlməzdi. O zamanlar üzr ilə və çox az sayda namaz, **“Fəvt”** edilir, qaçırılırdı. Bu da bir müsəlman üçün böyük matəm, hüzn olardı. Namazın qəzaya qalması üçün üzr yuxuya getmək, unutmaq, müharibədə və səfərdə oturaraq da qılmağa imkanı olmamaqdır. Bu üzrlərdən birinə görə namazın fəvt edilməsi günah olmaz. Lakin, üzr bitən kimi bu namazı qəza etmək fərz olur. Üzr ilə fəvt edilən namazların qəzalarını ailənin ehtiyacını qazanacaq qədər gecikdirmək caizdir. Üzr ilə qılınmayan namazların qəzalarını, müəkkəd sünnətlər yerinə qılmaq lazım deyil. Fiqh kitablarının “müəkkəd sünnətlər əvəzinə qılmamaq daha yaxşıdır” deməsi, üzr ilə qılına bilinməyən namazlar üçündür. Üzrsüz tərk edilən fərzləri dərhal qəza etmək fərzdir. Bunları sünnət yerinə də qılmaq lazımdır. İmamı-Rabbani 123-cü məktubda buyurur ki, “Nafilə ibadət bir fərzi tərk etməyə səbəb olarsa ibadət olmaz. Ma-la-yani (mənasız iş), zərərli olar.”]

[Böyük alim İbni Abidin (rahmətullahi aleyh) buyurur ki, “Məscidə girən kimi iki rükət namaz qılmaq sünnətdir. Buna **“Təhiyyətül-məscid”** deyilir. Məscidə girdikdə fərz, sünnət, qəza kimi hər hansı bir namazı qılmaq təhiyyətül-məscid yerinə keçər. Buna görə ayrıca təhiyyətül-məscid deyə niyyət etmək lazım de-

yil. Halbuki bir vaxtın fərzi və sünnəti deyə iki niyyət edilən bir namaz belə deyil. Burda təkcə fərz namazı səhihdir. Bir məscidə girdikdə, hər hansı bir namazı qılan zaman ayrıca niyyət etmədən bunlarla təhiyyətül-məscid namazı da qılınmış sayılır. Lakin savab hasil olması üçün buna da niyyət edilir. Çünki niyyət edilməyən ibadətə savab verilməz". Abdulhakim əfəndi (rahmətullahi aleyh) buyurdu ki, "Sünnət namaz demək, fərzdən başqa qılınan namaz deməkdir. Fərzdən əvvəl və ya sonra olan sünnət yerinə qəza qılan, bu qəza namazı ilə sünnət namazının tərifinə əməl etdiyi üçün sünnəti də qılmış olur." Burdan görünür ki, sünnət yerinə qəza qılan da sünnəti tərk etmiş olmur. Həm qəza, həm də sünnətə niyyət edəndə sünnətin savabı da hasil olur.]

Qəzaları yuxarıda bildirilən şəkildə ödəməyə niyyət edən və başlayan şəxs ağır xəstə olsa, öləndən sonra namaz kəffarəsi edilməsi ücün **"vəsiyyət"** etməsi, Vəlisinin də bu vəsiyyəti yerinə yetirməsi lazımdır. Vəli, vəsiyyət olunan şəxs və ya varislərdən biri deməkdir. Namaz qılanda vaciblərdən biri tərk edilmiş və ya məkruh işlənmiş isə vaxtın içində iadə edilməsi (yenidən qılınması) vacibdir. Nafilə namazı da qılanda fasid olarsa, yəni pozulacaq bir şey olarsa iadə edilməsi vacibdir. Zəkatı, sədəqəyi-fıtrı, nəziri və qurbanı da hər zaman qəza etmək lazım olur. Sonradan kasıb olanın **"Hiləyi-şəriyyə"** (harama düşməmək üçün dinə uyğun çarə) deyilən rahatlıqla, bunları qəza etmələri lazımdır. Kasıb olmasalar hiləyi-şəriyyə etmələri məkruh olar.

Allahu təala ilə qul arasında olan, yəni qul haqqı olmayan günahların əfv olması üçün gizlicə tövbə etmək kafidir. Başqalarına xəbər vermək, imam əfəndiyə bildirmək lazım deyil. Pul verərək keşişə günah əfv etdirmək xristianlıqda edilir. İslamiyyətdə belə şey yoxdur. Qüslsuz ikən Qurani-Kərim oxumaq, məsciddə oturmaq, məsciddə dünya işlərini danışmaq, yemək, içmək, yatmaq, Qurani-Kərimə dəstəmazsız toxunmaq, çalğı çalmaq, şərab içmək, zina etmək və qadınların başları, qolları, baldırları, saçları açıq küçəyə çıxmaları qul haqqı sayılmayan günahlardır. Heyvan haqqı olan günahları əfv etdirmək çox çətindir. Heyvanı haqsız olaraq öldürmək, döymək, üzünə vurmaq, taqətindən çox sürmək, ağır yük vurmaq, otunu, suyunu zamanında verməmək

günahdır. Bu günaha həm tövbə etmək, həm də istiğfar edib yalvarmaq lazımdır.

Qul haqqı beş növdür. Mala, nəfsə, ismətə, məhrəmə və dinə bağlı haqlar. Oğurluq, qəsb, aldatmaq ilə, yalan deməklə mal satmaq, saxta pul vermək, başqasının malına ziyan vurmaq, yalançı şahidliklə, zalıma xəbər verməklə, rüşvət verməklə malına zərər vermək – "mala bağlı" olan qul haqlarındandır. Bir qəpik, bir dən mal üçün tövbə etmək və sahibi ilə halallaşmaq lazımdır. Mal haqları üçün uşaqların da halallaşması, ödəmələri lazımdır. Dünyada halallaşmasa, axirətdə savabları ona verilərək halallaşdırılacaqdır. Mal sahibi ölmüşsə varisinə ödənir. Varisi yoxsa və ya mal sahibi bilinmirsə, kasıba hədiyyə olaraq verilib savabı sahibinə göndərilir. Saleh olan kasıb müsəlman yoxdursa, islamiyyətə və müsəlmanlara xidmət edən xeyir cəmiyyətlərinə, fondlara verilir. Öz saleh qohumuna, kasıb olan analarına, atalarına, uşaqlarına hədiyyə olaraq vermək də caizdir. Kasıba hədiyyə deyərək verilən şey sədəqə olur. Sədəqə savabı hasil olur. Bunları etmək imkanı olmasa, mal sahibinin və özünün əfv olmaları üçün dua edər. Kafirin haqqı üçün də onunla halallaşmaq lazımdır. Könlü alınmazsa, axirətdə əfv olması çox çətin olacaqdır.

Nəfsə aid, yəni həyati günah, adam öldürmək, bir üzvünü tələf etməkdir. Əvvəl tövbə etmək, sonra özünü onun Vəlisinə təslim etmək lazımdır. Vəlisi istəyərsə əfv edər, istəyərsə mal qarşılığında sülh bağlayar. İstərsə məhkəməyə verib hakimdən cəzalandırılmasını istəyər. Özünün əvəz çıxması caiz deyil. [İslamiyyətdə qan davası yoxdur.] İsmətə toxunan qul haqqı, qeybət, böhtan, lağ etmək, söymək kimi şeylərdir. Tövbə etmək və halallaşmaq lazımdır. Bunlarda varislə halallaşmaq olmaz.

Məhrəmə aid olan haqq, başqasının xanımına, uşağına xəyanət etməkdir. Tövbə və istiğfar edər. Fitnə çıxmaq ehtimalı yoxsa, sahibi ilə halallaşar. Ehtimalı varsa halallaşmaq əvəzinə ona dua edər və onun üçün sədəqə verər. Dinə aid haqq, qohumuna və əmri altında olanlara din bilgisi verməyi tərk etməkdir. Bunların və bütün insanların din bilgilərini öyrənmələrinə, ibadət etmələrinə mane olmaqdır və başqasına kafir, fasıq deməkdir. Halallaşarkən günahı bildirməyib, məndəki haqlarını əfv et demək caizdir.

Kasıb olan borclunu əfv etmək çox savabdır.

Hədisi-şərifdə, **“Tövbə edən, günah işləməmiş kimi olar”** və **“Günahına peşman olmayıb, dili ilə istiğfar edən günahında davam edəndir. Rəbbi ilə lağ etməkdədir”** buyuruldu. İstiğfar etmək, **“əstağfirullah”** deməkdir. Bunun mənası, “Məni əfv et Allahım” deməkdir. Muhamməd Osman Hindi (quddisə sirruh) “Fəvaidi-Osmaniyyə” kitabında farsca deyir ki, “Şəfa üçün oxunacaq dua yazmağımı istəyirsiniz. Şəfa üçün [Tövbə edin və] istiğfar duasını çox oxuyun.” [Yəni, **Əstağfirullahəl azım əlləzi lə iləhə illə hüv əl hayyəl qayyumə və ətübü ileyh** deyin!] Ölümdən başqa bütün dərdlərə, xəstəliklərə qarşı faydalıdır. Ölüm xəstəsinin ağrılarını, sancılarını yox edər, rahat ölməsini təmin edər. Bu dua, **“Haqq Sözün Vəsiqələri”** kitabında səhifə 344-də geniş yazılmışdır. Hud surəsinin əlli ikinci ayətində məalən, **“İstiğfar oxuyun! İmdadınıza çataram”** buyuruldu. Hədisi-şərifdə **“İstiğfara davam edəni Allahu təala dərdlərdən qurtarar”** buyuruldu. Hər zaman və hər yerdə, namazlardan sonra və yatarkən mənalarını düşünərək, cox **“Əstağfirullah min külli mə kərihallah”** və ya qısaca **“Əstağfirullah”** demək lazımdır. Allahu təala şəfa, xilas və diləklərini lütf edər. Muhamməd Məsum həzrətlərinin 6-cı cild 121-ci məktubundakı hədisi-şərifdə **“Qəlbim üzərində pərdə hasil olur. Hər gün yetmiş dəfə istiğfar edirəm!”** buyuruldu. Xalid ibn Zeyd məscidinin müəzzinləri hər namazdan sonra bu duanı oxuyurdular: **“Rabbənə amənnə bi mə ənzəltə vəttəbə nərrəsulə fəktübnə maaşşahidın”**.

Hər kişi hər zaman bu bağışlanma duasını oxumalıdır: **“Allahummağfirli və li-abai və ümməhati və li-əbnai və bənati və li-ihvəti və əhavati və li-əcdadi və cəddati və li-amami və ammati və li ahvali və halati və li-zəvcəti və əbəvəyha və li-əsatizəti və lil-müminինə vəl-müminat vəl hamdü-lilləhi Rəbbil aləmin!”**. Qadın oxuyarsa, zəvcəti yerinə zəvci və əbəvəyha yerinə əbəvəyhi deməlidir.

Hədisi-şərifdə, **“Allahu təala günah işləyib sonra peşman olan qulunu, istiğfar etmədən əvvəl əfv edər”** və **“Günahınız çox olub göylərə qədər çatsa, tövbə etdikdə Allahu təala tövbənizi qəbul edər”** buyuruldu. Bu hədisi-şəriflər qul haqqı

olmayan günahlar üçündür. Hədisi-şərifdə **“Günah üç növdür: Qiyamətdə bağışlanmayan, tərk edilməyən və Allahu təala dilərsə əfv edəcəyi günah”**. Qiyamət günü şübhəsiz əfv olunmayan günah şirkdir. Şirk, burada hər cür küfr deməkdir. Tövbəsiz, yəni halallaşmadan əfv edilməyən günah qul haqqı olan günahdır və namaz borcudur. Allahu təalanın dilərsə əfv edəcəyi günah qul haqqı olmayan günahlardır.

## COX MÜHÜM İZAH

İstər kişi olsun, istər qadın hər müsəlmanın hər sözündə, hər işində Allahu təalanın əmrlərinə, yəni fərzlərə və qadağan etdiklərinə [haramlara] tabe olması lazımdır. Bir fərzin edilməsinə, bir haramdan çəkinməyə əhəmiyyət verməyənin imanı gedər, kafir [Allahın düşməni] olar. Kafir olaraq ölən şəxs qəbirdə əzab çəkər. Axirətdə Cəhənnəmə gedər. Cəhənnəmdə əbədi yanar. Əfv edilməsinə və Cəhənnəmdən çıxmasına imkan və ehtimal yoxdur. Kafir olmaq çox asandır. Hər sözdə, hər işdə kafir olmaq ehtimalı çoxdur. Küfrdən qurtulmaq da çox asandır. Küfrün səbəbi bilinməsə də, hər gün bir dəfə “Ya Rəbb! Bilərək və ya bilməyərək küfrə səbəb olan bir söz söylədim və ya bir iş etdimsə, nadim oldum, peşman oldum. Məni əfv et” deyərək tövbə etsə, Allahu təalaya yalvarsa şübhəsiz əfv olar. Cəhənnəmə getməkdən qurtular. Cəhənnəmdə sonsuz yanmamaq üçün hər gün mütləq tövbə etməlidir. Bu tövbədən daha mühüm bir vəzifə yoxdur. Təkrar bildirək ki, qul haqqı olan günahlara tövbə edərkən bu haqları ödəmək və tərk edilmiş namazlar üçün tövbə edərkən, bunları qəza etmək lazımdır. **“Səadəti-Əbədiyyə”** kitabının 276-ci səhifəsindən 287-ci səhifəsinin ortasına qədər oxuyun!

## İSLAM ƏXLAQI

### İKİNCİ HİSSƏ

İslam əxlaqı üç fəslə ayrılaraq incələnir. Lakin bu üçünü başa düşmək üçün ilk əvvəl köməkçi bilgiləri öyrənmək lazımdır. Bunun üçün yazılarımızı bir başlanğıc və üç fəsil olaraq sıralayacağıq. Biz bu kitabımızda yalnız birinci fəsli bildirəcəyik:

### MÜQƏDDİMƏ

Əxlaq bilgilərini öyrənmək istəklə olur, zorla olmaz. Hər ixtiyari iş də iki meyarı öyrənməklə görülə bilər. Öncə, o işin nə olduğunu yaxşı başa düşmək lazımdır. Sonra o işin qazandıracağı faydaları bilmək zəruridir. Bir də hər elmi asan başa düşmək üçün bəzi köməkçi bilgiləri əvvəldən öyrənmək üsul halını almışdır. Biz də əvvəlcə bu üç məqsədi üç bəhs içində açıqlayacağıq. Başlanğıcda ayrıca olaraq iki əlavə də edəcəyik.

**BİRİNCİ BƏHS:** İslam əxlaqı üç yerə bölünür:

1 – İnsan yalnız olarkən, başqasını düşünmədən işlərinin yaxşı və ya pis olduğunu bəhs edən elmə **"Elmi əxlaq"** deyilir. İnsan tək olduğu zaman da bu işləri bildiyi kimi edər. Məsələn: mülayim xasiyyətli, səxavətli, həyalı insan, tənha olarkən də başqaları yanında da həmişə belədir. **"Elmi əxlaq"** insanın bu cür heç dəyişməyən işlərini öyrədir.

2 – İkincisi, insanın ev içində ailəsinə qarşı hərəkətlərini tədqiq edər. Buna "Tədbiri mənzil" və **"Ev idarəsi ədəbi"** deyilir.

3 – Üçüncüsü, insanın cəmiyyətdəki vəzifələrini, hərəkətlərini, hər kəsə faydalı olmasını öyrədir. Buna **"Siyasəti mədinə"**, yəni **"İctimai"** və ya **"sosial"** tərbiyə deyilir.

**“Əxlaqi Nasiri”** kitabında deyilir ki, insan yaxşı, pis hər işini bir səbəblə görər. Bu səbəb ya təbiidir, yaxud bir əmrdir, qanundur. Təbii baxımdan olan işlər ağlı, düşüncəsi və təcrübələri nəticəsində etdiyi işlərdir. Belə işləri zamanla və cəmiyyətin təsiri ilə dəyişməz. İkinci səbəb olan əmr, qanun isə ya bir cəmiyyətin, bir millətin müştərək düşüncəsindən doğar, buna **“Rüsum”** və **“Adət”** deyilir. Yaxud da bir tanınmış alim, təcrübəli, nüfuz sahibi olan bir insan tərəfindən ortaya qoyulur. Peyğəmbərlər, Övliya və krallar, diktatorlar belələrindəndir. Peyğəmbərlər (aleyhimüssaləvətü vəttəslimat), Övliya və alimlər tərəfindən bildirilən Allahu təalanın əmrləri də üç yerə bölünür: Birincisi, hər kəsin ayrı-ayrı, yalnız olaraq tabe olması lazım olanlardır. Bunlara **“Əhkam”** və ya **“İbadətlər”** deyilir. İkincisi, insanlar arasında qarşılıqlı riayət edilməli olan əmrlərdir. **“Münakəhat”**, yəni evlənmə işləri və **“Muaməlat”**, yəni alqı-satqı işləri belədir. Üçüncüsü, məmləkətləri, cəmiyyətləri özündə ehtiva edən əmrlərdir. Bunlar **“Hüdud”**, yəni **“hüquqi”** və **“siyasi”** işlərdir. Bu üç elmə birlikdə **“Fiqh”** elmi deyilir. Fiqh bilgiləri və bu işləri nizamlayan əmrlər və ya onların tətbiq edilməsi, yerinə yetirilməsi, məmləkətlərə, millətlərə görə və zamanla dəyişir. Bu dəyişiklik də ancaq Allahu təalanın bildirməsi ilə olur. Allahu təalanın dinlərdə etdiyi nəshlər, dəyişdirmələr belə əmrlərdə olmuşdur. Məsələn, Adəm aleyhissəlamın zamanında insanların çoxalması lazım idi. Bunun üçün bir kişinin öz bacısı ilə evlənməsi halal idi, caiz idi. İnsanlar çoxaldığı zaman buna ehtiyac qalmadı, haram oldu.

**İKİNCİ BƏHS:** Əxlaq elminin faydalarını bildirək:

İnsan ətrafını, məsələn, yerləri, göyləri və ulduzlar dediyimiz milyonlarla səma cisimlərinin boşluqda döndüklərini, əsrlər boyu bir-birlərinə dəymədiklərini, yer üzündə hərarət, təzyiq, hava, su miqdarının, tərkibinin, hərəkətlərinin tam həyata uyğun olaraq tənzimlənmiş olduğunu, insanların, heyvanların, bitkilərin, cansız maddələrin, atomların, hüceyrələrin, qisaca institut və universitetlərdə oxunan, tətbiq edilən saysız varlıqların quruluşlarındakı və hərəkətlərindəki nizamı, düzəni, uyğunluğu görərək, bunları quran, yaradan, qüdrətli, bilgili bir sahibin olduğunu istər-

istəməz qəbul etmək, inanmaq məcburiyyətində qalır. Ağlı olan hər kəs kainatdakı və bədəndəki bu əzəməti, bu intizamı görərək dərhal Allahu təalanın varlığına inanır, **"Müsəlman"** olur. Bekə ki, 1966-cı ildə müsəlman olan İsveçrəli fəlsəfə professoru jurnalistlərin suallarına qarşılıq olaraq, "İslam kitablarını tədqiq edərək haqq yolu anladım. İslam alimlərinin böyüklüyünü qavraya bildim. İslam dini olduğu kimi izah edilsə, bütün dünyada ağlı olan hər kəs sevə-sevə müsəlman olar" demişdi.

Bir insan təbiəti və özünü tədqiq edərək dərhal müsəlman olduqdan sonra Əhli-sünnət alimlərinin (rahimə-hümullahü təala) kitablarından Muhamməd aleyhissəlamın həyatını və gözəl əxlaqını da öyrənərsə, imanı qüvvətlənər. Əxlaq bilgisi öyrənərək yaxşı və pis əxlaqı, faydalı və zərərli işləri başa düşər. Yaxşı işlər görüb, dünyada kamil, qiymətli bir insan olar. İşləri müntəzəm və asanlıqla hasil olar. Dünyada rahat, əmin-amanlıq içində yaşayar. Onu hər kəs sevər. Allahu təala ondan razı olar. Axirətdə də Allahu təalanın mərhəmətinə, mükafatlarına nail olar. Təkrar olaraq bildirək ki, səadətə qovuşmaq üçün iki şey lazımdır: Məsud və bəxtiyar bir insan bu iki şeyə qovuşan adamdır. Bu iki şeydən birincisi, doğru elm və iman sahibi olmaqdır. Bu da fənn dərslərini və Mühamməd aleyhissəlamın həyatını, əxlaqını öyrənməklə ələ keçər. İkincisi, gözəl əxlaqlı, yaxşı əməl sahibi insan olmaqdır. Bu isə fiqh və əxlaq elmlərini öyrənmək və bunlara tabe olmaqla mümkündür. Bu ikisini əldə edən insan Allahu təalanın rizasına, sevgisinə qovuşar. Çünki Allahu təala sonsuz elmi ilə hər şeyə alimdir. Mələklərə və Peyğəmbərlərə çox elm vermişdir. Onlarda heç ayıb, qüsur və çirkin bir şey yoxdur. İnsanların elmi isə çox az və imanları ya yalnış, ya pis əxlaqla pozulmuş, yaxud da pis əməllər ilə kirlənmişdir. Bunun üçün insanlar Allahu təaladan, mələklərdən və Peyğəmbərlərdən çox uzaq, onlara qovuşmaq şərəfindən çox məhrumdur. İnsan fənn bilgilərində təbiəti araşdırmaqda tənbəl və cahil qalaraq həqiqi imana, etiqada qovuşmazsa və Muhamməd aleyhissəlamı doğru tanıyaraq imanını qüvvətləndirməzsə, sonsuz fəlakətdə və sıxıntıda qalanlardan olar. Əgər həqiqi imana qovuşarsa və nəfsinə tabe olmayıb, əhkamı-islamiyyəyə, yəni Allahu təalanın əmr və qadağalarına tabe olarsa, səadətə qovuşmaqdan və Allahu təalanın

rəhmətindən, əfvindən məhrum qalmaz. Lakin etdiyi yamanlıqlar qədər əzab görər, yanar və Allahu təalanın rəhmətinə qovuşması çətin olar. İmanı olduğu üçün sonunda yenə rəhmətə qovuşar. Cəhənnəm atəşi etdiyi pisliklərin kirlərini təmizləyib, onu Cənnətə girməyə layiq təmiz şəklə salar.

Görünür ki, bütün səadətlərin, rahatlıqların başında kamil iman sahibi olmaq durur. Hər kəs qəlbini yalnış etiqadlardan, şübhəlilərdən qurtarmağa çalışmalıdır. Bir insan doğru imana qovuşar, əxlaqı gözəl və işləri saleh olarsa, yüksək ruhlara, yəni Peyğəmbərlərə, Övliyaya, mələklərə bənzəyər və onlara yaxınlaşar. Maddənin cazibə qanunu kimi onlar tərəfindən cəzb edilər. Dağ qədər böyük maqnitin və ya yüksək gərginlikli elektro-maqnitin bir iynəni çəkməsi kimi, onu yüksəkliklərə çəkərlər. Sırat körpüsünü şimşək kimi sürətlə keçər. Cənnət bağçalarında ona münasib olan, qəlbinə və ruhuna layiq olan nemətlər içində sonsuz rahat edənlərdən olar. Beyt:

**Alimü amil olanlar, çəkməz əzabı-əlim,**
**Cənnətə həm qovuşarlar, zaliqəl feyzül-azım.**

Əxlaq elmi qəlb və ruh təmizliyi barədə elm deməkdir. Tibb elminin bədən səhhəti barədə elm olmasına bənzəyir. Çünki pis əxlaq qəlbin və ruhun xəstəlikləri, zərərli işlər isə bu xəstəliklərin əlamətləri, sızmalarıdır. Əxlaq elmi çox şərəfli, çox qiymətli, ən lazımlı bir elmdir. Çünki qəlbin və ruhun pislikləri bu elm ilə təmizlənə bilər. Qəlbin və ruhun gözəl əxlaqla səhhətli və qüvvətli olması bununla nail olunar. Qüvvətli qəlblər və ruhlar da bu elmin köməyi ilə təmizlənir, gözəl əxlaqa qovuşur. Gözəl, təmiz qəlblər və ruhlar da bu elmin bərəkəti ilə təmizliyini artırır, yerləşdirir.

[Qəlb və ruh iki ayrı şeydir. Bir-birlərinə çox bənzəməkdədir. Bu kitabda ruh dedikdə, ikisi birlikdə başa düşülməlidir.]

Xasiyyət dəyişərmi? İnsanın öz xasiyyətini dəyişib, başqa xasiyyətli olması mümkündürmü? Bu məsələ üzərində müxtəlif sözlər, bir-birinə müxalif fikirlər varsa da hamısı üç mərkəzdə toplana bilər:

1 – İnsanın əxlaqı heç dəyişməz. Çünki xasiyyət insan gücünün dəyişdirə bilməyəcəyi bir varlıqdır.

2 – Xasiyyət iki cürdür. Biri, insanla birlikdə yaradılmışdır. Bu xasiyyəti dəyişdirmək mümkünsüzdür. İkincisi, sonradan meydana çıxan vərdişlərdir. Buna adət deyilir. Bu xasiyyət dəyişə bilər.

3 – Əxlaqın hamısı sonradan əldə edilir və dəyişdirilir. Xarici təsirlərlə dəyişə bilər.

İslam alimlərinin çoxu bu üçüncü fikir üzərində birləşirlər. Peyğəmbərlərin (aleyhimüssəlam) dinləri bu sözün doğruluğuna söykənir. Təsəvvüf böyüklərinin, din alimlərinin tələbəsinə tərbiyə üçün qoyduqları üsullar bu sözün işığı altında işləyir.

İnsanlar hansı xasiyyətə əlverişli olaraq dünyaya gəlirlər? Bu da içindən çıxıla bilinməyən bir sualdır. Alimlərin çoxuna görə insanlar yaxşılığa, yüksəlməyə əlverişli olaraq doğulur. Sonra nəfsin pis arzuları və gözəl əxlaqı öyrənməmək, pis yoldaşlarla oturub-durmaq pis xasiyyəti meydana gətirir. Hədisi-şərifdə "**Hər kəs müsəlmanlığa əlverişli olaraq dünyaya gəlir. Bunları sonradan valideynləri yəhudi, xristiyan və imansız edir"** buyuruldu.

**Öz əlinlə korlayırsan özünü!**
**Yoxsa Xaliq gözəl yaratmışdır səni!**

Bəzilərinə görə, insanın ruhu pis olaraq dünyaya gəldi. Ruhun özü təmiz idisə də, bədənlə qarışdıqda, bədənin ehtiyacları onu yoldan çıxartmışdır. Allahu təalanın hidayət, yaxşılıq nəsib etdiyi insanlar doğulduqları kimi pis qalmayıb, yaxşılığa çevrilirlər.

Bəziləri də ruh yaradılışda nə yaxşı, nə də pis deyildir, sonradan hər iki şəklə də dönə biləcək haldadır, dedi. Yaxşı xasiyyəti gözəl əməlləri öyrənən insan səadətə, kəmala qovuşur. Pislər arasında qalıb pis xasiyyət, çirkin əməllər öyrənən də yaman, pis olur.

Qədim Yunan həkimlərindən Calinusa görə insan ruhu üç çeşiddir: Bir qismi yaxşı, ikincisi pis yaradılmışdır. Üçüncüsü, bu ikisindən deyildir. Lakin sonradan hər ikisi ola bilər. Yaradılışı yaxşı olan insan azdır. Yaradılışda pis olub, həmişə pislik etmək istəyənlər daha çoxdur. Pislər arasında pis, yaxşılar arasında yaxşı ola bilənlərin sayı ilk iki qisim insanlar arasındadır, dedi. Buna görə, bəzi insanların xasiyyəti dəyişə bilər. Çoxunun isə dəyişə bilməz. [Yunan filosoflarının insanın qəlbindən xəbərləri olmadığından,

yalnız ruhu anlamışdırlar, əxlaq kitablarını yazan müsəlmanların bir qismi də bunlara tabe olmuşdurlar.]

Alimlərin çoxuna görə hər kəsin əxlaqı dəyişə bilər. Heç kəsin xasiyyəti yaradılışdakı kimi qalmaz. Sonradan dəyişə bilər. Əxlaq dəyişməsəydi, Peyğəmbərlərin (aleyhimüssəlam) gətirdikləri dinlər faydasız, lazımsız olardı. Alimlərin sözbirliyi ilə qoyduqları tərbiyə və cəza üsulları əbəs olardı. Bütün elm adamları övladlarına elm, ədəb vermiş və tərbiyənin fayda verdiyi hər zaman görülmüşdür. O halda əxlaqın dəyişdiyi günəş kimi meydandadır. Hətta bəzi xasiyyətlər çox yerləşmişdir və ruhun xüsusiyyəti olmuşdur. Belə xasiyyətləri dəyişdirmək, yox etmək çox çətindir. Belə əxlaq ən çox savadsız, pis insanlarda olur. Bunu dəyişdirmək üçün ağır riyazət və çox mücadilə lazımdır. Nəfsin zərərli, pis istəklərini tərk etməyə çalışmağa **"riyazət"** deyilir. Nəfsin istəmədiyi faydalı, gözəl şeyləri etməyə **"mücahədə"** deyilir. Cahillər, axmaqlar, əxlaq dəyişməz deyərək nəfs ilə mücahədə və riyazət etmirlər. Pis əxlaqını təmizləmirlər. Belə qəbul edib, hər kəs öz həvəsinə (arzusuna) buraxılarsa, qəbahətli olanlara cəza verilməzsə insanlıq yamanlığa gedər. Bunun üçün Allahu təala qullarına mərhəmət edərək, onları tərbiyə etmək, yaxşı və pis əxlaqı öyrətmək üçün Peyğəmbərlər (aleyhimüssəlam) göndərdi. Bu müəllimlərin ən yüksəyi olaraq sevgilisi olan Muhammməd aleyhissəlamı seçdi. Onun dini ilə əvvəl göndərdiyi bütün dinləri dəyişdirdi. Onun dini bütün dinlərin sonuncusu oldu. Beləcə, yaxşılıqların hamısı, tərbiyə üsullarının cümləsi Onun parlaq dinində yer aldı. Ağlı olanların, yaxşını yamandan ayıra bilənlərin, bu dindən əldə edilən əxlaq kitablarını oxuyaraq, öyrənərək və işlərini buna görə tənzimləyərək, dünyada və axirətdə rahatlığa və dincliyə, səadətə, qurtuluşa qovuşması və beləcə ailə və cəmiyyət həyatının nizamına kömək etməsi lazımdır. İnsanın birinci vəzifəsi də budur. **"İslam əxlaqı"** adlandırdığımız bu kitabı Allahu təalanın lütfü ilə buna köməkçi bilgiləri topladığı üçün hər kəsin əhəmiyyətlə oxuması, öyrənməsi lazımdır.

**Ağlı olan islamiyyətə bağlanır!**
**İslamiyyətin əsli Hədislə Qurandır!**

**ÜÇÜNCÜ BƏHS:** İslam əxlaqını üçə ayırmışdıq. Bunları yaxşı başa düşmək üçün yardımçı olan şeyləri açıqlayaq. Hər elmin, hər fənnin şöbələri vardır. Şöbələrin birləşdikləri elə nöqtələr vardır ki, bu nöqtələrdə o elmin bütün qolları tək bir meyar olur. Beləliklə, bu tək nöqtə o elmin əsasıdır. Məsələn, tibb elminin müxtəlif sahələri vardır. Lakin hər sahə insan orqanizminin xəstəlik və səhhətində birləşir. Bu da bu elmin əsası deməkdir. Bu elmi asan öyrənmək üçün əsası başa düşmək lazımdır. Əxlaq elminin əsası insanın ruhudur. Ruhu [və qəlbi] pis xasiyyətlərdən təmizləməyi və gözəl xasiyyət ilə bəzəməyi öyrədir. Bunun üçün əvvəlcə ruhu, sonra gözəl və çirkin əxlaqı öyrənmək lazımdır. Bu beyti imam Şafii söyləyib:

**Yamanlığı öyrəndim, yaman olmaq üçün deyil,**
**Yamanlığı bilməyən düşər içinə yaxşı bil!**

Qəlbi və ruhu mümkün olduğu qədər tanıya bilmək, görünən və görünməyən qüvvətlərini açıqlamaq və səadətinin, fəlakətinin nələrdə olduğunu anlatmaq üçün üç məqam yazırıq:

**Birinci məqam:** Qəlb [könül] və ruh nədir? Bu iki varlığa qədim yunan filosofları və onların ardıcılları **"Nəfsi natıqa"** və ya qısa olaraq nəfs demişdir. [Halbuki, təsəvvüf və əxlaq bilgilərinin mütəxəssisi **İmam Rabbani** (rahimə-hullahü təala) nəfsin, qəlbin və ruhun bir-birindən fərqli varlıqlar olduqlarını və **"Nəfsi-natıqa"**, nəfsin adı olduğunu bildirmişdir.] İsra surəsinin 85-ci ayətində məalən, **"Səndən ruh haqqında soruşurlar. Ruh, Rəbbimin yaratdığı varlıqlardan biridir, deyə cavab ver"** buyuruldu. Bu ayəti-kərimə ruhun nə olduğunu anlatmağı qadağan etməkdədir. Bunun üçündür ki, turukı-aliyyə məşayıhından (yüksək təriqət şeyxlərindən) və islam alimlərindən çoxu ruhun nə olduğu haqqında danışmaqdan çəkinmişdirlər. Lakin Qurani-Kərimdən başa düşülür ki, ruhun yalnız həqiqətini, nə olduğunu danışmaq qadağandır. Yoxsa xüsusiyyətlərini, özəlliyini anlatmaq qadağan deyil. Bunun üçün alimlərin çoxu tələbəyə və sual verənlərə qəlbin və ruhun cisim olmadıqlarını, bir **"Cövhəri-bəsit"** olduğunu dedilər. Ağla uyğun olan bilgiləri anlayan, hiss orqan-

larından beynə gələn duyğuları alan, bədəndəki bütün qüvvətləri, hərəkətləri idarə edən, istifadə edən həmişə bu ikisidir. Təsəvvüf böyükləri və kəlam alimləri belə demişdir. [Qəlb və ruh haqqında geniş bilgi almaq istəyənin şafii məzhəbi alimlərindən şeyx Şihabüddin Ömər Sührəvərdinin **“Avarif-ül məarif”** kitabını və İmam Rabbani Əhməd Faruqi Sərhəndinin **“Məktubat”** kitabını oxuması tövsiyə edilir. Sührəvərdi hicri qəməri 539-cu (miladi 1145) ildə doğulub, 632-ci (miladi 1234) ildə Bağdadda vəfat etmişdir. Abdülqadir Qeylanidən feyz almışdır. İmam Rabbani hicri qəməri 971-ci (miladi 1563) ildə Hindistanın Sərhənd şəhərində doğulmuş və 1034-cü (miladi 1624) ildə orada vəfat etmişdir. Abdülqadir Qeylani hicri qəməri 561-ci ildə Bağdadda vəfat etmişdir.]

Qəlbin və ruhun tərifini altı maddə içində izah edəcəyik:

1 – Əvvəlcə qəlbin və ruhun mövcud olduqlarını bildirək. Ruhun varlığı meydandadır. Bəlli olan şeyi isbat etməyə lüzum yoxdur. İnsana ən məlum olan şey öz varlığıdır. İnsan bir an belə özünü unutmur. Yuxuda ikən, sərxoş vəziyyətdə də ruh özünü unutmaz. İnsanın özünü tanıması üçün bir şey isbat etməyə ehtiyac yoxdur. Lakin ruh maddədirmi, maddə deyilmi, öz-özünə vardırmı, yoxsa başqa bir şeylə mövcuddur kimi və daha başqa xüsusiyyətlərini isbat etmək caizdir. Çoxu meydanda olsa da xatırlatmaq lazımdır. Bunun üçün aşağıdakı beş maddə zikr edilmişdir.

2 – Qəlb və ruh cövhərdir. Yəni, özləri vardır. Ruha farsca **“can”** deyilir. Heyvan öləndə canı çıxdı, deyilir. Ruhu bədənindən ayrıldı, deməkdir. Hər məxluq ya cövhərdir, yaxud arazdır. Varlıqda qala bilməsi üçün başqa bir şeyə möhtac deyilsə, öz-özünə vardırsa, buna **“Cövhər”** deyilir. Varlıqda başqa bir şeyə möhtacdırsa, **“Araz”** və ya **“Sıfat”** (xüsusiyyət) deyilir. Maddə və cisim hərəsi bir cövhərdir. Bir cismin rəngi, iyi, şəkli isə arazdır, özəllikdir. Rəng cisim ilə vardır. Cisim olmazsa, rəng olmaz. Cövhər iki cürdür: Biri **“mücərrəd”**, yəni maddi olamayan varlıqdır. Ağırlığı, şəkli, rəngi və hiss orqanlarına təsiri yoxdur. İkincisi maddədir. Mücərrəd olan cövhər hiss orqanları ilə duyulmaz, parçalanmaz. Ağıl və ruh belədir. Maddə isə hiss olunur və parçalana bilir. Cisim maddənin şəkil almış vəziyyətidir. Ruhun cövhər olduğu bir çox şəkildə isbat edilmişdir. Ən bəsit yolu budur ki, araz, yəni

xüsusiyyət bir cövhər üzərində olur. Cövhər arazı daşıyır. Hiss olunan, düşünülən hər şeyi ruh alır və daşıyır. Bunun üçün qəlb və ruh cövhərdir, araz deyildir. Araz, araz üzərində də ola bilər deyərək, məsələn, sürət hərəkətdə olur, deyərək bu isbatı qəbul etməyənlər də vardır.

3 – Qəlb və ruh bəsitdir. **"Bəsit"**, demək, parçalanmaz, ayrılmaz deməkdir. Bunun qarşılığı, birləşik, yəni **"Mürəkkəb"** olmaqdır. Kimyanın bəsit dediyi elementlər bu tərifə görə mürəkkəb sayılır. Çünki atomlara və qaz molekullarına ayrıla bilirlər. Ruhun bəsit olduğu belə başa düşülür ki, bəsit olan şeyi ruh qavrayır. Qəlb və ruh mürəkkəb olsaydı, parçalana bilsəydi bəsit olan bir şey bunda yerləşə bilməzdi. Çünki ruh parçalanarsa, bunda yerləşən bəsit şeyin də parçalanması lazım gələrdi. Bəsit olan şey isə parçalanmaz.

4 – Qəlb və ruh cisim deyil. Eni, boyu və yüksəkliyi olan cövhərə, yəni şəkil almış maddəyə **"Cisim"** deyilir. Cisimdə yerləşən şeylərə cismani deyilir. Araz, yəni özəlliklər cisimlərdə olduğu üçün cismanidirlər.

5 – Qəlb və ruh anlayan və idarə edəndir. Özlərini bilirlər. Özlərini bildiyini də bilirlər. Göz vasitəsi ilə rəngləri, qulaq ilə səsləri qavrayır. Sinirləri işə salır. Əzələləri hərəkət etdirir. Beləcə, bədənə iş gördürür. Belə işlərə **"İradi"**, yəni istəkli işlər deyilir.

6 – Ruh, hiss orqanları ilə duyula bilməz. Cisim və cismani şeylər hiss olunur. Ruh, cisim və cismani olmadığı üçün hiss oluna bilməz.

**İkinci məqam:** İnsan öldükdə ruhu necə olur? İnsan öldükdə, cəsəd cürüdükdə, qəlb və ruh yox olmaz. Ölmək bunların bədəndən ayrılması deməkdir. Bədəndən ayrıldıqda mücərrəd, yəni maddi olmayan aləmə qarışır. [Qiyamətə qədər] Yox olmaz. Din alimləri, filosoflar və mütəassıb [yobaz] olmayan fənn adamları belə demişdir. Təbiətçilərdən az bir qismi bu yekdillikdən ayrılmış, doğru yoldan azmışdır. Bunlar insanı çöldəki otlara bənzətdilər. İnsan ot kimi bitər, böyüyər, yox olar. Ruhu qalmaz, dedilər. Belə dedikləri üçün **"Xaşxaşı"**lar, yəni **"Otçular"** adı ilə anıldılar. Din alimləri və filosoflar bu otçuların düşüncələrini müxtəlif dəlillərlə rədd etdi.

[Allahu təala bu gün məlum olan 105 elementi yaratmış, bunlardan hər birinə başqa-başqa xassələr vermişdir. Hər element

atomlardan əmələ gəlmişdir. Hər atomu bir mikro-dinamo kimi, böyük bir enerji deposu (mənbəyi) etmişdir. Atomların bir-birləri ilə birləşməsindən molekulları və ya ion şəbəkələrini, beləcə üzvi və qeyri-üzvi mürəkkəb cisimləri və hüceyrələri, müxtəlif toxumaları və sistemləri yaratmışdır. Bunların hər birində ağılları heyrətə gətirən incəliklər, qaydalar və qanunauyğunluqlar vardır. Məsələn, ancaq mikroskopla görünə bilən bir hüceyrə müxtəlif şöbələri olan möhtəşəm bir fabrik kimidir. İnsan ağlı bu günə qədər bu fabrikin ancaq bir neçə cihazını görə bilmişdir. İnsandakı milyonlarla hüceyrənin işləyə bilməsi, istər insanda, istər xarici aləmdə minlərlə uyğun şərtlərin olmasına bağlıdır. Bu minlərlə şərt və nizamdan biri pozularsa, insanın bədəni işləməz, dayanar. O böyük qadir, alim olan **Allahu təala** bu nəhayətsiz nizamı yaradaraq vücud maşınını avtomatik olaraq çalışdırır. Qəlb və ruh bu maşının elektrik qüvvəti kimidir. Bir motorda kiçik nasazlıq olarsa, cərəyan kəsildiyi kimi, insan bədəninin daxili və xarici quruluş və nizamında hasil olan bir nasazlıq da qəlbin və ruhun bədəndən ayrılmasına səbəb olar və insan ölər. Dünyada heç bir motor əbədi işləyə bilməz. Aşınaraq, işləyərək çürüyüb gedər. Bu bir ümumi qanundur. Vücud maşını da köhnəlir, çürüyür. İnsan qəbirdə çürüdüyü zaman heç bir zərrəsi, heç bir elementi yox olmur. Çürümək bədəni meydana gətirən üzvi molekulların anaerobik mikroblar və torpağın təsiri ilə parçalanaraq karbon dioksid, ammonyak, su kimi kiçik molekullara və sərbəst azota qədər ayrılması deməkdir. Bu parçalanma fiziki və kimyəvi hadisələrdir. Fiziki və kimyəvi reaksiyalarda maddənin yox olmadığı bu gün dəqiq olaraq bilinir. Lavoisier adındakı Fransız kimyagəri, **"Kimyəvi reaksiyalarda maddə yox olmaz və yoxdan meydana gəlməz"** həqiqətini təcrübə ilə sübut etmişdisə də, hər şeyin kimyəvi reaksiya, kimya qanunları ilə əmələ gəldiyini zənn edərək, "təbiətdə heç bir şey yaradılmaz və heç bir şey yox olmaz" demişdir. Bu gün yeni kəşf edilən nüvə hadisələri, nüvə reaksiyaları maddənin enerjiyə döndüyünü, yox olduğunu, Lavoisiernin aldanmış olduğunu göstərir. Bu gün elm adamları açıq olaraq görür ki, fənnin inkişaf etməsi, fənn bilgisindəki irəli atılan hər bir addım islam dinini qüvvətləndirir, islam düşmənlərinin iftiralarını rədd edir, maddəyə sitayiş edən ateistləri rəzil edir, yerlə süründürür. Lakin

çox təəssüf ki fənn adamı şəklinə girən, universitetdə oxumuş bəzi din cahilləri fəndə geri qalmağı bəhanə edərək islam düşmənliyi edirlər. Bu diplomlu kafirlər təmiz gəncləri aldatmaq üçün "İslamiyyət geri qalmaqdır, tərəqqiyə mane olmaqdır. Xristianlar inkişaf edir. Hər növ fənn alətləri düzəldirlər. Təbabətdə, hərblərdə, xəbərləşmələrdə istifadə etdikləri fənn alətləri gözlərimizi qamaşdırır. Fəndəki təkamüldən müsəlmanların xəbərləri belə yoxdur. Biz xristianlara tabe olmalıyıq" kimi yalanlar söyləyərək islamiyyətdəki gözəl əxlaqı, qardaşlığı tərk etməyə və Avropalılara, Amerikalılara bənzəməyə inkişaf deyirlər. Gəncləri özləri kimi islam düşməni edərək fəlakətə sürükləməyə çalışırlar. Halbuki, islamiyyət elmdə, sənətdə inkişafı əmr edir. Xristianlar və bütün kafirlər atalarından, ustalarından öyrəndiklərini edirlər. Əvvəlki nəslin etdiklərini kiçik əlavələr ilə təkrar edirlər. Əvvəlkilər etməsəydi bunlar heç birini edə bilməzdi. **"Təkmili-sinaat təlahuki əfkar ilədir"** sözü əsrlərlə əvvəl söylənmişdir. Tarix göstərir ki, fəndəki yenilikləri həmişə müsəlman etdi. Fənn bilgilərini, fənn alətlərini yüz il əvvəlki hala qədər yüksəltdilər. Bu tərəqqilərə həmişə islam dini və bu dini tətbiq edən islam dövlətləri səbəb oldu. Xristianlar xaç yürüşləri ilə islam dövlətlərini yıxa bilmədikləri üçün, siyasi oyunlarla, yalanlarla, hiylələrlə daxildən yıxdılar. Onların torpaqlarında müxtəlif, ilmani [layiq], mason [dinsiz] insanlarla hökumətlər qurdular. Lakin islamiyyəti yox edə bilməzlər. Müsəlmanlardan qalan fəndəki kəşflərə əlavələr edərək bu günkü tərəqqini özlərinə mal edirlər. Yalnız öz keflərini, zövqlərini, mənfəətlərini düşünənlər yamanlıqlarını ortaya qoyduğu üçün fənn və sənəti əmr edən islamiyyətə geri qalmış deyirlər. Bütün yəhudilər, xristianlar, hətta bütpərəstlər, bütün dünya Cənnətə, Cəhənnəmə inanır, kilsələr, havralar dolub daşır. Bu inananlara geridə qalmış demədiklərinə görə, fənnə, sənətə deyil, zövq və səfaya, əxlaqsızlıqlara irəlicilik dedikləri anlaşılır. Belə əslsiz və haqsız yalanlarla islamiyyətə həyasızca ilk hücum edən ingilislərdir. **"İngilis casusunun etirafları"** kitabını oxuyun! İndi müsəlmanların birləşərək babaları kimi islamiyyətin əmr etdiyi din və fənn bilgilərinə sarılmaları, yenə böyük sənaye quraraq yeni alətlər düzəltmələri, xristianlardan üstün olaraq bütün bəşəriyyəti səadətə qovuşdurmaları lazımdır.

İnsan bədənində olan maddələr torpaqdan, sudan və havadan meydana gəlmişdir. Canlıların ehtiyac maddələri bu üç qaynaqdan hasil olmuşdur. İnsan çürüdüyü zaman hasil olan maddələr yenə bu üç yerə dağılır. Qiyamətdə təkrar dirilmək bu maddələrin və ya bənzərlərinin təkrar bir yerə gəlmələri ilə olacaq.

Qəlb, ruh və mələklər də yalnız olduqları zaman tərəqqi etməz, yüksəlməzlər. Yaradıldığı dərəcədə qalar. Qəlb və ruh bu bədən ilə birləşdikdə tərəqqi etmək, yüksələ bilmək xassəsini qazanır. Yaxud, kafir olmaq, günah işləmək səbəbləri ilə alçalır, zay olur.

Bu dünyada hər cisim özünə məxsus xüsusiyyətləri ilə tanınır. Hər cisim elementlərin və birləşmələrin bir yığınıdır. Elementlər məhluldan məhlula keçərək yer dəyişdirir, hər cismin tərkibi pozularaq xüsusiyyətləri yox olur, başqa xüsusiyyətli, başqa cisim halına dönür. Bu davamlı dəyişmələrdə maddə yox olmursa da, cisimlər zamanla dəyişir, yox olub başqa cisim hasil olur. Əvvəllər maddəyə **“Heyula”** deyilirdi. Cismə, yəni maddənin şəkil almasına **“Surət”** deyilirdi.

Qəlb və ruh parçalanmadığı və parçalardan meydana gəlmədiyi, yəni mücərrəd olduğu üçün heç dəyişməz, pozulmaz, yox olmaz. Fiziki hadisələrdə cisimlərin şəkli və halı dəyişir. Məsələn, su istilik aldığı zaman buxar olur. Maye olduğu halda qaz halına dönür. Su cismi yox olub buxar olur. Kimyəvi reaksiyalarda cismin quruluşu pozulur. O cismin maddəsi yox olub başqa maddə əmələ gəlir. Fiziki hadisələrdə cisim dəyişir. Maddə dəyişmir. Kimyəvi dəyişiklikdə cisim yox olmur, maddə dəyişir. Heç birində maddə yox olmur. Nüvə dəyişmələrində isə maddə də yox olub enerji halına dönür.

**Üçüncü məqam:** Qəlb və ruhun qüvvətləri vardır. Bu qüvvətlər bitki və heyvanların qüvvətləri kimi deyil. Nəbatatın və heyvanların da özlərinə görə ruhları vardır. Qəlb yalnız insanda vardır. Hər canlıda **“Nəbatı ruh”** vardır. Doğulma, böyümə, bəslənmə, zərərli maddələri xaricə atma, törəmə və ölmə kimi canlılıq işlərini **“Nəbatı ruh”** yerinə yetirər. Bu işlər insanlarda, heyvanlarda və nəbatatlarda da olur. Necə olması təbiət bilgisi dərslərində öyrənilir. Bunlarda böyümə bütün həyatları boyunca olmaz. Müəyyən bir miqdara çatdıqdan sonra bu iş dayanır. Bu miqdar insanlarda ortala-

ma 24 yaşına gəldiyi zamandakı miqdardır. Piylənmək, kökəlmək, böyümək deyildir. Bəslənmə ölənə qədər davam edir. Çünki qida almadan yaşana bilməz.

Heyvanlarda və insanlarda **"Heyvani ruh"** da vardır. Bunun yeri sinədir. İxtiyari hərəkətləri etdirən bu ruhdur. İnsanlar da qəlbin əmri ilə edər.

İnsanlarda ayrıca bir ruh daha vardır ki, Ruh dedikdə qəlb ilə bərabər bu ruh başa düşülür. Ağıldan istifadə etmək, düşünmək və gülmək kimi şeyləri edən bu ruhdur. Heyvani ruhda iki qüvvət vardır. Birincisi, Müdrikə qüvvəti, ikincisi hərəkət qüvvətidir. Müdrikə qüvvəti idrak edən, anlayan qüvvətdir. Bu anlamaq da iki yol ilə olur. Zahiri, görünən hiss orqanları ilə olan anlama. Batini, yəni görünməyən, daxili orqanlarla olan anlama. Görünən hiss orqanları beşdir. Birinci hiss orqanı dəridir. Dəri ilə hərarət, soyuqluq, nəmlik, quruluq, yumşaqlıq, sərtlik kimi şeylər başa düşülür. Bir cisim dəriyə dəyəndə, heyvani ruh bu şeyin isti olub olmadığını anlayır. Bu hissiyyat ovuc içində daha çoxdur. İkincisi, qoxu alma hissiyyatıdır. Burun ilə olur. Üçüncüsü, dad alma hissiyyatıdır. Dildəki sinirlərlə duyulur. Dördüncüsü, eşitməkdir, qulaqdakı sinirlərlə duyulur. Beşincisi, görməkdir, gözdəki sinirlərlə görülür.

Görünməyən hiss orqanları da beş ədəddir: Birincisi, **"Hissi-müştərək"**dir. Bu duyğunun yeri beynin önündədir. Hiss orqanlarından beyindəki duyğu mərkəzlərinə gələn xarici təsirlərin hamısı burada toplanır. İkincisi **"Xəyal"**dır. Bunun yeri beynin birinci boşluğunun önündədir. Hissi-müştərəkdə toplanıb anlaşılan, hiss edilənlər burada saxlanılır. Bir cismə baxdıqda bu cisim hissi-müştərəkdə duyulur. Bir cisim göz önündən çəkildikdə hissi-müştərəkdə hiss edilməsi qalmaz. Lakin xəyala gələn təsiri uzun zaman qalır. Xəyal olmasaydı hər kəs bir-birini unudar, heç kəs heç kəsi tanımazdı. Üçüncüsü **"Vahimə"**dir. Hiss orqanları ilə duyulmayan, lakin duyulanlardan çıxarıla bilən mənaları anlayar. Məsələn, düşmənlik, doğruluq bir orqanla hiss edilməz. Lakin dost, düşmən olan bir şəxs görünür, hiss edilir. Bu şəxslərdəki dostluğu, düşmənliyi anlayan daxili qüvvətə Vahimə deyilir. Vahimə qüvvəti olmasaydı, qoyun qurdun düşmən olduğunu anlamaz, ondan qaçmazdı. Balasını da qorumazdı. Dördüncü qüvvət **"Hafizə"**dir.

Vahimənin anladığı mənaları saxlayar. Beşinci qüvvətə **"Mütasarrıfa"** deyilir. Anlaşılan duyğuları və mənaları qarşılaşdırıb yeni mənalar əldə edər. Məsələn, zümrüddən bir dağ düşünür. Şairlərdə bu qüvvət çoxdur.

Heyvan ruhunun ikinci qüvvəti olan hərəkət qüvvəti də iki cürdür: Birincisi **"Şəhəvi"** qüvvətdir. İnsanlar və heyvanlar şəhvət (ehtiras) qüvvətləri ilə özlərinə dadlı gələn və möhtac olduqları şeyləri istəyərlər. Bunlara **"Bəhimi"** [yəni heyvani] qüvvət də deyilir. İkincisi **"Qəzəbi"** qüvvətdir. Bu qüvvət ilə özlərinə çirkin, zərərli olan şeyləri dəf edirlər, qovurlar. Bunlara **"Canavar"** qüvvətlər də deyilir.

Hərəkət qüvvətləri müdrikə qüvvətlərinə möhtacdır. Çünki öncə duyğu orqanları ilə yaxşı və ya pis olduğu məlum olmalıdır ki, istənilsin və ya rədd edilsin. Bütün bu duyğu orqanlarının və hərəkətlərin hamısı sinirlərlə yerinə yetirilir. İnsan qəlbi və ruhu yalnız insanlarda olur. Bu ruhun da iki qüvvəti vardır. İnsan bu iki qüvvət ilə heyvanlardan ayrılır. Bu iki qüvvətdən birincisi, idrak edici olan **"Qüvvəyi-alimə"** və **"Müdrikə"** deyilən bilici qüvvətdir. İkincisi, **"Qüvvəyi-amilə"**, edici qüvvətdir. Bilici qüvvətə **"Nitq"** və **"Ağıl"** deyilir. Bu qüvvət iki yerə bölünür: Biri **"Hikməti nəzəri"** olub, **"Təcrübi"** elmləri, yəni fənn bilgilərini əldə etməyə yarayan qüvvətdir. İkincisi **"Hikməti-əməli"** olub, **"Əxlaq"** elmləri ilə alim olan qüvvətdir. Təcrübi, yəni fənn bilgilərini əldə edən qüvvət, maddənin həqiqətini anlamağı təmin edir. Əxlaq bilgilərini əldə edən qüvvət, gözəl əxlaqları və yararlı işləri pis əxlaqdan və çirkin işlərdən ayırır.

Ruhun edici qüvvəti faydalı, uğurlu işlərin edilməsini təmin edər. Bilici qüvvətlər ilə əldə edilən bilgilərə görə iş görər. Heyvan ruhundakı hərəkət qüvvətləri, vahimə qüvvətlərinin yaxşı gördüklərini cəzb edər. Çirkin bildiklərini dəf edər. İnsan ruhunun edici qüvvəti ağla söykənir. Bir işdə yaxşılıq, fayda olduğunu **"Ağıl"** ilə anlarsa, onu edər. Sonu nöqsan, zərər olacağını anlarsa, o işi etməz və ya dəf edər. Bunları və heyvani ruhun ehtirası və qəzəbi qüvvətlərini qəlb vasitəsilə idarə edər.

Çox insan vardır ki, çox işlərini nəfsin və ya heyvani ruhun qüvvətlərinə tabe olaraq edər. Yəni, vəhm və xəyalı ilə edərlər.

İmam Muhamməd Qəzali və təsəvvüf böyüklərindən bir qismi buyurdu ki, “Ruhun bu qüvvətləri mələklərdir. Allahu təala lütf və mərhəmət edərək mələkləri ruhun əmrinə vermişdir. Kiçik qiyamət qopana qədər, yəni ruh bədəndən ayrılana qədər ruhun əmrində qalarlar. Hədisi-şəriflərdə də buna işarətlər var. Bəzi şəxslərdə gözlənilmədən, təcrübəli insanları heyrətə gətirən hünərlərin meydana gəlməsi də bunu göstərir”. İnsanın kəmala gəlməsi ruhun iki qüvvəti ilə olur.

**İZAH:** Muhamməd Məsum həzrətləri **“Məktubat”**ın ikinci cild, 80-cı məktubunda buyurur ki, “Bəlaları, sıxıntıları dəf etmək üçün **“İstiğfar”** oxumaq çox faydalıdır və təcrübə edilmişdir. Bunu hədisi-şəriflər də bildirmişdir. Bu kasıb, hər fərz namazından sonra üç dəfə istiğfar duası, yəni, **“Əstağfirullahəl azım əlləzi lə iləhə illə hüv əlhayyəl qayyümə və ətübü ileyh”** oxuyuram. Sonra, 67 dəfə yalnız **“Əstağfirullah”** oxuyuram.

**Minlərlə top və tüfəng edə bilməz əsla,**
**Göz yaşının səhər vaxtı etdiyini.**
**Düşmən qaçıran süngüləri çox dəfə,**
**Toz kimi edər bir möminin duası.**

## MÜQƏDDİMƏNİN BİRİNCİ ƏLAVƏSİ

Bu əlavədə insanın məxluqlar içində ən üstün və ən şərəfli olduğu bildiriləcəkdir.

Bütün cisimlər maddə olması baxımından bir-birlərindən fərqsizdir. Hamısının ağırlığı və həcmi vardır. İnsan və heyvan da bu baxımdan cansızlarla bərabərdir. Lakin cisimlər özünə məxsus xassələri ilə bir-birindən ayrılır.

[Hər cisim **“Atom”**dan meydana gəlmişdir. Bir toz milyonlarla atom yuvasıdır. Az və müəyyən miqdarda atom bir-biri ilə birləşdikdə bir **“Molekul”** meydana gəlir. Cisimlər əsas 2 hissəyə ayrılır: Saf və qarışıq cisimlər. Müəyyən xüsusiyyətlərə malik olan cismə **“Saf cisim”** deyilir. Məsələn, mis elektrik teli və yağış suyu safdır. Çünki, dünyanın hər yerində hər zaman eyni xüsusiyyətləri

daşıyırlar. Qaynama, ərimə istilik dərəcələri məlumdur və heç dəyişməzlər. Müəyyən xüsusiyyətləri olmayan cisimlərə **“Qarışıq”** cisimlər deyilir. Su, taxta, benzin, dəniz suyu kimi. Çünki bunlar müxtəlif xüsusiyyətlərdə olurlar. Müəyyən bir qaynama, ərimə istilik dərəcələri yoxdur. İnək südü başqadır. Qoyun südü başqadır. Qara dənizin suyu az duzludur. Ağ dənizin suyu çox duzludur.

Saf cisimlər də iki qisimdir. Başqa-başqa xüsusiyyətli parçalara ayrıla bilməzsə **“Bəsit cisim”** və ya **“Element”** deyilir. Qızıl, kükürd, yod və oksigen qazı bir elementdir. Bu gün yüz beş element tanıyırıq. Başqa-başqa xüsusiyyət daşıyan parçalara ayrıla bilən saf cisimlərə **“Mürəkkəb”** və ya **“Birləşik cisim”** deyilir. Məsələn, şəkər, yağış suyu, spirt mürəkkəb cisimdir. Çünki şəkər atəşə qoyulsa karbon, su və başqa parçalara ayrılar. Su isə elektrik enerjisinin köməyi ilə oksigen və hidrogen deyilən iki müxtəlif qaza ayrılar. Bu gün milyonlarla mürəkkəb cisim tanıyırıq. Mürəkkəb cisim iki və ya daha çox elementin atomlarının bir-biri ilə birləşməsindən hasil olur.

Eyni bir cisim qatı, maye və qaz halında ola bilər. Məsələn, su buz halında ikən qatıdır, su halında ikən mayedir. Buxar halında ikən qazdır. Qaz hava kimi uçan deməkdir. Müəyyən bir həcmi və şəkli yoxdur.

Bəsit cisim, yəni element üç yerə ayrılır:

1 – Həqiqi mədən. Buna metal da deyilir.

2 – Mədən olmayanlar. Bunlara qeyri-metal da deyilir.

3 – Yarı mədənlərdir.

Həqiqi mədənlər 78 ədəddir. 77 ədədi normal şərtlərdə qatıdır. Yalnız civə mayedir. 357,3 dərəcədə qaynayır. -39,4 dərəcədə donur. Qatı mədənləri çəkiclə döydükdə lövhə kimi olur. Dağılıb toz olmaz. Metal atomu başqa atomla birləşdiyi zaman müsbət [+] elektrik daşıyır. Mənfi elektrik daşıya bilməz. O halda iki metal bir-biri ilə birləşə bilməz. Çünki müsbət elektrik yüklü iki atom bir-birini çəkə bilməz, itələyər.

Qeyri-metallar on yeddi ədəddir. Biri maye, beşi qatı, on biri qaz halındadır. Qatı olanlar həvəngdəstədə döyüldükdə toz olar. Lövhə halına gəlməz. Saf odun kömürü qeyri-metaldır. Buna kim-

ya dilində karbon deyilir. Qeyri-metal atomları mürəkkəb hala keçincə həm müsbət, həm də mənfi ola bilər. O halda bir neçə qeyri-metal atomu bir-biri ilə birləşərək bir molekul meydana gətirirlər.

Mürəkkəb cisimlər iki yerə ayrılır. İçində Karbon və Hidrogen atomu birlikdə olan mürəkkəblərə **"Orqanik"** və ya **"Üzvü"** cisim deyilir. Bunlar yana bilir və canlılarda hasil olurlar. Hal-hazırda fabriklərdə də bəzilərinin sintezləri edilməkdədir. Yağ, şəkər, aseton, kinə orqanik cisimdir. Birləşməsində həm Karbon, həm də Hidrogen atomu birlikdə olmayan cisimlərə **"Anorqanik"** və ya **"Qeyri üzvi"** cisimlər deyilir. Bunlar yer qabığında və ərimiş olaraq dənizlərdə olur. Yemək duzu, su, əhəng daşı, zəy, qum bunlardandır.

Bütün bu cansız cisimlər uyğun bir şəkildə birləşərək və qarışaraq canlı məxluqların təməl daşı olan **"Hüceyrə"** meydana gəlir. Hüceyrə canlıdır. Bitki hüceyrəsi, heyvan hüceyrəsinə bənzəməz. İnsan hüceyrəsi, heyvan hüceyrəsinə bənzəyir. Hüceyrələr bir-biri ilə qarışaraq **"Nəsc"** və ya toxuma meydana gəlir. Müxtəlif cinsdən nəsclər qarışdıqda üzvlər **"orqanlar"** olur. Orqanların bir yerə gəlməsindən **"Cihaz"**lar, yəni **"sistemlər"** olur. Hüceyrə, nəsc, orqan və sistem yığımı da bir bitki **"nəbat"** və ya **"heyvan"** və ya **"insan"** meydana gətirir.]

Bütün varlıqlar, cansızlar, bitkilər və heyvanat olmaqla üç cinsə ayrılır. Heyvan cinsinin ən qiymətlisi, ən şərəflisi insan növüdür. Hər cinsin növləri arasında üstünlük sırası vardır. Yəni, bir növ başqa növdən daha üstündür. Bir cinsin ən üstün növü, daha üstün olan cinsin ən aşağı növünə yaxın özəlliklər göstərir. Hətta bir çox xüsusiyyətləri müştərək olur. Məsələn, mərcan cansızlardan daşa bənzəyir. Lakin canlılar kimi törəyir, böyüyür. Xurma ağacı və ağcaqanad tutan ot, heyvan kimi hiss və hərəkət etməkdədir. Xurma ağaclarından bir qismi erkək, bir qismi dişidir. Erkək ağac dişi tərəfinə əyilməkdədir. Erkək ağacdan bir maddə dişiyə gəlməsə, dişidə meyvə hasil olmaz. Hərçənd ki, bütün bitkilərdə bu iki orqan vardır və fekondasion [döllənmə] olur. Lakin xurma ağacında heyvanlar kimi görünür. Hətta xurma ağacının başında ağ bir şey vardır. Heyvanların ürəyi kimi iş görür. Bu şey yaralanarsa və ya suda qalarsa ağac quruyar. Hədisi-şərifdə, **"Bibiniz olan xurma ağacına**

**hörmət göstərin! Çünki ilk xurma ağacı Adəm aleyhissəlamın palçığının artıqlarından yaradıldı”** buyuruldu. Bəlkə, bu ağacın bitkilərin ən üstünü olduğuna işarə buyurulmuş ola bilər.

Heyvan cinsinin ən aşağı növü dəniz süngərləridir. Rəngi ağdır. Dənizlərdə yaşayarlar. İradəli, istəkli hərəkətləri vardır. Sularda yaşayan minlərlə ibtidai heyvan vardır. Hər növdən daha yetkin, daha üstün başqa bir növ yaradılmışdır. Tabiiyyə kitablarında üstünlük sıraları bildirilmişdir. Hər sinifdə başqa-başqa bəslənmə və müdafiə üzvləri vardır. Kimisinə ox, kimisinə diş, kimisinə pəncə, kimisinə buynuz, kimisinə qanad, kimisinə sürət, tülkü kimi olanlara da hiylə verilmişdir. Hər sinfin şəxsinin və növünün qorunması təmin edilmişdir. Yaşamaları üçün insan ağlını çaşdıran şeylər ilham olunmuşdur. Bal arısı mühəndis kimi altı künclü pətək düzəldər. Silindir etsəydi aralarında boşluq qalardı. Altı bucaqlı prizmalar arasında yer ziyan olmur. Dördbucaqlı olsaydı, həcmləri daha az olardı. Bunu insanlar oxumaqla, öyrənməklə anlayar. Öyrənməyən anlaya bilməz. Arıya bunu bildirən kimdir? Allahu təala **“ilham”** etmişdir. İlhama indi **“daxili motiv”** deyilir.

Heyvanların dərəcə-dərəcə üstünləri düşünülsə, ən üstünləri, insana ən yaxın olanları at, meymun, fil və quşlardan tuti, yəni tutuquşudur. Meymun və filin zəkası çox insandan aşağı deyildir. Darvin adındakı bir doktor heyvanların üstünlük sırasını yazmış, ən üstünü meymun olduğunu bildirmişdir. Bunu oxuyan islam düşmənləri, özlərinə qabaqcıl deyən, küt beyin bir neçə fənn fırıldağı Darvinin heyvanların bir-birinə döndüyünü, yüksələ-yüksələ sonunda insan olduğunu, yazdığını deyirlər. Bunu irəli sürərək Adəm aleyhissəlamın torpaqdan yaradıldığını inkar edir və müsəlman uşaqları aldadırlar. Halbuki, Darvin öz kitabında heyvanların bir-birinə döndüyünü demir. “Yaradılışlarında bir təkamül, bir üstünlük sırası vardır” deyir. Aşağı dərəcədəkilərin üstündəkilərə qida, yem olduqlarını yazır. Bu halı islam alimləri daha əvvəl görmüşlər, anlamışlar və yazıb bildirmişlərdir. Belə ki, Darvin 1224-cü [miladi 1809] ildə təvəllüd, 1299-cu [miladi 1882] ildə vəfat etdi. Heyvanların üstünlük sırasını və ən üstünlərini yuxarıda yazdığımız şəkildə bildirən Əli ibn Əmirullah (rahimə-hullahü təala) bundan çox əvvəl, yəni 916-cı ildə təvəllüd və 979-cu [m. 1570] ildə vəfat

etmişdir. Darvinin bu yazılarını islam kitablarından aldığı aydın görünür.

Heyvanların üstündə insan növünün ən aşağısı gəlir. Çöllərdə, meşələrdə, qütblərdə yaşayanlar belədir. İnsanların ən üstünü orta iqlimlərdə, yəni 23 dərəcə ilə 66 dərəcə ərz dairələri arasında, şəhərlərdə yaşayanlardır.

Yaradılış baxımından olan bu üstünlük fərqlərindən başqa insanlar arasında çalışaraq maddədə və əxlaqda yüksəlmək fərqləri də vardır. Bəzi insanlar zəkaları ilə çalışaraq bir çox alət düzəltmiş, bəziləri isə bununla birlikdə ağıl elmlərində, fəndə, texnikada inkişaf etmişdir. Ən üstünlərinə gəlincə, bunlar texnikada, elmdə, fəndə yüksəlməklə birlikdə, əxlaqda da irəliləmiş, vilayət və Allahu təalaya yaxınlıq deyilən insanlığın ən yüksək dərəcəsinə çatmışdırlar. Bunlar aşağılarındakı insanları irşad edərək yüksəldirlər. Bunların ən yüksəyi Peyğəmbərlərdir (aleyhimüssalavatü vəttəslimat). Bunlar Cəbrayıl aleyhissəlam deyilən bir mələk ilə Allahu təaladan əmr və xəbər almaqla şərəflənmişdirlər. Bu mələyin gətirdiyi əmr və xəbərlərə **“Vəhy”** deyilir. Peyğəmbərlər (aleyhimüssalavatü vəttəslimat) özlərinə gələn Vəhyləri insanlara bildirmiş, insanlara yüksəlmə yolunu göstərmişlər. Peyğəmbərlərin göstərdiyi bu yüksəlmə və irəliləmə yoluna **“Din”** deyilir. İnsanların yüksələrək çatdıqları dərəcələr mələklərin dərəcəsindən daha yuxarıdır. Peyğəmbərlik məqamı da dörd dərəcədir. Birincisi **Nəbilər**, ikincisi **Rəsullar**, üçüncüsü **Ülül-azm Peyğəmbərlərdir**. **Adəm, Nuh, İbrahim, Musa, İsa** və **Muhamməd** (aleyhimüssəlam) bu dərəcədədirlər. Dördüncü dərəcə hatəmül-ənbiya, yəni son olaraq gəlmək dərəcəsidir. Bu ən yüksək dərəcə Muhamməd aleyhissəlama məxsusdur. **“Sən olmasaydın, sən olmasaydın heç bir şeyi yaratmazdım!”** iltifatı ilə insanların mələklərdən daha üstün olduğuna vəsiqə olmuşdur.

İnsanların dərəcələri bütün məxluqların tam ortasındadır. İslamiyyətə tabe olanlar yüksəlirlər, mələklərdən üstün olurlar. Nəfslərinə və pis yoldaşlarına aldanaraq islamiyyətdən uzaqlaşanlar alçalırlar. Çünki ruhun mücərrəd olduğunu, bədənin isə, özəllikləri bir-birinə bənzəməyən maddələrin yığını olduğunu bildirmişdik. İnsan ruhu tərəfindən mələklərə, bədənin quruluşu ba-

xımından heyvanlara bənzəməkdədir. Ruh tərəfini qüvvətləndirən şəxs mələklərdən də üstün olar. Çünki bədən insanı mələklikdən uzaqlaşdırmaqda, heyvanlara yaxınlaşdırmaqda ikən, o, alçalmağa etiraz etmiş və yüksəlmişdir. Mələkdə heyvanlaşdırıcı bir bədən yoxdur. Yaxşılıqları mələklik ilə birlikdə yaradılmışdır.

Bir kimsə bədəni ilə nəfsi qüvvətləndirərsə heyvanlardan aşağı olar. Allahu təala Araf surəsinin 178-ci ayətində və Furkan surəsinin 44-cü ayətində **"Hətta onlar heyvanlardan daha aşağıdırlar"** buyuraraq belə kimsələrin pisliklərini bildirməkdədir. Çünki heyvanda ağıl yoxdur. Mələklərə bənzəyən ruhları da yoxdur. Şəhvətlərinə tabe olmaları günah olmaz. İnsanlara ağıl işığı verilmiş olduğundan, nəfslərinə tabe olmaları, doğru yoldan azmaları çox çirkin olar.

**Qarışıqdır Adəm oğlu,**
**mələkliklə heyvanlıqdan.**

**Kim ki, mələyinə uydu,**
**üstün oldu həm də ondan.**

**Kim ki, olar heyvan əxlaqlı,**
**pis olar hər məxluqdan!**

Heyvanların yaşaya bilmələri üçün onlara lazım olan tənəffüs edəcək hava, yemək, içmək, geyim, sığınacaq, yoldaş olacaq şeylərin hamısı hazır olaraq yaradılmışdır.

[Bunlar arasında yaşamaları üçün ən çox lazım olanı havadır. Havasızlığa bir neçə dəqiqədən çox dözə bilməzlər. Dərhal ölərlər. Hava, axtarmaqla, tapmaqla, zəhmət çəkməklə ələ keçəcək bir şey olsaydı, bunu axtaracaq qədər zaman belə yaşaya bilməzdilər. Bu qədər təcili lazım olan bu çox önəmli maddəni Allahu təala hər yerdə tapılacaq və məxluqlarının ciyərlərinə qədər öz-özünə asanlıqla girəcək şəkildə yaratmışdır. Yaşaya bilmək üçün su bu qədər təcili lazım deyil. İnsan və heyvanlar suyu axtarıb tapacaq qədər yaşaya bilərlər. Bunun üçün suyu tapmaq lazımdır. Heyvanlarda ağıl olmadığı və bir-birlərinə köməkçi olmadıqları

üçün yeməklərini və geyimlərini hazırlaya bilməzlər. Bunun üçün yeməklərini bişirmələri, hazırlamaları lazım deyil. Ot, leş yeyirlər. Tük, yun ilə isinirlər. Qorunma alətləri özlərində yaradılmışdır. Bir-birlərinə möhtac deyildirlər.

İnsanlar isə bütün bunları hazırlamağa, düşünməyə məcburdur. Əkib biçmədikcə, çörək bişirmədikcə doya bilməzlər. İplik, toxuma, və tikiş tikmədikcə geyinə bilməzlər. Qorunmaları üçün də ağıllarını, zəkalarını işlətmələri, fənn bilgilərini öyrənmələri, sənaye qurmaları lazımdır. Hər heyvanda olan bir növ üstünlük insanda toplanmışdır. İnsan onda yaradılan bu üstünlükləri meydana çıxarması üçün ağlını işlətməli, fikrini yormalı, çalışmalıdır. Səadət və fəlakət qapılarının açarı insanın əlinə verilmişdir. Yüksəlməsi və alçalması qüvvətini sərf etməsinə və çalışmasına həvalə edilmişdir. Ağlını, fikrini işlədərək səadət yolunu görüb, bu yolla getməyə çalışarsa, içində yaradılmış olan yüksəkliklər, dəyərlər əlinə keçər. Üfüqdən üfüqə yüksələrək mələklərə qarışar. Allahu təalanın razılığına, sevgisinə qovuşar. Yox əgər nəfsin zərərli arzularına tabe olaraq yaradıldığı kimi heyvanlıq dərəcəsində qalarsa, işi tərsinə dönərək, alçala-alçala əsfəl-üs-safilinə (ən aşağı dərəcəyə) düşər. Fəlakətdən fəlakətə Cəhənnəmə qədər sürüklənər.

İnsan yaradılışda iki tərəflidir. Ona hidayət, üstünlük tərəfini tanıda bilmək və bunu qüvvətləndirməyə çalışmasını təmin etmək üçün bir müəllim, bir ustad lazımdır. Bəzi uşaqlar nəsihətlə, mülayim sözlə və hədiyyə verilərək yola gəlir. Bəzisi isə sərt, acı sözlə və cəza verilərək tərbiyə olunur. Ustad mahir olub, uşağın yaradılışının necə olduğunu anlamalı, onu şəfqət ilə, şirin və ya acı təsir edərək tərbiyə etməli, yəni yetişdirməlidir. Belə mahir və müşfiq bir rəhbər olmadıqca uşaq elm və əxlaq əldə edə bilməz, yüksələ bilməz. Rəhbər, yəni elm və əxlaq verən şəxs uşağı fəlakətdən qurtarıb, səadətə qovuşdurar.]

**Haqq təala elmi çox yerdə tərif etdi, Quranda,**
**Rəsulun elmi əmr edən sözləri meydanda.**

**İslamın ən böyük düşmənidir bil, cəhalət,**
**Çünki cahillik mikrobunun xəstəliyi: Fəlakət!**

**Cəhalət olan yerdən, din gedər dedi, Nəbi.**
**Dini sevən o halda elmi, fənni sevməli!**

**Cənnət qılınc kölgəsində, demədimi hədis,**
**Atom gücü, reaktiv uçuşuna bu əmr çox səlis!**

**İslamın zillətinə cahillikdir bütün illət!**
**Ey dərdi cəhalət, sənə düşməklə bu millət!**

**Bir hala gətirdin ki, nə din qaldı, nə namus,**
**Ey islamın sinəsinə çökən qap-qara kabus.**

**Ey xain düşmən, səni öldürməli əvvəl,**
**Sənsən bizə kafirləri üstün çıxaran əl!**

**Ey millət, oyan, cahilliyinə qurban gedirsən!**
**İslam gerilikdir deyə bir damğa yeyirsən!**

**Allahdan utan, bari burax dini əlindən,**
**Gir, leş kimi torpaqlara, özün girəcəksən!**

**Lakin bu sözüm də, təsir etməz ki, cahilə,**
**Allahdan utanmaq da olur əlbət elm ilə[1].**

## MÜQƏDDİMƏNİN İKİNCİ ƏLAVƏSİ

Burada ruhun yüksəlməsi və alçalmasının nə demək olduğu bildiriləcəkdir:

Ruhun yüksəlməsinə və fəlakətə düşməsinə səbəb olan şeyləri yuxarıda bildirmişdik. Burada yenə izah edəcəyik. Hər maddədə ağırlıq və həcm kimi ortaq özəllik olduğu kimi, o maddəyə məxsus

[1] Sədri Azam Mustafa Rəşid Paşa mason idi. İngilislərdən aldığı əmr ilə məktəblərdən fənn dərslərini qaldırdı. Fənn adamı yetişmədi. Müasir hərb silahları düzəldilmədi. Sonrakı hərblərdə həmişə məğlub olduq. İngilislərin islama etdikləri ən böyük düşmənlik bu oldu.

olub, onu tanıdan özəllikləri də vardır. Məsələn, hər maddənin müəyyən spesifik ağırlığı vardır. Hər mayenin qaynama və donma istilikləri, qatı cisimlərin müəyyən ərimə istiliyi, şüaların müəyyən dalğa boyları vardır. Bunun kimi canlıların da müəyyən xüsusi sifətləri, özəllikləri vardır. Məsələn, Dijital deyilən üskük otu qəlbə təsiri ilə tanınır. Atın minənə itaəti, qaçma özəlliyi məşhurdur. Atda bu xüsusiyyət olmasaydı ona uzunqulaq kimi yük vurulardı.

İnsan da bir çox baxımdan başqa heyvanlara, hətta bəzi xüsusiyyətləri ilə bitkilərə və cansız maddələrə oxşasa da, insanı heyvandan ayıran müəyyən xüsusi insanlıq xassələri vardır. Ona insanlıq şərəfi bu xüsusiyyətindən gəlir. Bu özəllik **“Nitq”**, yəni ruhun idrak [qavrama, düşünmə] qüvvətidir. Söz söyləməyə “nitq söyləmək” deyilirsə də, burada bu mənanı düşünmürük. Dilsiz kimsə danışmaz. Lakin yenə insandır. Çünki nitq sahibidir. Yəni, anlayışlıdır və düşünür. Tutuquşu danışır, lakin insan deyildir. Çünki nitqi, anlayışı, ağlı, fikri, düşünməsi yoxdur. Odur ki, yaxşı xasiyyətləri, yaxşı işləri pislərindən ayıran bu nitqdir. Allahu təala bu xüsusiyyəti insana verdi ki, bununla yaradanını anlasın. Qəlb və ruh bu qüvvəti ilə, yəni nitq, ağıl neməti ilə yerləri, göyləri [Maddə aləmini, fizika, kimya qanunlarını, həyati fəaliyyətləri] incələyərək Allahu təalanın varlığını və yüksək xüsusiyyətlərini anlayar. Sonra əmrlərinə və qadağalarına, yəni islamiyyətə tabe olaraq dünya və axirət səadətinə qovuşar, fəlakətlərdən xilas olar. Zariyat surəsinin 56-cı ayətində məalən, **“İnsanları və cinləri mənə ibadət etmələri üçün yaratdım”** buyuruldu. Bu ayəti-kərimədəki “ibadət etmələri üçün” ifadəsi, “məni tanımaları üçün” deməkdir. Yəni Allahu təalanı tanımaq, inanmaq üçün yaradıldıq. İnsanların heyvanlara oxşayan tərəfləri heyvani ruhdan irəli gələn şəhvani və qəzəb qüvvətləridir. Bunun ikisi də insan ruhu üçün dəyərli deyildir. Bu qüvvətlər heyvanlarda da vardır. Hətta heyvanlarda insandan daha da qüvvətlidir. Məsələn, öküz və uzunqulaq insandan daha cox yeyir və içir. Donuz və quşlar insandan daha çox şəhvətlidir. Aslan, camış və fil insandan daha qüvvətlidir. Qurd və pələng daha çox döyüşür, parçalayır. Siçan, pişik, it qaranlıqda da görür, uzaqdan tez iy hiss edirlər. Bütün bu qüvvətlər insan üçün şərəf olmaz. Bunlar şərəf sayılsaydı, adları çəkilən heyvanlar

insandan daha şərəfli, daha üstün olardılar. İnsanın şərəfi ruhunun iki qüvvətindən gəlməkdədir. Qəlb və ruh, elm, nitq qüvvəti ilə fəzilətləri, üstünlükləri başa düşəcək, əməli qüvvəti ilə bunlara sarılacaq, pisliklərdən çəkinəcəkdir.

Allahu təalaya mərifət hasil etmək, inanmaq, yalnız sözlə olmaz. İmanın altı şərti olan **"Aməntü"**nün mənasına qəlb ilə inanmaqla olar. Bu altı şərtdən beşincisi **"Qiyamət"** gününə, yəni öldükdən sonra dirilməyə inanmaqdır.

İslam düşmənləri deyir ki, "Cənnət nemətlərinin, quş ətləri, meyvələr, süd, saf bal, saraylar, huri qızlar kimi bədənə şirin gələn şeylər olduqları bildirilmişdir. Bunlar isə şəhvəti, heyvani arzuları yerinə yetirəcək şeylərdir. Ruhun səadəti, insanın yüksəkliyi, mərifət və ağlın bəyəndiyi şeylər olduğuna görə Cənnətdə bunlar unudulacaq, heyvani zövqlər ruhun zövqlərini örtəcəkdir. Bu hal dünyadakı yüksək insanların, Peyğəmbərlərin (aleyhimüssələvatü vəttəslimat), Vəlilərin, Alimlərin (rahimə-hümullahü təala), Cənnətdə ən aşağı insan, hətta heyvan dərəcəsinə düşəcəklərini göstərməzmi? Bundan başqa bədənin zövq, ləzzət ala bilməsi üçün əvvəl əzab, acı duyması lazımdır. Bədən sıxılmadıqca bir şey istəməz. Məsələn, aclıq olmadıqca, yemək, içmək ləzzəti bilinməz. Yorğunluq, yuxusuzluq sıxıntısı olmadan, rahatlıq və yuxu ləzzəti hiss olunmaz. Cənnətdə heç bir sıxıntı olmayacağı üçün bədənin bu ləzzətləri duymasına da imkan yoxdur deməkdir" dedilər. Hətta İbn Sina **"Şəfa"** və **"Nicat"** kitablarında Qiyamət gününü izah etdisə də, **"Muad"** adlı kitabında inanmadığını açıqlamışdır. Nəsrəddin Tusi də **"Təcrid"** kitabının bəzi yerlərində təkrar dirilməyi izah edirsə də, başqa yerlərdə də əksini bildirir.

Əhli-sünnət alimləri sözbirliyi ilə bildirirlər ki, Qiyamət günü bu bədən təkrar var olacaqdır. Lakin Cənnət nemətlərini, ləzzətlərini yalnız bədənin ləzzəti zənn etmək yalnışdır. Dünyada yüksəlməyə başlayan bir ruh, bədəndən ayrıldıqda qiyamətə qədər hər an yüksəlməyə davam edər. Cənnətdə bədən sonsuz qala biləcək xüsusiyyətdə, dünyadakından tam fərqli özəllikdə var olacaqdır. Yüksəlmiş olan ruh bu cəsəd ilə birləşərək qiyamət həyatı başlayacaqdır. Cənnətdə bədənin və ruhun ayrı-ayrı nemətləri, ləzzətləri olacaqdır. Yüksək olanlar, Cənnətdə də ruhun ləzzətlərinə əhəmiyyət

verəcəkdirlər. Ruhun ləzzəti bədənin ləzzətlərindən fərqli və qat-qat çox olacaqdır. Ruhun ləzzətlərinin ən şirini, ən yüksəyi də Allahu təalanı görmək olacaqdır. Yüksək insanların, ariflərin, dünyada ikən ruh Cənnətinə girmələri, axirətdəki ruh ləzzətlərindən bir qisminə qovuşmaları caizdir, deyildi. Bədənin Cənnətinə dünyada qovuşmaq olmaz. Cənnət ləzzətləri dünya ləzzətləri kimi deyildir. Hətta dünya ləzzətlərinə heç oxşamazlar. Allahu təala Cənnətdəki ləzzətləri dünyada eşidərək anlaya bilməmiz üçün dünyada onlara bənzəyən ləzzətlər yaratdı. Beləcə, o ləzzətlərə qovuşmaq üçün çalışmağımızı əmr etdi. Cənnət ləzzətlərinin dadını ala bilmək üçün əvvəl acı, sıxıntı çəkmək lazım deyildir. Çünki Cənnətdəki bədənin quruluşu dünyadakı kimi deyildir. Dünyadakı bədən yox olacaq bir halda yaradıldı. Təqribən yüz il dözəcək qədər sağlamdır. Cənnətdəki bədən isə sonsuz qalacaq, heç köhnəlməyəcək dərəcədə sağlamdır. Aralarındakı oxşarlıq insan ilə aynadakı əksi arasındakı bənzərlik kimidir. İnsan ağlı qiyamətdəki varlıqları anlaya bilməz. Ağıl, hiss orqanları ilə duyulanları və bunlara oxşayanları anlaya bilər. Cənnət nemətlərini, ləzzətlərini dünyadakılara oxşatmaq, onlar üzərində məntiq, fikir irəli sürmək insanı çürük, səhv nəticələrə aparar. Bilinməyən şeyləri bilinən şeylərə bənzədərək fikir yürütmək batildir.

Təsəvvüf böyüklərinə və bir çox alimlərə görə (rahiməhümullahu təala), dünyada **“Aləmi-misal”** deyilən üçüncü bir aləm vardır. Bu aləm gördüyümüz **“Cisim aləmi”** kimi maddədən deyil. **“Ruh aləmi”** kimi mücərrəd də deyildir. Yəni, maddəsiz də deyildir, ikisi arasındadır. Oradakı məxluqlar parçalana bildikləri üçün maddə aləminə bənzər. Ağırlığı olmadığı, yer tutmadığı üçün isə bənzəməz. Dünyadakı hər maddənin və hər mənanın o aləmdə bir misalı, şəkli vardır. Suyun misalı orada yenə sudur. Elmin misalı orada süddür. Gözəl əxlaqın və yaxşı işlərin orada görünüşü bostan, çiçək, meyvə kimi ləzzətli şeylərdir. Pis əxlaqın və çirkin işlərin o aləmdə görünüşü qaranlıq, ilan, əqrəb kimi sıxıntı verici şeylərdir. Hər kəsin gördüyü yuxular hamısı o aləmdəndir. Təsəvvüf böyüklərinə görə, aləmi-misal da iki yerə ayrılır. Təsəvvüfçülər bu aləmə xəyal qüvvəti ilə girərsə, **“Xəyala bağlı”** olan aləmi-misal deyilir. Xəyalın və başqa daxili hiss orqanlarının əlaqəsi olmadan

hasil olarsa, **“Mütləq”** olan aləmi-misal deyilir. **[“Məktubat”** kitabının ikinci cildinin əlli səkkizinci məktubunda Aləmi-misal haqqında geniş məlumat vardır. Bu uzun məktubun tərcüməsi **“Səadəti Əbədiyyə”** kitabı birinci qisim 39-cu maddəsində mövcuddur.] Təsəvvüfçülərdən bəzisi **”Riyazət”** (əziyyət) çəkərək və **“Mücahədə”** edərək aləmi-misala girdiklərini və orada gördükləri şeyləri xəbər vermişlər. Din alimləri də bu aləmin varlığını və bəzi sirlərini bildirmişlər. Abdullah ibni Abbas (radıyallahu anhüma) buyurdu ki, “Bu gördüyümüz aləmdən başqa daha bir aləm vardır. Bu aləmdə olan hər şeyin orada bir bənzəri vardır. Hətta orada mənim kimi bir İbni Abbas vardır”.

Təsəvvüf mütəxəssisləri (rahimə-hümullahu təala) deyir ki, insan öldükdə ruhu bədəndən ayrılır. İnsanın dünyada ikən etdiyi yaxşı işləri, imanı və gözəl əxlaqı nurlar, işıqlar, bostanlar, çiçəklər, hurilər, köşklər, incilər şəklini alarlar. Cahilliyi, pozğunluğu, pis xasiyyətləri də alovlar, qaranlıqlar, əqrəblər, ilanlar şəklində görünərlər. İmanlı və gözəl əxlaqlı ruh nemətləri Cənnətlərə özü aparır. Kafir və fasıq ruhlar da alovları, əzabları özü ilə birlikdə aparır. Ruh bu cisim aləmində qaldıqca, yükləndiyi bu şeyləri başa düşməz. Bədənə bağlılığı və cisim aləminə dalmış olması onları başa düşməsinə mane olur. Ruh bədəndən ayrılanda bu maneələr qalmaz. O zaman özündə olan yaxşı və pis yükləri onlara uyğun şəkillərdə görməyə başlar. İnsanın dünyadakı halı bir sərxoşa bənzər. Ölmək sərxoşun ayılması deməkdir. Sərxoşun yanına sevdiyi şəxslər toplanar, sevdiyi hədiyyələr gələrsə, yaxud qoynuna əqrəblər, ilanlar girərsə hec birini duymaz. Ayılanda bunları görər və başa düşər. Bu “Axirət halları” aləmi-misal halları kimidir. Sadəddin Təftazanı (rahimə-hullahü təala) **“Şərhi-məqasıd”** kitabında aləmi-misalı izah etdikdən sonra bunları isbat edəcək dəlil, sənəd olmadığından həqiqi alimlər buna əhəmiyyət vermədilər, deyir. Həqiqi alim deyərək, ağlın anlaya biləcəyi hər şeyi ağla qəbul etdirməyə çalışan alimlərə işarə etməkdədir. Halbuki, ağla tabe olan kimsənin özü bu aləmə qovuşmasa da bunu heç olmasa, “olmayacaq şey deyil”, deyərək rədd etməməsi lazımdır. Necə ki, ağla tabe olanların öndərlərindən olan İbni Sina “Olmayacağı isbat edilməyən bir şeyə olmaz deməməlidir. Çünki isbat etmədən

olmaz demək, anlamadığına inanmamaq kimi eyib və qüsurdur” demişdir.

Şihabuddini Sührəverdi (rahmətullahi aleyh) buyurur ki, “Milyonlarla ulduzun bir araya gəlib bir sistem qurduğunu və hər sistemin boşluqda pozulmadan hərəkət etdiyini deyən astronomiya adamlarının sözlərinə görmədən inanıldığı kimi təsəvvüfçülərin kəşf etdikləri, bildirdikləri aləmi-misal və ruh aləminə də inanmaq lazım gəlir”. İnkar edənlərə deyil, xəbər verənlərə inanmaq doğru olar. [Ağlı olan, fənn bilgilərindən xəbəri olan Allahu təalanın varlığını və birliyini dərhal anlar və isbat edər. Axirətə inanmaq belə deyil. Buna, Allahu təala xəbər verdiyi üçün inanmaq lazımdır.]

İnsanlar dörd qisimdir:

1 - Peyğəmbərə inanar və buna tabe olar. Bunlar dünyada rahat və hüzur içində yaşayar. Axirətə, düz Cənnətə gedər. Nəfsinə uyaraq hasil olan günahları, qəlb ilə tövbə, dil ilə istiğfar edərək və dünyada sıxıntılar çəkərək bağışlanacaq, birbaşa Cənnətə gedərək nemətlər içində sonsuz yaşayacaqdır. Bunlara **“Saleh qul”** deyilir.

2 - Peyğəmbərə inanar və buna uyar. Dünyada dərd, sıxıntı və xəstəlik içində yaşayar. Dərdlərə səbr və şükür edər. Səbrləri dərəcələrinin, sonsuz nemətlərinin artmasına səbəb olar. Bunlar nəfslərinə tabe olmaz. Bunlara **“Vəli”** deyilir. Belə kimsələr azdır.

3 - Peyğəmbərə inanar. Peyğəmbərə deyil, nəfsinə tabe olar. Dünyada sıxıntı çəkər. Bunlar nəfslərinə tabe olaraq hasil olan günahlar qədər Cəhənnəmdə yandıqdan sonra, Cənnətə girəcəkdirlər. Bunlara **“Fasiq qul”** deyilir. Çox zalım kimsələrin daha çox azmaları üçün işlərində müvəffəqiyyət və rahatlıq da verilir. İslamiyyətin bir əmrini bəyənməyən kafir olar. Kafirlər Cənnətə girməyəcək, Cəhənnəmdə sonsuz yanacaqlar.

4 - Peyğəmbərə inanmaz. Əhkami-islamiyyənin əmr və qadağan etdiyi şeyləri ağıl ilə tapıb, bunlara və müsəlmanlara tabe olan kafirlər dünyada səadətə qovuşar.

## ƏXLAQ ELMİ VƏ İSLAMİYYƏTDƏ ƏXLAQ TƏRBİYƏSİ

Qəlb ilə ruhun hallarını və işlərini bildirən elmə **"Əxlaq elmi"** deyilir. İnsan tək başına ikən bu hallar və işlər doqquz bab olaraq bildirilmişdir. [Biz kitabımıza bunlardan yalnız altı bab yazdıq.]

### BİRİNCİ BAB

Burada əxlaqın (xasiyyətin) növləri, yaxşı və yaman şeylər bildiriləcəkdir. Əxlaq, qəlb ilə ruhun mələkəsi, yəni alışqanlığı deməkdir. Bu alışqanlıq ilə düşünməyə ehtiyac qalmadan iş görərlər. Yerləşmiş olan əxlaqa **"Mələkə"** deyilir. Keçici olan əxlaqa **"Hal"** deyilir. Məsələn, gülmək, utanmaq bir haldır. Mərdlik, cəsarət bir mələkədir. Əxlaq, yəni xasiyyət dedikdə, mələkə başa düşülür. Hərdən xeyir iş görmək xasiyyət deyildir. Hər zaman xeyir işlərsə, mərd xasiyyətli deyilir. Hər zaman, lakin özünü məcbur edərək xeyir işlərsə, yenə mərd xasiyyətli olmaz. Asanlıqla, sevə-sevə edərsə xasiyyət deyilir.

Xasiyyət, yaxşı və ya pis iş görməyə səbəb olar. Yaxud da yaxşı və pis olmayan şeyə səbəb olar. Birincisinə **"Fəzilət"** və ya yaxşı əxlaq deyilir. Mərdlik, şücaət, yəni igidlik, mülayimlik belədir. İkincisinə **"Rəzalət"** və ya pis əxlaq deyilir. Xəsislik və kişilər üçün qorxaqlıq belədir. Üçüncüsünə nə fəzilət, nə də rəzalət deyilməz. **"Sənət"** deyilir. Dərzilik, cütçülük belədir. Bu kitabda birincisi və ikincisi haqqında söhbət gedəcək.

Qəlbin və ruhun iki qüvvəti olduğunu müqəddimənin son səhifəsində bildirmişdik. Birincisi **"Qüvvəti alimə"** və **"Müdrikə"** deyilən "anlama qüvvəti" idi. Bu qüvvətə **"Nitq"** və **"Ağıl"** demişdik. Bu qüvvət ilə ağlın çatdığı şeyləri anlayarlar. İkincisi hərəkət etdirən **"Qüvvəti amilə"**, "etdirən qüvvət" idi. Hər iki qüvvət də iki yerə bölünür. Ağılın birinci qisminə **"Hikməti-nəzəri"**, ikinci qisminə **"Hikməti-əməli"** deyilir. Etdirən qüvvətin birinci qisminə **"Şəhvət"** deyilir ki, zövqlü, şirin şeylərə qovuşmaq istəyən qüvvətdir. İkinci qisminə **"Qəzəb"** deyilir ki, bəyənmədiyi şeylərdən uzaqlaşdırmaq istəyən qüvvətdir. Bu dörd qüv-

vətdən müxtəlif işlər meydana gəlir. Bu işlər ağla uyğun, gözəl, az olmaqdan və ifrat olmaqdan qurtulmuş olsa, bunları edən əxlaq fəzilət olar. Az və ya ifrat olan işləri edən xasiyyət rəzalət olar. Ağlın nəzəri qüvvəti yaxşı olarsa, o əxlaqa **“Hikmət”** deyilir. İkinci qüvvəti olan **“Hikməti-əməli”** qüvvəti yaxşı olarsa, o əxlaqa **“Ədalət”** deyilir. Qəlbin və ruhun etdirən qüvvətlərinin şəhvani qüvvəti yaxşı olarsa, o əxlaqa **“İffət”** deyilir. Qəzəb qismi yaxşı olarsa, o əxlaqa **“Şücaət”** deyilir. Yaxşılıqların əsası bu dörd əxlaqdır. Ədalətin azı-çoxu olmaz. Digər üçünün həddindən artıq və nöqsan olması rəzalət olar. Hikmətin həddindən artığı **“Cərbəzə”**, yəni yaramazlıqdır. Nöqsan olması isə, **“Bəladət”**, yəni səfehlikdir. Ədalətin həddindən artığı və nöqsanı olmaz. Yalnız ziddi, tərsi olar ki, bu da **“Zülm”**dür. İffətin həddindən artığı **“Fücur”**, yəni **“Pozğunluq”**dur. Nöqsan olması isə **“Humud”**, yəni durğunluqdur. Şücaətin həddindən artığı **“Təhəvvür”**, yəni təcavüz etməkdir. Nöqsanı qorxaqlıqdır. Əxlaqın bu növləri İmam Qəzali həzrətlərinin **“İhya”** kitabında belə tərif edilmişdir. Abdülqani Nablüsinin[1] **“Hadikat-ün-Nədiyyə”** kitabında da yazılmışdır. Bu kitab ərəb dilində olub, İstanbulda “Həqiqət Kitabevi” tərəfindən ofset üsulu ilə cap edilmişdir. Bəzilərinə görə hikmət, iffət və şücaət bir yerə gələndə **“ədalət”** olur.

Cərbəzə xasiyyətli şəxs ruhun qüvvəti olan ağlını hiylə, dedi-qodu, məsxərəlik etmək üçün istifadə edər. Bəladət xasiyyətli şəxs həqiqətləri başa düşməz. Yaxşı, pis şeyləri bir-birindən ayıra bilməz. Təhəvvür xasiyyətli şəxs özünü təhlükələrə atar. Qüvvətli düşmənlə döyüşməyə hazır olar. Qorxaq olan adam səbr edə bilməz, dözə bilməz, haqqını axtara bilməz. Fücur xasiyyətli olan yeməkdə, içməkdə və evlənməkdə məkruhlara və haramlara düşər. Çirkin, pis işlərdən zövq alar. Humud xasiyyətli olan şəxs də halal olan zövqləri, haqqı olan arzuları tərk edər, ya özü həlak olar, yaxud nəsli kəsilər.

İnsanlarda olan bütün gözəl əxlaq yuxarıda bildirilən dörd gözəl ana əxlaqdan doğular. Hər kəs bu dörd əxlaq ilə öyünər. Hətta soyu ilə, yaxınları ilə iftixar edən kimsələr, onlarda bu əxlaqlar olduğu üçün öyünürlər.

---

[1] Abdülqani Nablüsi 1143-cü [miladi 1731-ci] ildə Şamda vəfat etdi.

## İKİNCİ BAB

Burada dörd əsas gözəl əxlaqın qisimləri bildiriləcəkdir. Bu dörd ana əxlaqdan törəyən yaxşı xasiyyətlər saysız deyiləcək qədər çoxdur. Bunların hər birini izah etməyə insanın gücü çatmaz. Burada islam əxlaqçılarının üstündə durduqları, məşhurlarını bildirəcəyik.

Hikmətdən, yeddi gözəl əxlaq meydana gəlir:

1 – Birincisi **"Zəka"**dır. Bir mələkədir. Bir vərdişdir. Bunun köməyi ilə insan bilinən şeylərdən bilinməyənləri çıxarır. Dəlilləri bir araya toplayaraq axtarılan şeyləri tapır. Bunu qazanmaq üçün məlum şeylərin köməyi ilə məchul olan şeyləri tapmağa çalışmaq, hesab [riyaziyyat] və həndəsi problemləri həll etmək lazımdır.

İnsanların zəkaları müxtəlif miqdardadır. Zəkanın ən üstün dərəcəsinə **"Dahilik"** deyilir. Zəka **"Test"** üsulu ilə ölçülür. 20-ci əsrin tanınmış ruhiyyatçılarından [psixoloqlarından] Amerikalı Terman[1] deyir ki, test üsulu ilə zəkanın ölçülməsi ilk olaraq Osmanlılarda meydana gəldi. Osmanlı orduları Avropada irəliləyir, Vyana əldən gedirdi. Vyana gedərsə, bütün Avropanın müsəlmanların əlinə keçməsi çox rahat olacaqdı. Osmanlılar Avropaya islam mədəniyyətini gətirir. Elm, fənn, əxlaq nurları, xristianlığın qaraltdığı, uyuşdurduğu yerlərə, gümrahlıq, insanlıq, hüzur, səadət saçırdı. Əsrlərlə diktatorların, kapitalistlərin, keşişlərin zülmləri altında inləyən, barbarlaşan Avropa islam ədaləti ilə, islam elmləri ilə, islam əxlaqı ilə insan haqlarına qovuşurdu. Avropa diktatorları və öncəliklə xristian kilsələri Osmanlı ordularına qarşı son səylərini sərf edirdilər. Bir gecə İstanbuldakı ingilis səfiri Londona tarixi məktubunu göndərdi. **TAPDIM... TAPDIM!...** Osmanlı ordularının irəliləmə səbəbini tapdım. Onları dayandırmanın yolunu tapdım, deyirdi. Belə yazmışdı:

"Osmanlılar ələ keçirdikləri hər yerdə din, irq fərqi qoymadan, seçdikləri uşaqların zəkalarını ölçür, üstün zəkalıları ayıraraq mədrəsələrdə oxudub islam tərbiyəsi ilə yetişdirirlər. Bunların arasından da seçdiklərinə saraydakı **ƏNDƏRUN** deyilən ali məktəbdə o zamanın ən irəli bilgilərini verirdilər. Odur ki, Osmanlı

---

[1] Terman 1380 -cı [miladi 1960] ildə sağ idi.

siyasət adamları, baş nazirləri bu cür seçilən, yetişdirilən iti zəkalı şəxsiyyətlərdir. Sokullular, Körpülülər belə yetişmişdir. Osmanlı axınlarını dayandırmaq, xristianlığı qurtarmaq üçün tək çarə, əndərun məktəblərini və mədrəsələri dağıtmaq, onları içəridən yıxmaqdır". Bu məktubdan sonra İngiltərədə "Müstəmləkələr nəzarəti" quruldu. Burada yetişdirilən casuslar, xristian missionerləri və masonlar yalan təbliğat və parlaq vədlərlə ovladıqları cahilləri, Osmanlı dövlətinin kilid nöqtələrinə yerləşdirməyə və bu kuklaların əli ilə mədrəsələrdən fənn, əxlaq dərslərini, hətta yüksək din bilgilərini çıxarmağa, müsəlmanları cahil qoymağa çalışırdılar. Bu hiyləgər kampaniyalarında tənzimatdan sonra tam müvəffəqiyyət əldə etdilər. İslam dövləti yıxıldı. İslamiyyətin dünyaya nəşr etdiyi səadət, hüzur nurları söndü.

2 – Sürati-fehmdir. Buna **"Sürati-intiqal"** da deyilir. Ehtiyac olduqda, lazım olan şeyi dərhal anlayan mələkəyə deyilir. Bir şey eşitdikdə onun əksini, tərsini də dərhal başa düşər. Zəka, düşünmədə və araşdırmada, yəni fikirdə və nəzərdə olur. Yəni, bilinən şeyləri araşdırıb, bunlardan bilinməyən bir nəticə əldə edər. Sürati-fehm isə fikirdən və nəzərdən başqa şeylərdə olur.

3 – Zehin açıqlığıdır. İstədiyi şeyləri tez anlamaq, əldə etməkdir.

4 – Diqqət etməkdir. Düşüncələr mane olmayıb, istədiyi şeyə təvəccüh (baxmaq) etməkdir.

5 – Təakkuldur. Lazımlı şeyləri öyrənərkən, hər şeyin həddini, sərhədini aşmamaqdır. Yəni, lazımlı olanı tərk etməz, lazımsız olanla da məşğul olmaz, vaxt öldürməz.

6 – Təhaffuz, yəni unutmamaqdır. Ruhun ağlasığan, anlayan məlumatları unutmamasıdır.

7 – Təfəkkürdür. Yaddaşdakı məlumatları hər istənilən zamanda xatırlamaqdır.

Şücaətdən hasil olan gözəl əxlaq on birdir:

1 – Ciddi olmaqdır. Təriflənməkdən sevinməz, pislənməkdən kədərlənməz. Kasıbla varlıları bərabər tutar. Şirini acını ayırmaz. Hadisələrin dəyişməsi ilə və qorxulu, sıxıntılı hallar qarşısında çalışması sarsılmaz.

2 – Necdət, yəni igidlikdir. Qorxulu hallarda, sıxıntılı işlərdə, səbr etmək və durğunluqdur. Bu zamanda bağırıb qışqırmaz. Uyğun olmayan iş görməz.

3 – Himmət sahibi olmaq, çalışqan olmaqdır. Bu dünyanın mövqeyi, rütbəsi, yüksəlməsi, alçalması, sərvəti gözündə olmaz.

4 – Səbatdır (dözümlülük). Məqsədə qovuşmaq üçün çalışarkən, qarşılaşdığı sıxıntılara qatlanmaq, dayana bilməkdir.

5 – Hilmdir. Ruhun sakit olması, hirslənməməsidir. Mülayim xasiyyətli olmaqdır.

6 – Sükundur. Vətəni, dini və milləti qorumaq üçün edilən cihadlarda, müharibələrdə səy və müqavimət göstərib, düşməninə lağ etdirməməkdir.

7 – Şəhamətdir. Yaxşı işlər görmək, yüksək dərəcələr ələ keçirmək istəməkdir. Xeyir ilə xatırlanmaq, savab qazanmaq istəyər.

8 – Dözümdür. Gözəl xasiyyətlər, yaxşı işlər əldə etmək üçün çalışmaqdan qorxmamaqdır.

9 –Təvazökar olmaqdır. Dünya rütbələrində özündən aşağı olanlara böyüklük göstərməməkdir. Çünki əlinə keçənlər Allahu təalanın lütfü və ehsanıdır. Öz əlində bir şey yoxdur. Vəzifə və sərvət sahiblərinin təvazökar olmaları yaxşı olar. Savab olar. Bir mənfəətə qovuşmaq və ya bir zərərdən qorunmaq üçün təvazö göstərməyə **“təbasbus”**, yəni yaltaqlanmaq deyilir. Dilənçilərin təvazöləri belədir, günahdır.

10 – Hamiyyətdir. Dini, milləti himayə etməkdə, qorumaqda, şərəfini qorumaqda tənbəllik etməyib, bütün qüvvəti ilə çalışmaqdır.

11 – Riqqətdir. İnsanlardan gələn zərərlərə kədərlənməməkdir. Bundan dolayı işlərində və hərəkətlərində dəyişiklik olmamalıdır. Yaxşılıq etməyi tərk etməmək lazımdır.

İffətdən on iki gözəl əxlaq meydana gəlir:

1 – Həyadır. Həya, pis iş gördükdə utanmaqdır.

2 – Rifqdir. Rifq, islamiyyətə tabe olmaqdır. Kəlimənin mənası, şəfqət göstərmək, yaxşılıq etməkdir.

3 – Hidayətdir. Yaxşı xasiyyətli olmağa çalışmaqdır.

4 –Müsaləmətdir. Fikirlər ayrıldığı, sözlər çoxaldığı zaman münaqişə etməmək, sərtliyi, bölücülüyü, ayırıcılığı istəməyib, uyğunlaşmaq, barışmaq istəməkdir.

5 – Nəfsə hakim olmaqdır. Şəhvət zamanında nəfsə tabe olmamaq, iradəsinə hakim olmaqdır.

6 – Səbrdir. İnsanın, haramdan çəkinib, nəfsin pis arzularını etməməsidir. Beləcə, sonu peşmanlıq olan ləzzətlərdən üz çevirər. Səbr ikiyə ayrılır: Biri, günah işləməmək üçün səbr etməkdir. Şeytan, insanın öz nəfsi və pis yoldaşlar insana günah işlətmək istəyərlər. Bunları dinləməyib səbr etmək çox savabdır. Burada bildirilən səbr bu səbrdir. İkincisi, dərdlərin, bəlaların acılarına səbr edib, qışqırıb bağırmamaqdır. Çox kimsə, səbr dedikdə, yalnız bu səbri anlayır. Bu səbr də savabdır. Yəni, səbrin ikisi də fərzdir.

7 – Qənaətdir. Nəfəqədə (ehtiyacda), yəni yeməkdə, içməkdə, geyinməkdə və sığınacaq yerdə zərurət miqdarına razı olub, daha çox axtarmamaqdır. Yoxsa, veriləni almamaq demək deyildir. Bu əxlaqa taqtir deyilir ki, pis əxlaqdır. Ağlın da, islamiyyətin də bəyənmədiyi bir şeydir. Qənaət isə gözəl əxlaqdır. [Ölməmək, bir üzvün tələf olmaması üçün lazım olan şeyə **“Zərurət”** deyilir. Nəfəqə üçün və bədəni sıxıntıdan qorumaq üçün lazım olan şeyə **“Ehtiyac”** deyilir. Ehtiyacdan çox olub, xoşa gələn, şirin olan və insanın qiymətini, şərəfini qorumağa yarayan şeylərə **“Zinət əşyası”** deyilir. Zinət əşyasından öyünmək, başqalarına göstəriş və üstünlüyünü göstərmək üçün istifadə etməyə **“Təhafur”** deyilir. Zərurət və nəfəqə əşyasını təmin etmək fərzdir. Nəfəqədən artıq olan ehtiyac əşyasını, məsələn dərman və təbib məsrəflərini təmin etmək sünnətdir. Zinət caizdir. Təhafur haramdır.]

8 – Vəkardır. Ehtiyacları və qiymətli şeyləri əldə edərkən tələsməyib, yavaş hərəkət etməkdir. Vəkar, təmkinli olmaqdır. Yoxsa, fürsəti qaçıracaq, mənfəətdən məhrum olacaq şəkildə ləng olmaq deyildir.

9 – Vəradır. İslamiyyətin haram etdiyi və haram şübhəsi olan şeylərdən çəkinmək və əmr etdiyi şeyləri, hər kəsə faydalı olan işləri etməkdir. Qüsurlu və tənbəl olmaqdan çəkinməkdir.

10 – İntizamdır. İşləri bir sırayla, nizamla etməkdir.

11 – Hürriyyətdir. Malı, pulu halaldan qazanmaq və yaxşı yerlərə sərf etmək, hər kəsin haqqına riayət etməkdir. Hürriyyət, başı boş olub, hər istədiyini etmək deyildir.

12 – Səxavətdir. Pulu, malı xeyirli, yaxşı yerə sərf etməkdən ləzzət almaqdır. İslamiyyətin əmr etdiyi yerlərə sevə-sevə verməkdir. Səxavət, cömərd olmaq deməkdir. Gözəl əxlaqın ən yüksəklərindəndir. Ayəti-kərimələrdə və hədisi-şəriflərdə mədh olunmuşdur. Səxavətdən bir çox gözəl əxlaqlar meydana gələr. Bunlardan səkkizi məşhurdur:

1 – Kərəmdir. Hər kəsə faydalı işlər və pulla kömək etməyi sevməkdir.

2 – İsardır. Özü möhtac olduğu malı, möhtac olan başqasına verib, yoxluğuna səbr etməkdir. Gözəl əxlaqın ən qiymətlisidir. Ayəti-kərimələr ilə mədh olunmuşdur.

3 – Əfvdir. Düşməndən və ya təqsirkardan intiqam almağa, qarşılığını verməyə gücü yetərkən, bunu etməməkdir. Yamanlığa yaxşılıqla cavab vermək əfvdən daha yaxşı olar. Beyt:

**Pisliklərə qarşı asan olur pislik,**
**Pislik edənlərə yaxşılıq etmək mərdlik!**

4 – Mürüvvətdir. Möhtac olanlara lazım olan şeyləri verməkdir. Başqalarına yaxşılıq etməyi sevməkdir.

5 – Vəfadır. Yaxınlara, dostlara dolanışıqda kömək etməkdir.

6 – Müvasatdır. Yaxınları, dostları nemətlərinə ortaq etmək, yaxşı dolanmaqdır.

7 – Səmahatdır. Verməsi lazım və vacib olmayan şeyləri sevə-sevə verməkdir.

8 – Müsaməha etməkdir. Tərk etməsi lazım olmayan şeyləri başqasına faydalı olmaq üçün tərk etməkdir. Başqasının qəbahətini görməmək deməkdir.

Ədalətdən on iki əxlaq meydana gələr:

1 – Sədaqətdir. Yoldaşını sevməkdir. Onun yaxşılığını, rahatlığını istəməkdir. Onu zərərdən qorumaqdır. Onu sevindirməyə çalışmaqdır.

2 – Ülfətdir. Bir cəmiyyətin, din və dünya düşüncələrində, inanclarında bir-birlərinə uyğun olmasıdır.

3 – Vəfadır. Yola getmək, köməkləşməkdir. Sözündə durmaq, haqqa riayət etmək də deyilir.

4 – Şəfqətdir. Başqalarına dərd, fəlakət gəlməsindən kədərlənməkdir. Hər kəsin dərdlərdən qurtulmasına çalışmaqdır.

5 – Sılai-rahmdir. Qohumlarının, yaxınlarının haqlarına riayət etmək, onları ziyarət etmək və kömək etməkdir. Rəsulullah (sallallahu aleyhi və səlləm) bir hədisi-şərifdə, **“Bütləri, sitayiş edilən heykəlləri qırmaq üçün və qohuma yaxşılıq etmək üçün göndərildim”** buyurdu.

6 – Mükafatdır. Yaxşılığa qarşı yaxşılıq etməkdir.

7 – Hüsni-şirkətdir. Haqqa riayət edib, ədalətlə hərəkət etməkdir.

8 – Hüsni-qəzadır. Hər kəsin hər şeydə haqqını verib, başa qaxmamaq və peşman olacaq iş görməməkdir.

9 – Təvəddüddür. Təvəddüd, məhəbbət deməkdir. Yoldaşlarını sevib, hədiyyə verib özünü sevdirməkdir.

10 – Təslimdir. İslamiyyətin əmrlərini, qadağalarını və islam əxlaqını, şirin gəlməsə belə, qəbul edib razı olmaqdır.

11 – Təvəkküldür. İnsan gücünün xaricində olan və dəyişdirilməsi mümkün olmayan kədərli hadisələri, əzəldə təqdir edilmiş, yazılmış bilib, kədərlənməmək, Allahu təaladan gəldiyini düşünərək, sevə-sevə qarşılamaqdır.

12 – İbadətdir. İbadət, hər şeyi yoxdan var edən və hər canlını hər an görünər görünməz qəzalardan, bəlalardan qoruyan və hər an müxtəlif nemətlər, yaxşılıqlar verərək yetişdirən Allahu təalanın əmr və qadağalarını yerinə yetirməkdir. Ona xidmətdə qüsur etməməyə çalışmaqdır. Allahu təalanın sevgisinə qovuşmuş olan Rəsullara, Nəbilərə (aleyhimüssaləvatü vəttəslimat), Vəlilərə, Alimlərə (rahimə-hümullahü təala) bənzəməyə çalışmaqdır.

[Müsəlmanlar iki qisimdir: Havas (alimlər) və avam (cahillər). Türkcə **“Dürri Yekta”**-da deyilir ki, “Avam, sarf (kəlimə elmi), nahv (cümlə elmi) və ədəbiyyat elmlərinin üsullarını, qaydalarını bilməyən kimsələrdir. Bunlar, fətva kitablarını anlaya bilməz. Bunların, **“iman”** və **“ibadət”** bilgilərini axtarıb, soruşub, öyrənmələri fərzdir. Alimlərin də sözləri, nəsihətləri və yazıları ilə ilk əvvəl iman, sonra dinin təməli olan beş ibadəti öyrətmələri fərzdir. **“Zahirə”** və **“Tatarhaniyyə”** kitablarında imanın şərtlərini və **“Əhli sünnət etiqadı”**nı öyrətməyin hər şeydən əvvəl lazım olduğu bildirilməkdədir”. Bunun üçündür ki, böyük alim, zahiri və ba-

tini elmlərin mütəxəssisi, seyid Abdülhakim Arvasi (rahmətullahi aleyh) vəfatına yaxın demişdir: "İstanbul məscidlərində otuz il yalnız əhli-sünnət alimlərinin kitablarında yazılı olan imanı, yəni Əhli-sünnət etiqadını və islamın gözəl əxlaqını izah etməyə çalışdım. Əhli-sünnət alimləri bu bilgiləri Əshabi-kiramdan, onlar da Rəsulullahdan öyrəndilər." İman bilgilərinə **"Aqaid"** və **"Etiqad"** deyilir. Bunun üçün biz də bütün kitablarımızda Əhli-sünnət etiqadını, islamın gözəl əxlaqını, hər kəsə yaxşılıq və hökumətə kömək etmək lazım olduğunu bildiririk. Peyğəmbərimiz (sallallahu aleyhi və səlləm) **"Din, qılıncların kölgələri altındadır"** buyuraraq müsəlmanların hökumət və qanun himayəsində rahat yaşaya biləcəklərini bildirdi. Hökumət qüvvətli olduqca rahatlıq, hüzur artar. Avropa, Amerika kimi kafir məmləkətlərdə rahat yaşayan, dini vəzifələrini sərbəst yerinə yetirən müsəlmanlar da, onlara hürriyyət verən hökumətə, qanunlara qarşı çıxmamalı, fitnəyə, anarxiyaya vəsilə olmamalıdırlar. Əhli-sünnət alimləri (rahiməhümullahü təala) belə olmağımızı əmr etmişdir. İbadətin ən üstünü, ən qiymətlisi, fitnə-fəsad atəşi ilə oynamamaq, **"Əhli-sünnət etiqadı"**nı öyrənib, imanın buna uyğun olmasına çalışmaqdır. İmanı belə düzəldərək, **"Bidət əhli"** deyilən yetmiş iki növ bölücü, zay inanışdan xilas olduqdan sonra, ibadətlərdə də bidət işləməkdən çəkinmək lazımdır. İslamiyyətin əmr etmədiyi şeyləri ibadət zənn edərək etməyə **"İbadətdə bidət"** deyilir. Allahu təalanın əmrlərinə və qadağalarına **"Əhkamı-islamiyyə"** deyilir. Əhkamı-islamiyyəyə tabe olmağa **"İbadət etmək"** deyilir. İbadətlərin doğru olaraq edilməsini bildirən **"Dörd məzhəb"** vardır. Bunların dördü də haqdır, doğrudur. Bu dörd məzhəb, Hənəfi, Şafi, Maliki, Hənbəli məzhəbləridir. Hər müsəlmanın, bu dörd məzhəbdən birinin **"Elmihal"** kitabını oxuyub, ibadətlərini bu kitaba uyğun etməsi lazımdır. Beləcə, bu məzhəbə girmiş olar.

Həzrəti Əli (kərrəməllahü vəchəh) buyurur ki, "Öldükdən sonra təkrar dirilməyə inanmayan birini görsən, ona de ki, mən inanıram. Sənin dediyin doğru çıxarsa, mənim heç zərərim olmaz. Mənim dediyim doğru olarsa, sən əbədi atəşdə yanacaqsan!" Avropada, Amerikada bütün fənn adamları, dövlət adamları, professorlar, komandirlər axirət həyatına inanırlar. Hamısı kilsələrə

gedib tapınırlar. Yəhudilər, Buddistlər, Brahmanlar, atəşə tapınanlar, bütpərəstlər, mədəni, vəhşi hər kəs inanır. Yalnız, bir çox kommunist məmləkətini idarə edən, yalançı, zalım, azğın diktatorlar və bunların ətrafındakı və başqa məmləkətlərdəki pullu nökərləri inanmır. Dolana bilmələri və zövqləri üçün din düşmənliyi edən bir neçə cahilin, axmağın, dünya əhalisinin yüzdə doxsanını təşkil edən inananlar qarşısında haqlı olacaqları düşünülə bilərmi? İnanmayan bir kimsə öldükdə öz inancına görə yox olacaq. İnanana görə isə, Cəhənnəmdə əbədi əzab görəcəkdir. İnanan bir kimsə öldükdə inanmayana görə yenə yox olacaq. Öz inancına görə əbədi zövqlər, nemətlər içində yaşayacaqdır. Ağlı, bilgisi olan bir insan bu ikisindən hansını seçər? Əlbəttə, ikincisini deyilmi? Dünya işlərindəki, maddə aləmindəki intizam Allahu təalanın varlığını ağlı olanlara xəbər verir. Axirətin var olduğunu da Allahu təala xəbər verir. O halda, ağlı, elmi olanın Allahın varlığına və birliyinə inanması lazımdır. İnanmamaq axmaqlıq, cahillikdir. Allahu təalaya iman etmək, Onun **“Uluhiyyət sıfatları”**na yəni Onun **“Zatı xüsusiyyətləri”**nə və **“Sübuti xüsusiyyətləri”**nə, verdiyi xəbərlərə inanmaqdır və Onun dininə tabe olmaqdır. İslamiyyətə tabe olan hər kəs dünyada da rahat və məsud yaşayar. Hər kəsə yaxşılıq edər. Allahu təala qullarına çox rəhm etdiyi, acıdığı üçün faydalı şeylər etmələrini əmr etmişdir. Bu əmrlərə **“Fərz”** deyilir. Zərərli şeyləri qadağan etmişdir. Bunlara **“Haram”** deyilir. Fərzlərin və haramların hamısına **“Əhkami islamiyyə”** deyilir. Dinlər, Allahu təalanın qullarına rəhmətidir, ehsanıdır. Dinlərə inanan və tabe olan dünyada və axirətdə Allahu təalanın lütfünə qovuşar, məsud olar. İnanmayan ağlı ilə faydalı olduğunu anlayaraq, dünya işlərində tabe olarsa, yalnız dünyada məsud, rahat yaşayar. İndi Avropalıların bir qismi bunun üçün rahat və məsud yaşamaqda, islamiyyətə tabe olmayan müsəlmanlar rəzil, pis yaşamaqdadır.]

## ÜÇÜNCÜ BAB

Burada pis əxlaq haqqında söhbət gedəcəkdir. Gözəl əxlaqın anası, təməli dörd gözəl əxlaq idi. Pis əxlaqın başı da dörddür:

1 – Rəzalət, hikmətin ziddidir.

2 – Cübn, qorxmaq, ürəksiz olmaq, şücaətin ziddidir.

3 – Fücur, nəfsə tabe olmaq, günah işləmək, iffətin ziddidir.

4 – Cevr, zülmdür. Ədalətin ziddidir.

Hər gözəl əxlaqın ziddi, qarşılığı olan saysız pis əxlaq vardır. Çünki yaxşılıq tam orta yol deməkdir. Ortanın sağında, solunda olmaq yaxşılıqdan ayrılmaqdır. Ortadan uzaqlığı qədər yaxşılığı azalar. Haqq yol birdir. Zay, pozğun yollar isə çoxdur. Hətta sonsuzdur. Doğru yola qovuşduqdan sonra orada qalmaq, oradan heç çıxmamaq çox çətindir. Hud surəsinin 113-cü ayəsində məalən, **"Əmr olunduğun doğru yolda ol!"** buyuruldu. Bu ayəti-kərimə endiyi zaman Rəsulullah (sallallahu aleyhi və səlləm), **"Hud surəsi saqqalıma ağ saldı"** buyurdu. Ayəti-kərimədə əmr olunan istiqaməti yerinə yetirə bilmək üçün Peyğəmbərlər (aleyhimüssaləvatü vəttəslimat), Vəlilər, Siddiqlər (rahimə-hümullahü təala) çaşıb qalmışdılar. Bu qorxudandır ki, Əfdali-kainatın (sallallahu aleyhi və səlləm) mübarək saqqalına ağ düşmüşdür. Doğru yolda olmaq çox çətin olduğu üçün, **"Sirat körpüsü qıldan incə, qılıncdan itidir"** buyuruldu. Fatihəyi-şərifə surəsindəki ayəti-kərimənin məali-şərifi, **"Doğru yola qovuşdurmasını Allahu təaladan diləyin!"**dir. Möminə bu dünyada doğru yola sarılmaq lazımdır. Qiyamət günü Sirat körpüsündən keçə bilmək üçün dünyada doğru yolda olmaq lazımdır.

Övliyanın böyükləri (rahimə-hümullahü təala) buyurur ki: "Müxbiri-sadiq [yəni həmişə doğru söyləyən] (sallallahu aleyhi və səlləm) qiyamətdəki nemətlərdən və əzablardan hər nə xəbər verdi isə, onların hamısı insanın bu dünyada qazandığı xasiyyətlərin, əxlaqın və əməllərin surətləridir. Oradakı görünüşləridir. Əxlaqda və əməldə doğru yolda olmağın oradakı surəti, görünüşü də sirat körpüsüdür, deyildi. Dünyada doğru yolda olanlar, islamiyyətdən ayrılmayanlar, orada sirat körpüsünü tez keçəcək, mərifətlər və yetkinliklər Cənnətlərinə və yaxşı əməllərin bağçalarına qovuşacaqdırlar. Burada din yoluna tabe olmaqda zəif davrananlar orada sirat körpüsünü yıxıla-yıxıla keçəcəkdir. İslamiyyətin göstərdiyi doğru etiqaddan və əməllərdən ayrılanlar, yolunu azanlar siratdan keçə bilməyib, Cəhənnəm atəşinə düşəcəkdir.

Zuhruf surəsinin 36-cı ayəsində məalən, **"Nəfsinə tabe olaraq Allahu təalanın dinindən üz çevirənlərə dünyada bir şey-**

**tan müsəllət edərik”** buyuruldu. Bu ayəti-kəriməyə baxaraq bəzi alimlər dedi ki, xeyir və kəmal işləri etdirən mələkəni bir mələk hasil edər. Yolu azdıran, pislik etdirən mələkəni də bir şeytan hasil edər. İkisindən biri qiyamətdə o insana yoldaş olar. O halda hər kəs öz xasiyyətinə və əməlinə baxaraq axirətdəki yoldaşının necə olacağını anlaya bilər.

Orta yol dedikdə iki şey aydın olur: Biri, hər kəsin anladığı kimi bir şeyin tam ortasıdır. Dairənin mərkəzi kimi. İkincisi, izafi, təqdiri orta olmaqdır. Yəni, bəlli bir şeyin ortasıdır. O şeyin ortası olduğu üçün hər şeyin ortası olması lazım gəlməz. Əxlaq bilgisində istifadə edilən bu ikinci ortadır. Bunun üçün gözəl əxlaq hər kəsə görə fərqli olar. Hətta zamana və yerə görə də dəyişər. Birində gözəl olan bir əxlaq, başqasında gözəl olmaya bilər. Bir zamanda gözəl deyilən bir əxlaq, başqa zamanda gözəl olmaya bilər. O halda, gözəl əxlaq tam ortada olmaq deyil, ortalamada olmaqdır. Pis xasiyyət də bu ortalamanın iki tərəfinə ayrılmaqdır. **“İşlərin ən yaxşısı onların ortasıdır”** hədisi-şərifi də bunu bildirməkdədir. Buna görə də hər gözəl əxlaqa qarşı iki pis əxlaq durur. Dörd əsas gözəl əxlaqa qarşılıq da səkkiz ana pis xasiyyət var:

1 – Cərbəzədir ki, hikmətin ifrat olmasına deyilir. Əxlaqı və işləri araşdırmaq, anlamaq qüvvətini lazımsız yerlərdə istifadə etməkdir. Hiylə etmək, aldatmaq, haram işləri etmək kimi. Ruhun fənn qüvvətini [yəni ağlı] həddindən artıq istifadə etmək cərbəzə olmaz, pis olmaz. Din bilgilərini, fənn bilgilərini və riyaziyyatı inkişaf etidrmək üçün nə qədər çox araşdırarsa, o qədər yaxşı olar.

2 – Bəladət, əbləhlikdir. Ağıldan istifadə etməməkdir. Axmaqlıq da deyilir. Kütlükdür. Öyrənməsi və işləməsi qüsurlu olar. Yaxşını pisdən ayıra bilməz. Ayəti-kərimələr və hədisi-şəriflər elmi çox tərifləmişdir. Saymaqla bitməz.

3 – Təhəvvürdür. Tez hirslənmək deməkdir. Şücaət əxlaqının həddindən çox olmasıdır. Ağıllı tanınan şəxslərin bəyənməyəcəyi işləri görməyə cəhd etməkdir. Ruhunu və ya bədənini boş yerə yorar.

4 – Cübndür. Qorxaqlıq deməkdir. Şücaətin lazımından az olmasıdır. Qorxmaq caiz olmayan yerdə qorxaqlıq göstərər.

5 – Fücurdur. İffətin çox olmasıdır. Dünya ləzzətlərinə düşkün olar. İslamiyyətin və ağlın bəyənmədiyi azğınlıqları edər.

6 – İffətin az olması, Humüd, yəni miskinlikdir. İslamiyyətin və ağlın izn verdiyi arzularını tərk etməkdir. Bədəni, qüvvəti gedər. Xəstə olar. Nəsli tükənər.

7 – Zülmdür. Ədalətin sərhəddini aşmaqdır. Başqasının haqqına təcavüz etməkdir. Başqasının malına, canına, namusuna zərər verər.

8 – Şərəfsizlikdir. Özünə qarşı edilən zülm, işgəncə və təhqirləri qəbul edər. Ədalətin nöqsan olmasıdır. Ədalətdə bütün yaxşılıqlar toplandığı kimi, zülmdə də pisliklər toplanmışdır. Bunun üçündür ki, bəzi alimlər, könül incitməyən şeylər günah olmaz, dedi. Məsələn, Abdullahi Ənsari (quddisə sirruh) buyurdu ki:

**Haqq yolçuları heç könül qırmaz,**
**Bunun kimi böyük günah olmaz!**

Abdullahi Ənsari, sofiyyəyi-aliyyənin böyüklərindəndir. Şeyx-ül islam idi. 396-cı ildə Hiratda təvəllüd, 481-ci [miladi 1088] ildə orada vəfat etdi. Bəzi yolunu azmışlar bu böyük şəxsin sözünü yaxşı anlaya bilmədi, "Təki başqasına pislik etmə, özünə nə edirsən et", zənn etdi. Beləcə, ibadətləri buraxıb, hər günahı işləyib "kimsəyə zərərimiz yoxdur", deyə öyündülər. Hətta:

**İstər kafir ol, istər yandır Kəbəni,**
**İstəsən şərab iç, yalnız qırma qəlbi!**

deyərək islamiyyətdən ayrıldılar. Halbuki, dinin haram etdiyi hər şey zülmdür. İstər başqasına, istərsə özünə edilməsi haram olan hər şey zülmdür. Zalımlar əksər hallarda malı, mülkü, mövqeyi çox olanlardır. Məzlumların çoxu da kasıblardır. Orta səviyyəli olanların çoxu ədalətə riayət edənlərdir.

Gözəl əxlaqların hamısı orta (ortalama) miqdarlardır. Hər birinin çox və ya az olması bir pis əxlaqdır. Bu müxtəlif pis əxlaqlar üçün hər dildə ad belə tapılmaz. Lakin, düşünülərsə, mənaları (nə demək olduqları) asan aydın olar.

İnsanda lazım olan gözəl əxlaqdan bəziləri vardır ki, nə qədər çox olarsa, yaxşılığı da o qədər artar zənn edilir. Halbuki elə deyil-

dir. Hər gözəl əxlaqın bir həddi vardır. O həddi keçəndə yaxşılıq gedər, pislik olar. Gözəl əxlaqın az olmasının pislik olacağı isə asan aydın olur. Şücaət və səxavət bunlara misaldır. Bu iki gözəl əxlaqın çox olanları təhəvvür və israfdır. Cahillər, hələ İslam əxlaqını bilməyənlər israf edənləri çox comərd sanar və tərifləyərlər. Təhəvvür edənlərə də çox cəsur, qəhrəman deyərlər. Halbuki, qorxaq və xəsis olana heç kimsə qəhrəman və comərd deməz.

İnsanda lazım olan gözəl əxlaqdan bəzisi də vardır ki, az olanda yaxşı zənn edilər. Çox olanda pis olduğu bəlli olar. Təvazö belədir. İnsanda təkəbbürün olmaması deməkdir. Bunun nöqsan, az olması təzəllüldür. Təzəllülü təvazödən ayırmaq çətindir. Hətta çox kimsə dilənçinin zillətini (alçalmasını), alimin təvazösü ilə qarışdırır. Çünki, təkəbbürsüzlük onda da çoxdur. Onu da çox yaxşı sanar.

## DÖRDÜNCÜ BAB

Gözəl əxlaqa bənzəyən pis əxlaqı və bunların gözəl əxlaqdan necə ayrılacağını bildirəcəyik.

Çox kimsə xalis qızılı bürünc deyilən sarı metaldan ayıra bilmir. Mavi muncuğu ləl-cəvahirat sanır. Bunun kimi pis əxlaqı yaxşı sanır. Bunun üçün əxlaq elmini yaxşı öyrənmək, gizli ayıbları, qüsurları görə bilmək, yaxşını pisdən ayırmaqda usta olmaq lazımdır.

Hikmətə bənzəyən pis əxlaqı bildirək: Ağıl ölçülərindən, fənn bilgilərindən və ya təsəvvüf mərifətlərindən bir neçəsini ağızlardan qaparaq və ya qəzetdən, məcmuədən və radiodan eşidərək, bunları orada-burada söyləyən, münaqişələrə qarışan kimsələri, ağıllı, elmli, fənn adamı, mütəxəssis və mürşid zənn edənlər az deyildir. Halbuki, bu kimsə söylədiyi məsələlərdən birinin həllini, mərifətlərdən heç birinin mənasını bilməz. Bunun alimlərə, mürşidlərə və fənn adamlarına bənzəməsi, tutuquşunun insan kimi danışmasından artıq bir şey deyildir. Çünki, hikmət deyilən əxlaq insanın başında, ruhunda olar. Əsərləri, nurları hiss orqanları ilə duyulmaz. Bir çox qabaqcıl deyilən kimsələr vardır ki, hikmətdən və dəyərlərdən xəbərləri yoxdur. Bilgisiz və pis əxlaqlıdırlar. Elm və əxlaq ilə bir münasibətləri də yoxdur. Ağızlarından gözəl əxlaqlı bir söz çıxmaz. Lakin üzərində gözəl paltarlar olar. Vəzifə sahiblərinin qarşısında əyilməyi yaxşı bilərlər. Ballarda, kokteyl

gecələrində rəqsə gedərlər. İçki masalarında xidmət edərlər. Bir şef və ya məclis üzvü, yaxud müşavir adı ilə ortaya çıxarlar.

İffətə bənzəyən pis əxlaq da vardır: Pis iş görməzlər. Ehtiraslarının arxasınca qaçmazlar. Ciddi, fəzilətli, elm və gözəl əxlaq sahibi görünərlər. Dillərdə mədh olunar, hər yerdə hörmət göstərilər. Malı çox olanlar və vəzifə sahibləri yanında sözləri keçər. Onlara gələn hədiyyələrin sonu kəsilməz. Nəzir, zəkat pulları önlərinə yığılar. Fərz və sünnətləri etməkdə zəifdirlər. Başqalarının yanında nafilə ibadətləri etməkdən, bədənləri zəif olmuşdur. Nəfsi-əmmarələri isə çox qüvvətlənmişdir. İnsanlar arasında əmin, Allah nəzərində xaindirlər. Saxta təriqətçilər və dünyaya düşkün din adamları belədir.

Bəzi kəndlilər şəhərdəki yeməkləri yeməz. Bəziləri də puluna qıya bilməyib bahalı yemək almaz. Bunları görən onları dərviş zənn edər. Qənaət və iffət sahibi görünərlər. Bunlar qənaətsiz və iffətsizdir. Etdikləri həmişə göstəriş, yalan, riyadır.

Səxavətə bənzəyən pis əxlaq da belə olur: Malı alın təri ilə qazanmamış, mirasla və ya qaçaqçılıq, dilənçilik etmiş, yaxud lotoreya ilə qazanmışdır. Malın qiymətini bilməz. Haramlara, lazımsız yerlərə sərf edər. Ağlın və islamiyyətin bəyənmədiyi pis yerlərə xərcləyər. Axmaqlar bunu comərd zənn edər. Halbuki, bunda səxavət deyilən gözəl əxlaq yoxdur. Mal qazanmaq dağa yük çıxarmaq kimidir. Mal paylamaq yuvarlaq daşı dağdan aşağı buraxmağa bənzəyər. Kasıblıq, çox kimsənin yaxşı adam olmasına mane olar. Çoxları kasıblıq sıxıntısı ilə imanını əldən qaçırmış, mürtəd olmuşdur. **“Ramuz-ül-Əhadis”**dəki hədisi-şərifdə, **“Əshabım üçün kasıblıq səadətdir. Axır zamandakı ümmətim üçün zəngin olmaq səadətdir”** buyuruldu.

**Yaxşı anladım, uzun təcrübə ilə:**
**Adam elmlə ölçülər, elm də mal ilə!**

Malı halaldan, səhih ticarət ilə qazanmaq çətindir. Halal yoldan, islamiyyətə uyğun yerlərdən qazanan az olar. Halal mal damcı-damcı, haram mal isə sel kimi axaraq gələr. Mal paylamaqda səxavət gözəldir. İsraf isə pisdir, haramdır. Səxavət, səxavət əxlaqını qazanmaq, xəsislik deyilən pis əxlaqdan xilas olmaq üçün

vermək deməkdir. Dünyadan bir şey ələ keçirmək üçün və nəfsin pis arzusuna çatmaq üçün verməyə səxavət deyilməz.

Şücaətə bənzəyən pis əxlaq da belədir: Şücaət göstərməsi, şücaət əxlaqını qazanıb, təhəvvür və qorxaqlıq kimi pis əxlaqlardan xilas olmaq üçün deyildir. Dünya malını, mövqeyini ələ keçirmək üçün təhlükəyə atılar. Yaxud, şöhrət qazanmaq istəyər. Mal yığmaq üçün müsəlmanların yolunu kəsər, heyvanlarını alar, evlərə girər. Bunları edə bilmək üçün təhlükəyə atılar. Bunlar arasında yaxalananlar, işgəncələrə dözərək, hətta mallarını, canlarını verməyi gözə alaraq, cinayət ortaqlarını ələ verməməyi şücaət sayarlar. Halbuki, bu alçaqlarda şücaətin qoxusu belə yoxdur. Şücaət sahibi ağlın və dinin bəyəndiyi şeyi yerinə yetirmək üçün ortaya atılar. Millətə, hökumətə xidmət etmək, savab qazanmaq istəyər. Şücaət əxlaqına qovuşaraq Allahu təalanın razılığına qovuşmağı sevər. Qurdun, pələngin hücum etmələri də bir qəhrəmanın hücumuna bənzəsə də, şücaətlə əlaqələri yoxdur. Qüvvətləri və yaradılış baxımından hücum edərək, zərər verərlər. Yaxşı düşüncə ilə və faydalı olmaq, savab qazanmaq üçün irəli atılmazlar. Onlara dözə bilməyən zəiflərə hücum edərlər. Silahlı və qüvvətli bir kimsənin, silahsız, çılpaq, ac bir kimsəyə hücum etməsi də belədir. Bu isə şücaət olmaz. Şücaət demək, ağlı, fikri və bilgisi ilə hücum etməyi uyğun görmək, dünya qazancını düşünməyib, ruhunda şücaət əxlaqını saxlamağı, təhəvvür və qorxaqlıq əxlaqından xilas olmağı istəmək deməkdir. Belə kimsələr zərərli, pis iş etməkdənsə, ölməyi üstün görər. Şərəflə ölməyi şərəfsiz yaşamaqdan üstün tutar. Xeyirlə xatırlanmağı, üz qarası ilə yaşamağa tərcih edər. Şücaətdə yaralanmaq və ölmək təhlükələri olduğu üçün əvvəldən şirin olmaya bilər. Lakin sonunda dünya və axirət qazanclarının və zəfərin ləzzəti ilə əbədi ləzzətli olar. Hələ islamiyyəti qorumaq, Rəsulullahın parlaq dinini yaymaq üçün can verərək **“şəhid olmaq”** ləzzəti, dünya və axirət ləzzətlərinin heç birində yoxdur. Necə ki, Əli-İmran surəsinin 169-cu ayəsində məalən, **“Allah yolunda canlarını verənləri ölü sanmayın! Onlar diridir. Rəblərinin nemətlərinə qovuşmuşdurlar”** buyrulmuşdur. Şücaəti mədh edən hədisi-şəriflər sayılmayacaq qədər çoxdur. Cihaddan qaçmaq insanı ölümdən qurtarmaz. Ömrü uzatmaz. Düşmən qarşısında qalmaq da insanı öldürməz, yox

etməz. Əcəl, irəli və geri getməz. İnsan ömrü dəyişməz. Çox olub ki, qaçmaq ölümə səbəb olub. Düşmənə qarşı dözmək də zəfərə və salamatlığa qovuşdurar. Həzrəti Muaviyə (radıyallahu anh) deyir ki, Siffin müharibəsində qaçmağa niyyət etmişdim. **“Səbr edən bəlalardan xilas olar”** hədisi-şərifi yadıma gəldi. Səbr etdim, dözdüm. Allaha şükür, qaçmaqdan xilas oldum. Bu səbrim sayəsində xilafətə qovuşdum.

Şücaətin təməli Allahu təalanın təqdirinə razı olmaq, Ona təvəkkül etmək, Ona güvənməkdir. Allahın aslanı, şücaət çaylarının qaynağı, vilayət bağçasının gülü olan Həzrəti Əli (radıyallahu anh), Siffin müharibəsində hücum əsnasında başı açıq, qolları çirməli qaçar və bu beyti oxuyardı:

**Ölümdən qaçmaq, bu iki gün doğru olmaz:**
**əcəl gəldiyi gün və gəlmədiyi gün.**
**Əcəl gəldi isə qaçmaq fayda verməz,**
**Gəlmədi isə, tədbir olmaz heç uyğun!**

Malını, vəzifəsini itirdiyi üçün və ya düşmən əlinə əsir düşdüyü üçün intihar edən, yəni özünü öldürən axmaqlarda şücaət deyil, qorxaqlıq vardır. Şücaət sahibi olan dərdə, bəlalara sinə gərər, dayanar, səbr edər. Bu axmaqlar isə ölməklə çətinlikdən xilas olacaqlarını zənn edərlər. Bunlar çox cahildir. Öldükdə daha çox sıxıntılara, acılara düşəcəklərini bilmirlər. İntihar etmək, başqasını öldürməkdən daha böyük günahdır. Şiddətli əzab çəkəcəkdir. Ağlı getdikdən sonra intihar edən belə deyildir. Ölməyi deyil, Allahu təaladan səhhət və afiyət istəmək lazımdır.

5 – Ədalətə bənzəyən pis əxlaq da vardır. Bu, iffətə bənzəyən pis əxlaqa yaxındır. Ədalət əxlaqından məhrum pis bir insan, olduğu yerlərə ədaləti tərifləyən lövhələr asar. Ədalətdən danışar, misralar yazar. Daha pisi, ədaləti təmsil edən vəzifələri, kürsüləri tutar. Göstəriş olaraq ədalətlilər ilə oturub durar. İçi zülm, kin, intiqam ilə doludur. Ədalət isə xasiyyətləri və hərəkətləri dinə və ağla uyğun olmaq deməkdir. Görünüşü içi kimi olmaqdır. Hər kəsin yanında tək ikən olduğu kimi olmaqdır. İki üzlülük ədalət deyil, münafiqlikdir. Beyt:

**İbadət, təmiz niyyətli olmaq gərək,**
**Bir şeyə yaramaz, içi boş çəyirdək.**

## BEŞİNCİ BAB

İndi, ədalətin nə olduğunu bildirək: Ədalət, gözəl əxlaqın ən şərəflisidir. Ədalətli insan, insanların ən yaxşısıdır. Ədalət, ittifaq, müsavat deməkdir. İki şeyin ya özləri və ya xüsusiyyətləri müsavi olar. Bənzəyən yerlərində birləşmişlər deməkdir. Demək ki, ədalət birlikdən, vəhdətdən doğulmuşdur. Vəhdət isə ən şərəfli bir xüsusiyyət, ən üstün bir haldır. Çünki, bütün varlıqlar bir varlıqdan meydana gəlmişdir. Aləmdə rast gəlinən hər birlik həqiqi, yeganə varlığa bənzəyir. Hər varlıq, o bir olan varlıqdan olduğu kimi, hər birlik o birdəndir. Ölçmə, müqayisə işlərində müsavat, yəni bərabərlik kimi şərəflisi, qiymətlisi yoxdur. Musiqidə bu məsələ daha təfsilli tədqiq edilmişdir. Ona görə də yaxşılıqların ən şərəflisi ədalətdir. Ədalət, ortada olmaqdır. Ortadan ayrılanda ədalət olmaz. Üç yerdə ədalətin olması lazımdır:

1- Bir malı, bir neməti bölərkən, ədalət ilə bölmək lazımdır.

2- Muamələtda, alış-verişdə ədalət lazımdır.

3- Uqubatda, cəza verməkdə ədalət lazımdır. Bir şəxs birisini qorxuya salsa, hücum etsə, həmin şəxsə qarşı da belə edilməsi lazımdır. [Lakin, bu qarşılığı ancaq hökumət edər. Özünə hücum edilən kimsə, buna qarşılıq etməməli, bunu polisə, məhkəməyə xəbər verməlidir. Müsəlman, həm islamiyyətə tabe olar, günah işləməz. Həm də qanuna tabe olar, cinayət işləməz.] Ədalət olanda, hər kəs qorxusuz yaşayar. Ədalət, qorxusuzluq deməkdir.

Ədalət nədir? Bunu insan ağlı ilə tapmaq çox çətin olduğu üçün, Allahu təala qullarına acıyaraq məmləkətləri qorumaq üçün bir ölçü göndərdi. Bu ilahi ölçü ilə ədaləti ölçmək asan oldu. Bu ölçü Peyğəmbərlərin (aleyhimüssaləvatü vəttəslimat) gətirdikləri dinlərdir. İslamiyyətə namusu-ilahi də deyilir. Bu gün və qiyamətə qədər istifadə edilməsi əmr olunan ilahi ölçü Muhamməd aleyhissəlama göndərilən dindir. Bu ölçüdən sonra bir də ikinci ölçü verilmişdir. Bu da sözü keçən hakimdir. İnsan mədəni olaraq yaradılmışdır. Yəni, elə yaradılmışdır ki, bir-birləri ilə qarışmaq, bir yerdə yaşamaq, köməkləşmək məcburiyyətindədir. Hey-

vanlar mədəni yaradılmadı. Şəhərdə birlikdə yaşamağa məcbur deyildirlər. İnsanlar zərif, zəif yaradıldığı üçün bişməmiş yemək yeyə bilməz. Qida, paltar və mənzilin hazırlanması lazımdır. Yəni, sənətlərə ehtiyac vardır. Bunun üçün də araşdırmaq, düşünmək və təcrübə etmək, çalışmaq lazımdır.

[İslamiyyət fənni, texnikanı, çalışmağı, gözəl əxlaqı təşviq və əmr etmişdir. İngilislər və kommunistlər islamiyyətə alçaqca böhtan edir. İslamiyyət insanları keyləşdirir, çalışmağı dayandırır, deyərək, həyasızca yalan söyləyirlər. İslam məmləkətlərində ovladıqları, aldatdıqları cahil, soysuz kimsələrə çox pul və vəzifə verərək onları da belə danışdırırlar. Fənni, elmi, çalışmağı əmr edən, çalışanları mədh edən ayəti-kərimələr və hədisi-şəriflər meydanda olarkən bu alçaq, həyasızca böhtanlar günəşi palçıqla suvamağa bənzəyir. İngilislər islamiyyətə hiyləgərcə hücum edir. İslamiyyəti içəridən yıxırlar. Böhtanlarına gənclərin asan aldanmalarını təmin edə bilmək üçün islam bilgilərini, din kitablarını yox edirlər. İslamiyyətə hücum etmək üçün, Londonda **“Müstəmləkə nəzarəti”** qurdular. Burada xain planlar hazırladılar. Minlərlə casus yetişdirdilər. Tələlərinə düşən cahil, soysuz din adamlarından, Nəcdli Abdulvəhhab oğlu Muhamməd və Dəriyyə Əmiri Süud oğlu Muhamməd ilə əməkdaşlıq edərək, milyonlarla pul və silahın gücü ilə **“Vəhabilik”** bidət firqəsini qurdular. Müsəlmanların himayəçisi, gözətçisi olan Osmanlı dövlətini içəridən yıxdılar. **“İngilis Casusunun Etirafları”** kitabına baxın!

Abdürrəşid İbrahim əfəndi, 1328-ci (miladi 1910) ildə İstanbulda nəşr olunan türkcə **“Aləmi İslam”** kitabının ikinci cildində, “İngilislərin islam düşmənliyi” yazısının bir yerində deyir ki: “Xilafəti-islamiyyəni bir an əvvəl süqut etdirmək ingilislərin birinci düşüncələridir. Krım müharibəsinə səbəb olmaları və burada türklərə kömək etmələri xilafəti məhv etmək üçün bir hiylə idi. Paris sözləşməsi bu hiyləni ortaya qoymuşdur. [1923-cü ildə edilən Lozan sülhünün məxfi maddələrində bu düşmənliklərini açıqca bildirmişdirlər.] Hər zaman müsəlmanların başına gələn fəlakətlər hansı pərdə ilə örtülərsə örtülsün həmişə ingilislərdən gəlmişdir. İngilis siyasətinin təməli islamiyyəti yox etməkdir. Çünki, islamiyyətdən qorxurlar. Müsəlmanları aldatmaq üçün satılmış

vicdanlardan istifadə etmişdirlər. Bunları islam alimi, qəhrəman olaraq tanıdırlar. Sözümüzün xülasəsi, islamiyyətin ən böyük düşməni ingilislərdir.” Abdürrəşid əfəndi, 1363-cü ildə (miladi 1944) Yaponiyada vəfat etdi.

İslamiyyət fənnə, texnikaya, çalışmağa mane olarmı? İnsan hər ehtiyacını hazırlamağa məcburdur. Bunu hazırlayan da fənn, sənət və çalışmaqdır. Bir insanın hər sənəti öyrənməsi mümkün deyildir. Hər bir sənəti müəyyən kimsələr öyrənər, həyata keçirər. Hər kəs özünə lazım olan şeyi bu sənət sahibindən alar. Bu sənət sahibi də özünə lazım olan başqa bir şeyi, onu edən digər sənət sahibindən alar. Beləcə, insanlar bir-birlərinin ehtiyaclarını təmin edər. Bunun üçün insan tək yaşaya bilməz. Birlikdə yaşamağa məcburdur. Mədəniyyət demək, **“Təmiri-bilad və tərfihi ibad”** üçün bir yerdə yaşamaq deməkdir.]

İnsanlar bir araya gəldikdə acgöz kəslər başqasının haqqına təcavüz edərlər. Zülm edənlər olur. Çünki, hər nəfs istədiyinə qovuşmaq istəyər. Şirin olanı almağa çalışar. Bu şeyləri istəyən bir neçə adam çəkişməyə başlayar. Bir leşə toplanan itlərin bir-birilə boğuşmaları kimi aralarında döyüşməyə başlayar. Bunları ayırmaq üçün qüvvətli bir hakim lazım olur. Alış-verişdə hər kəs öz etdiyinin daha doğru olduğunu söyləyər. Edilən şeylərin qarşılıqlı dəyərlərini ədalət ilə ölçmək lazım olur. Əşyanın dəyərlərini qarşılıqlı ölçən şey qızıl ilə gümüşdür. Yəni, puldur. Qızıl ilə gümüşə **“Nakdeyn”** deyilir. Hər millətin istifadə etdiyi kağız pullar həmişə qızılın qarşılığıdır. Yəni, qızılı çox olan hökumətlər çox kağız pul buraxa bilər. Qızılı az olan kağız pulu çox buraxarsa, bunların qiyməti olmaz. Çünki, Allahu təala qızıl ilə gümüşü pul olaraq yaratmışdır. Başqa heç bir şey qızılın yerini tuta bilməz. Bunun üçündür ki, zəkatın qızıl və ya gümüş olaraq hesablanması və verilməsi əmr olunmuşdur. Əşyanın qiymətini qızıl və gümüş ilə ədalətə riayət edərək ölçən bir hakim lazımdır. Sözü gedən bu hakim də hökumətdir. Ədalətli bir hökumət zülmün, işgəncənin qarşısını alar. Allahu təalanın əmr etdiyi ədaləti təmin edər. Əşyanın qiymətini ədalət ilə müəyyən edər.

Deməli, insanlar arasında ədaləti təmin etmək üçün üç şey lazımdır: Namusu-rabbani, hakimi-insani və dinarı-mizani. Bunlar-

dan ən qüvvətlisi, ən böyüyü namusu-rabbani olan islamiyyətdir. Dinlər, Allahu təalanın ədaləti təmin etmək üçün göndərdiyi qanunlardır. Hakimlərin ədaləti təmin etmələri üçün bu ilahi qanunlar göndərildi. Hədid surəsi 25-ci ayəsində məalən, **"Onlara kitab və tərəzi göndərdik ki, bunlarla ədaləti yerinə yetirsinlər"** buyuruldu. Burada kitab din deməkdir. Çünki din, Qurani-Kərimdəki əmr və qadağaların adıdır. Tərəzi də qızıla işarədir. Çünki qızıl ağırlıqla ölçülür. Qurani-Kərimin əmr və qadağalarını bəyənməyən kafirdir və münafiqdir. Hakimi, hökuməti dinləməyən üsyankardır. [Müsəlman, Dar-ül-hərbdəki kafirlərin qanunlarına da qarşı çıxmaz. Cinayət işləməz] Qızılın dəyərini qəbul etməyən də xain və oğru olar.

**İZAH** – İnsanın əvvəla özünə, hərəkətlərinə, əzalarına ədalətlə rəftar etməsi lazımdır. İkinci olaraq, ailəsinə, qonşularına, yoldaşlarına qarşı ədalətli olmalıdır. Hökumət adamlarının da milləti ədalətlə idarə etməsi lazımdır. Deməli, bir insanda ədalət əxlaqının olması üçün əvvəl öz hərəkətlərində, əzasında ədalət olmalıdır. Hər qüvvətini, hər üzvünü nə üçün yaradıldısa, bu yolda istifadə etməlidir. Allahü təalanın adətini dəyişdirib, onları ağlın və islamiyyətin bəyənmədiyi yerlərdə istifadə etməməlidir. Ailəsi varsa, onlara qarşı da ağla və dinə uyğun davranmalı, dinin göstərdiyi gözəl əxlaqdan dönməməlidir. Gözəl əxlaq ilə əxlaqlanmalıdır. Hakim, vali, komandir və hər hansı bir amir isə yenə ibadətləri etdirməli və etməlidir. Belə olan şəxs bu dünyada Allahu təalanın xəlifəsi olar. Qiyamətdə də ədalətlilər üçün vəd edilən nemətlərə qovuşar. Belə bir xeyirli kimsənin xeyir və bərəkəti onun olduğu zamana, mübarək yerə və orada olmaqla bəxtiyar olan insanlara, heyvanlara, hətta bitkilərə və ruzilərə sirayət edər, yayılar. Lakin Allah qorusun, bir yerdəki hökumət adamları şəfqətli, gözəl əxlaqlı, ədalətli olmazsa, insan haqlarına təcavüz edər, zülm, oğurluq, işgəncə edərlərsə, bunlar ədalət mütəxəssisi deyil, iblislərin dostu, şeytanların yoldaşları olarlar. Beyt:

**Aldatmasın səni, diktatorun sarayları, paltarı**
**Saray bağçasını, sulayar daim, məzlumların göz yaşı!**

Əmri altında olanlara mərhəmət etməyənlər qiyamət günü Allahu təalanın mərhəmətindən uzaq qalacaqlar.

**Mən, lə yərham, lə yurham!**

Buyrulmuşdur ki, acımayana acınmaz deməkdir. Belə zalımların birliyinə hökumət deyil, quldur deyilir. Bunlar bir neçə illik müvəqqəti dünya zövqləri üçün milyonlara əziyyət edərlər. Lakin, zülmlərinin cəzasını çəkmədikcə bu dünyadan getməzlər. O qədər rifah və ləzzətlər içində olduqları halda, əlbəttə şiddətli sıxıntılar, böyük dərdlər yaxalarını buraxmaz. O səltənət heç birinin əlində qalmaz. Çox halda, səltənətləri düşmənlərinin əlinə keçər. Bu halı görər, ciyərləri yanar. Məryəm surəsinin 81-ci ayəsində məalən, **"Malik, hakim olduğunu söylədiyi şeylərin hamısını əlindən alarıq. Tək başına hüzurumuza gələr"** buyuruldu. Burada buyurulduğu kimi Allahu təalanın məhkəməsinə üzü qara, sürünərək gətirilər. Etdiyi pislikləri inkar edə bilməz. Hamısının cəzasını çox ağır olaraq çəkər. Etdiyi zülmlərin, işgəncələrin qaranlığı ətrafını örtər. Önünü görə bilməz. Əzab mələklərinin pəncəsində öz etdiklərinin daha betərini çəkmək üçün Cəhənnəm əzabına atılar. Allahu təalanın dinini bəyənmədiyi, ona çöl qanunu dediyi üçün orada rəhmətə qovuşa bilməz.

## ALTINCI BAB

**"Əxlaqı alai"** kitabının altıncı babında gözəl əxlaqın növləri bildirilmişdir. Biz, burada yalnız ədaləti bildirəcəyik. Ədalət üç yerə ayrılır:

Birincisi, Allahu təalaya qulluq etməkdir. Allahu təalanın mərhəməti, nemətləri, ehsanları hər məxluqa verilmişdir. Nemətlərin ən böyüyü qullarına səadət yolunu göstərməsidir. Haqları yox ikən hamısını ən gözəl şəkildə yaratmışdır. Əbədi, saysız nemətlər, yaxşılıqlar vermişdir. Belə bir sahibə, yaradana ibadət etmək, Onun ehsan etdiyi nemətlərə şükür etmək əlbəttə lazımdır. Ədalət üçün sahibinin haqqını ödəmək lazımdır. Hər insanın yaradanına qarşı borclu olduğu bu qulluq haqqını yerinə yetirməsi vacibdir.

Ədalətin ikinci qismi insanların haqqını verməkdir. Hökumətə, amirlərə, qanunlara qarşı gəlməmək, alimlərə hörmət, əmanətlərə vəfa, alış-veriş haqqına riayət, vədlərinə əməl etmək lazımdır.

Üçüncüsü, keçmişlərin haqlarını verməkdir. Bu da onların borclarını ödəmək, vəsiyyətlərini yerinə yetirmək, fondlarını mühafizə və buraxdığı xeyir və gözəl işləri davam etdirməklə olar.

Yaxşılıq edənə mal ilə, xidmət ilə qarşılığı verilir. Bunu edə bilməyən həmd və səna, təşəkkür və dua edər. Əvəzini verməyənin başına qaxılar, pislənər, incidilər. Çünki, yaxşılığa qarşı yaxşılıq etmək insanlıq vəzifəsidir. O halda, hər yaxşılığı edən, ən böyük yaxşılıq olaraq yox ikən var edən, ən gözəl şəkli verən, lazımlı üzvləri, qüvvətləri ehsan edən, hər birini bir ahəng ilə işlədərək səhhət verən, ağıl və zəka bəxş edən, övlad, ev, ehtiyac əşyası, qida, içki, paltarlarımızı yaradan uca bir sahibə bu nemətləri səbəbsiz, qarşılıqsız lütf edən və hər an yox olmaqdan, düşməndən, xəstəlikdən mühafizə edən və bizə heç ehtiyacı olmayan, əbədi qüvvət, qüdrət sahibi olan Allahu təalaya şükür etməmək, qulluq haqqını ödəməmək nə böyük qəbahət, nə çox zülm və nə alçaq bir vəziyyət olar. Hələ, Ona və nemətlərin Ondan gəldiyinə inanmamaq və ya bunları başqasından bilmək ən böyük zülm, ən pis üz qarası olar. Bir kimsəyə hər ehtiyacı verilsə, hər ay kifayət qədər pul, qida hədiyyə olunsa, bu kimsə o ehsan sahibini hər yerdə hər kəsə necə təriflәyər. Gecə-gündüz onun sevgisini, etimadını, onun qəlbini qazanmağa çalışmazmı? Onu dərdlərdən, çətinliklərdən, mühafizə etməyə çalışmazmı? Ona xidmət edə bilmək üçün özünü təhlükələrə atmazmı? Bunları etməsə, o ehsan sahibinə heç qiymət verməsə, hər kəs onu tənqid etməzmi? Hətta, insanlıq vəzifəsini etmir deyə cəzalandırılmazmı? Yaxşılıq edən bir insanın haqqına belə riayət edildiyi halda, hər nemətin, hər yaxşılığın həqiqi sahibi olan, hamısını yaradan, göndərən, Allahu təalaya şükür etmək, Onun bəyəndiyi, istədiyi şeyləri etmək nə üçün lazım olmasın? Əlbəttə, ən çox Ona şükür etmək, ən çox Ona itaət etmək lazımdır. Çünki, Onun nemətləri yanında başqalarının yaxşılıqları dəniz yanında damcı belə deyildir. Hətta, digərlərindən gələn yaxşılıqları da yenə O göndərməkdədir.

**Allahu təalanın nemətlərini kim saya bilər?**
**Nemətlərinin milyonda birinə kim şükür edə bilər?**

İnsan Allahu təalaya qarşı lazım olan şükür borcunu necə etməlidir? Bəzilərinə görə birinci vəzifə, Allahu təalanın varlığını düşünməkdir. Məsnəvi:

**Həmd olsun nemətləri bol Allaha,**
**Öncə varlıq neməti verdi mənə!**
**Ehsanlarını saymağa güc yetməz,**
**Güc də, hər üstünlük də, layiq Ona!**

Bəzilərinə görə nemətlərin Ondan gəldiyini anlamalı və dil ilə həmd və səna etməlidir.

Bəzilərinə görə birinci vəzifə Onun əmrlərini yerinə yetirmək, haramlarından çəkinməkdir.

Bir qismi də, insan əvvəl özünü təmizləməli, beləcə, Allahu təalaya yaxınlaşmalıdır, dedi.

Bəziləri insanları irşad etməli, doğru, saleh olmalarına çalışmalıdır, dedi.

Bəziləri də, insanın bəlli bir vəzifəsi olmaz. Hər insanın özünə görə, başqa-başqa vəzifələri olar, dedi.

Sonra gələnlərə görə insanın Allahu təalaya qarşı vəzifəsi üç yerə ayrılır: birincisi, bədəni ilə edəcəyi işlərdir. Namaz, oruc kimi. İkincisi, ruhu ilə edəcəyi işlərdir. Doğru etiqad etmək [Əhli sünnət alimlərinin bildirdikləri kimi iman etmək, inanmaq]. Üçüncüsü, insanlara ədalətli şəkildə rəftar etməklə Allahu təalaya yaxınlaşmaqdır. Bu da əmanəti mühafizə, insanlara nəsihət etmək, əvvəla islamiyyəti öyrətməklə olar.

Bütün bunlardan aydın olur ki, ibadət üç yerə ayrılır: Doğru etiqad, doğru söz və doğru iş. Bunlardan son ikisində, açıq olaraq əmr edilməmiş olanlar zamana və şərtlərə görə dəyişər. Allahu təala Peyğəmbərləri (aleyhimüssalavatü vəttəslimat) vasitəsi ilə dəyişdirər. İbadətləri insanlar dəyişdirə bilməz. Peyğəmbərlər (aleyhimüssalavatü vəttəslimat) və böyüklərin varisləri olan əhlisünnət məzhəbinin alimləri (rahimə-hümullahü təala) ibadətlərin

növlərini və necə ediləcəklərini ayrı-ayrı bildirmişdirlər. Hər kəsin bunları öyrənməsi və ona görə hərəkət etməsi lazımdır.

Bu fəqirə görə sözün xülasəsi, yuxarıda bildirildiyi kimi doğru etiqad, doğru söz və saleh əməl birinci vəzifədir.

İslam alimləri və təsəvvüf böyükləri (rahimə-hümullahü təala) buyurdu ki, insana vacib olan birinci vəzifə iman, əməl və ixlas sahibi olmaqdır. Dünya və axirət səadətləri ancaq bu üçünə qovuşmaqla əldə edilir. Əməl qəlb ilə və dil ilə, yəni söz ilə və bədən ilə ediləcək işlər deməkdir. Qəlbin işləri əxlaqdır. İxlas, əməlini, yəni bütün işlərini, ibadətlərini, tək Allahu təalanın razılığına, sevgisinə qovuşmaq üçün etmək deməkdir.

**Eşqin aldı məndən məni,**
**Sevirəm Rəbbim səni!**
**Sənin sevgin çox şirinmiş,**
**Sevirəm Rəbbim səni!**

**Nə varlığa sevinərəm,**
**Nə yoxluğa üzülərəm.**
**Eşqin ilə zövqlənərəm,**
**Sevirəm Rəbbim səni!**

**Əmr etdin ibadətləri,**
**Mədh etdin yaxşı əməlləri,**
**Verdin əbədi nemətləri,**
**Sevirəm Rəbbim səni!**

**Nə nankor nəfsim var əcəb,**
**Zövq üçün mənə qıyar həp.**
**Mən həqiqi zövqü tapdım,**
**Sevirəm Rəbbim səni!**

**İbadəti gözəl etmək,**
**Dünya üçün də çalışmaq,**
**Gecə gündüz işim, çünki,**
**Sevirəm Rəbbim səni!**

**Sevmək sözlə olmaz Hilmi,**
**Rəbbin çalışın dedi.**
**Halından da əyan olsun;**
**Sevirəm Rəbbim səni!**

**İslam düşmənləri necə,**
**Çatır dinə hiyləgərcə.**
**Dayansan, doğrumu olar,**
**Sevirəm Rəbbim səni!**

**Aşiq tənbəl oturarmı?**
**Məşuqa toz qondurarmı?**
**Düşməni susdur və söylə:**
**Sevirəm Rəbbim səni!**

**Əli ibn Əmrullah-Muhammməd Hadimi**

# İSLAM ƏXLAQI

Dini məlumatlar almaq üçün
**www.gozelislam.com**
saytına müraciət edə bilərsiz.


Nəşriyyat redaktoru: Suğra OSMANOVA
Texniki redaktor: Elnur ƏHMƏDOV
Bədii redaktor: Fəxri VƏLİYEV
Səhifələyici: Sədaqət KƏRİMOVA

Yığılmağa verilmişdir: 28.01.2015.
Çapa imzalanmışdır: 16.02.2015.
Nəşrin ölçüsü: 60x90 1/16.
Fiziki çap vərəqi: 12,5
Sifariş: 014/15. Sayı: 500 ədəd.



NURLAR
NƏŞRİYYAT-POLİQRAFİYA MƏRKƏZİ

Bakı, Az1122, Zərdabi pr. 78 / Tel: 4977021
Faks: 4971295 / E-poçtu: office@nurprint.com